







AZƏRBAYCAN RESPUBLİKASININ PREZİDENTİ YANINDA
ALİ ATTESTASİYA KOMİSSİYASI

https://doi.org/10.69682/arti.2024.91.2
https://zenodo.org/record/7714846#.ZCqgSnZBzIV — Zenodo
https://archive.org/details/20230309_20230309_1112 — Internet Archieve
https://journals.indexcopernicus.com/search/details?id=122986 — Index Copernicus
https://journalseeker.researchbib.com/view/issn/2409-8817 — Researchbib
https://www.slideshare.net/Humeyir/scientific-works-257022296?from_search=0 — SlideShare
https://www.calameo.com/books/0073359955276c2cd4d80 — Calameo
https://isindexing.com/isi/viewjournal.php — International Scientific Indexing
http://olddrji.lbp.world/Search.aspx?J=Scientific%20Works&S=0 — Directory of Research Journals Indexing

**ISSN 2409-8817**

**AZƏRBAYCAN RESPUBLİKASININ ELM VƏ TƏHSİL NAZİRLİYİ**
**AZƏRBAYCAN RESPUBLİKASININ TƏHSİL İNSTİTUTU**

# *ELMİ ƏSƏRLƏR*

**cild 91, № 2, 2024**

# *НАУЧНЫЕ ТРУДЫ*

**том 91, № 2, 2024**

# *SCIENTIFIC WORKS*

**volume 91, № 2, 2024**

**“Elmi əsərlər” 1934-cü ildən çıxır**
**İldə 6 nömrə nəşr olunur**
**Redaksiyanın ünvanı**:
Bakı şəhəri, Zərifə Əliyeva küçəsi, 96
Tel: 493-96-21, 493-30-06

***Azərbaycan Respublikasının Təhsil İnstitutu Elmi şurasının qərarı ilə nəşr edilir.***

***Təsisçi: Azərbaycan Respublikasının Təhsil İnstitutu***

***"Elmi əsərlər" məcmuəsi Azərbaycan Respublikası Ədliyyə Nazirliyinin 11 iyul 2002-ci il tarixli 23 №-li əmri ilə qeydə alınmışdır.***

***Azərbaycan Respublikası Prezidenti yanında Ali Attestasiya Komissiyasının qərarı ilə tövsiyə edilən nəşrlər siyahısına daxil edilmişdir.***

**Baş redaktor**:
**Akif Abbasov** – *pedaqogika elmləri doktoru, professor*

**Baş redaktorun müavini**:
**Hümeyir Əhmədov** – *pedaqogika elmləri doktoru, professor*

**Baş redaktorun müavini**:
**İlham Cavadov** – *pedaqogika üzrə fəlsəfə doktoru, dosent*

**Məsul katib**:
**İradə Əmirəliyeva** – *pedaqogika üzrə fəlsəfə doktoru*

**Redaksiya heyəti**: **Emin Əmrullayev**, **Elnur Əliyev**, kimya ü.f.d., **Rüfət Əzizov**, siyasi.elm.ü.f.d. **Anar Nağıyev**, ped.ü.f.d., dos. **Ənvər Abbasov**, ped.e.d., prof. **Vidadi Xəlilov**, ped.e. d., prof. **Fərahim Sadıqov**, ped.e.d., prof. **Hikmət Əlizadə**, psixol.e.d., prof. **Ramiz Əliyev**, ped.e.d., prof. **İntiqam Cəbrayılov**, ped.e.d. **Piralı Əliyev**, ped.e.d., prof. **Şahin Tağıyev**, ped.e.d., prof. **Mübariz Əmirov**, ped.e.d., prof. **Novruz Musayev**

**Redaksiya Şurası**:
**B.H. Əliyev** (AMEA-nın müxbir üzvü, psixol. e.d., prof., Azərbaycan)
**A.N. Rəhimov** (Bakı Qızlar Universitetinin təsisçisi, ped.e.d., prof., Azərbaycan)
**N.D. Nikandrov** (Rusiya Təhsil Akademiyasının akademiki, ped.e.d., prof., Moskva)
**A.K. Kusainov** (Kazaxıstan Pedaqoji Elmlər Akademiyasının prezidenti, ped.e.d., prof., Alma-Ata)
**O.M. Topuzov** (Ukrayna Milli Pedaqoji Elmlər Akademiyasının vitse-prezidenti, Pedaqogika İnstitutunun direktoru, ped.e.d., prof., Kiyev)
**İ.X. Karimova** (Tacikistan Təhsil Akademiyasının vitse-prezidenti, ped.e.d., prof., Düşənbə)
**V. Briller** (Kolumbiya Universitetinin Ali təhsilin sektor təhlili üzrə icraçı direktoru, Dr., prof. (Nyu-York)
**S.P. Lomov** (Moskva DPU-nun kafedra müdiri, RTA-nın akademiki, ped.elm.dok., prof., Moskva)
**Ə.Ə. Şahin** (Hacettepe Universitetinin professoru, Türkiyə)
**Y. Romanenko** (dövlət idarəetmə elmləri doktoru, professor, Ukrayna)
**A.S. Sidenko** (Sosial İdarəetmə Akademiyasının aparıcı elmi işçisi, ped.e.d., prof., Moskva)
**N.V. Naumova** (Samara Humanitar Akademiyasının kafedra müdiri, psixol. ü.f.d., dosent, Samara)
**Tran Mai Uos** (Banking Universitetinin baş müəllimi, fəlsəfə doktoru, dosent, Vyetnam)

**Redaksiya**: Lalə Məmmədli, Dinarə Əsədova, Günel Quluzadə, Şükür Aslanov

© ARTİ, 2024

**N.V. Naumova** (Head of the department of the Samara Humanitarian Academy, doctor of philosophy in psychology, Samara)
**Tran Mai Uoc** (Senior lecturer, Banking University, PhD, associate professor, Vietnam)
**Editorial staff**: Lala Mammadly, Dinara Asadova, Gunel Guluzade, Shukur Aslanov
© IERA, 2024

***BAŞ REDAKTORDAN***
***ОТ ГЛАВНОГО РЕДАКТОРА***
***FROM THE EDITOR IN CHIEF***

*UOT 371*

***Akif Nurağa oğlu Abbasov***
*Azərbaycan Respublikasının Təhsil İnstitutunun elmi katibi,*
*pedaqogika elmləri doktoru, professor, Əməkdar müəllim*
***Orcid:*** *https://orcid.org/0000-0002-9210-7141*

## ŞUŞANIN TARİXİ ABİDƏLƏRİ İLƏ TƏHSİLALANLARIN TANIŞ EDİLMƏSİNİN VACİBLİYİ

***Акиф Нурага оглы Аббасов***
*ученый секретарь Института Образования Азербайджанской Республики,*
*доктор наук по педагогике, профессор, заслуженный учитель*

## ВАЖНОСТЬ ЗНАКОМСТВА УЧАЩИХСЯ С ИСТОРИЧЕСКИМ ПАМЯТНИКАМИ ШУШИ

***Akif Nuragha Abbasov***
*scientific secretary of the Institute of Education of the Republic of Azerbaijan*
*doctor of sciences in pedagogy, professor, Honored teacher*

## THE IMPORTANCE OF EXPOSING STUDENTS TO THE HISTORICAL MONUMENTS OF SHUSHA

**Xülasə**. Azərbaycan zəngin tarixi abidələrə malikdir. Həmin tarixi abidələr arasında Şuşanın tarixi abidələr xüsusi yeri vardır. Bir mənbədə Şuşanın 129 tarixi abidəsinin və 14 məhəllənin adı öz ifadəsini tapıb. Həmin abidələrdən bəzilərinin adları bu məqalədə çəkilir, şagirdlər və tələbələrin həmin abidələrlə tanış olmaları məqsədəuyğun hesab edilir. Valideynlər – ailədə, Müəllimlər – dərsə, sinifdənxaric tədbirlərdə Şuşanın tarixi abidələri ilə bağlı uşaqlarla iş aparmalıdırlar.
***Açar sözlər****: Şuşa, tarixi abidələr, Şuşanın tarixi abidələri, tarixi abidələrlə tanışlıq, "İsa bulağı", "Cıdır düzü", "Topxana meşəsi"*

**Резюме.** Азербайджан имеет богатые исторические памятники. Среди этих исторических памятников особое место занимают исторические памятники Шуши. В одном источнике нашли свое выражение названия 129 исторических памятников и 14 кварталов Шуши. Названия некоторых из этих памятников упомянуты в данной статье. Было бы целесообразным ознакомление школьников и студентов с этими памятниками, с этой целью родители – в семье, а учителя – на уроке и во внеклассных мероприятиях должны проводить с детьми работу по ознакомлению их с историческими памятникам Шуши.
***Ключевые слова:*** *Шуша, исторические памятники, исторические памятники Шуши, ознакомление с историческими памятниками, «Источник Иса-булаг», «равнина Джидыр-дюзю», «лес Топхана».*

**Summary**. Azerbaijan has rich historical monuments. Among these historical monuments, the historical monuments of Shushi occupy a special place. The names of 129 historical monuments and 14 quarters of Shushi were expressed in one source. The names of some of these monuments are mentioned in this article; it is considered

advisable for schoolchildren and students to familiarize themselves with these monuments. Parents – in the family, teachers – in class, in extracurricular activities should work with children on the historical monuments of Shushi.

***Key words**: Shusha, historical monuments, historical monuments of Shusha, acquaintance with historical monuments, "Isinsky spring", "Dzhidir plain", "Tophan forest".*

İstər ailədə, istərsə də təhsil ocaqlarında böyüyən nəsillə təhsilləndirici və tərbiyələndirici işlər aparılır. Məqsəd cəmiyyətimiz, Vətənimiz üçün dəyərli vətəndaşlar, ailəsinin, doğma yurdunun qədrini bilən, onun şərəf və ləyaqətini qoruyan, savadlı, geniş dünyagörüşünə malik, nümunəvi davranışlı, fəal həyat mövqeyinə yiyələnmiş şəxslər yetişdirməkdən ibarətdir. Təhsil-tərbiyə işləri zamanı çox müxtəlif vasitələrdən istifadə olunur. Ən yaxşı vasitələrdən biri olaraq təhsilalanların qədim Şuşanın tarixi abidələri ilə tanış edilməsidir. Həmin abidələr Azərbaycan xalqının mübarizə, döyüş, əmək ənənələrini özündə əks etdirir, insanları o cümlədən şagirdləri və tələbələrin kamil şəxsiyyətlər kimi yetişməsinə öz köməyini göstərir.

Şuşanın tarixi abidələri barədə gənc nəslə, qeyd etdiyimiz kimi, ailədə, uşaq bağçasında, ümumtəhsil məktəblərində ayrı-ayrı fənlərin tədrisi prosesində, eyni zamanda sinifdənxaric və məktəbdənkənar tədbirlər zamanı vermək mümkündür. Tələbələr ali təhsil müəssisələrində mühazirə və seminar məşğələlərində, auditoriyadankənar tədbirlərdə Şuşanın tarixi keçmişi, dünəni və bu günü, tarixi abidələri, dahi şəxsiyyətləri barədə məlumatlar alırlar.

2020-ci il noyabrın 8-i. Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan cənab İlham Əliyevin başçılığı altında müzəffər Silahlı Qüvvələrimiz Şuşa şəhərini erməni-faşist işğalçılarından azad elədi. Prezident İlham Əliyevin 3 dekabr 2020-ci il tarixli sərəncamı ilə həmin gün hər il ölkəmizdə Zəfər günü kimi qeyd olunur.

Şuşa şəhəri Azərbaycanın gözü, Qarabağın tacıdır. Şəhər həmişə mədəni, tarixi və strateji əhəmiyyət daşımış və daşımaqdadır. Azərbaycan Respublikasının Prezident, Ali Baş Komandan İlham Əliyev 2020-ci il noyabrın 8-də Şuşanın öz azadlığına qovuşması ilə bağlı xalqımıza müraciətində dedi: "İyirmi səkkiz il yarım işğal altında olan Şuşa azad edildi! Şuşa indi azaddır! Biz Şuşaya qayıtmışıq! Biz bu tarixi Qələbəni döyüş meydanında qazandıq. 2020-ci il noyabrın 8-i Azərbaycan tarixində əbədi qalacaqdır. Bu tarix əbədi yaşayacaq. Bu, bizim şanlı Qələbəmizin, Zəfərimizin günüdür!"

Ermənilər 1992-ci ilin mayında Şuşanı işğal etdikdən sonra şəhərə divan tutmuş, onun tarixi-memarlıq abidələrini dağıtmağa, yandırmağa başlamışdılar. Belə ki, onlar 29 il müddətində 170-dən çox yaşayış binasını, 160-adək mədəniyyət və tarixi abidəni, 22 ümumtəhsil məktəbini, 7 uşaq bağçasını, 8 mədəniyyət evini, 14 klubu, 2 kinoteatrı, 3 muzeyi dağıtmış, 20 kitabxananı yandırmışlar.

Hazırda dövlətimiz İlham Əliyevin rəhbərliyi ilə tarixi abidələrin bərpası ilə məşğuldur. Cənab Prezident Şuşada olarkən şəhərin tez bir zamanda əvvəlkindən də yaxşı görkəm alacağını diqqətə çatdırmışdır: "Mən demişəm ki, Şuşa nəinki Azərbaycanın, dünyanın ən gözəl şəhərlərindən birinə çevriləcəkdir və buna nail olacağıq, 100 faiz".

Şuşa saysız-hesabsız qədim abidələri ilə diqqəti cəlb edirdi və cəlb etməkdədir. Şəhərdə 549 qədim bina, 2 mədrəsə, 17 məscid, 3 türbə, 6 karvansara, 2 qəsr və qala divarları, 72 tarixi abidə, dövlət xadimlərinin və digər məşhur insanların evləri, ümumi uzunluğu 1203 metr olan daş döşənmiş küçələr, 17 məhəllə bulağı mövcud idi.

Dərslərdə, sinifdənxaric də məktəbdənkənar tədbirlərdə təhsilalanlar öyrənirlər ki, həmin abidələrin əksəriyyətini on doqquzuncu yüzillik-

də yaşamış memar Kərbəlayi Səfixan Qarabağı tikibmiş.

Bir mənbədə (3) Şuşanın 129 tarixi abidəsinin və 14 məhəllənin adı öz ifadəsini tapıb. Şagirdlər, həmin mənbəyə (3) əsaslanaraq, Şuşanın tarixi abidələri ilə tanış olurlar. Bəzilərini diqqət mərkəzinə gətiririk: "Qala divarı (uzunluğu 8 km); Qala Divarları üzərində tikilmiş bürclər (17 ədəd); 17 qədim üslubda salınmış məhəllə; 17 məscid; 17 bulaq; 17 hamam; Meydan bulağı; İsa bulağı; Saxsı bulaq; Turşsu Qalereyası; Karvansaray (4 ədəd); Şahlıq körpüsü; Gəncə qapısı; Zarıslıda Korun karvansarayı; Təzə məhəllədə körpü; Ü. Hacıbəylinin heykəli; Bülbülün büstü; H. Hacıbəyovun büstü; Cıdır düzü; Topxana meşəsi; Ağaböyük Xanımın bürcü; Malıbəylidə Qızlar məktəbi; Un dəyirmanı; Kəlba Şəhriyarın bağı; Həzrət Əli" kahası; Ağabəyim Ağanın qəsri; Bəhmən Mirzə Qacarın saray kompleksi; Bəhmən Mirzənin hərəmxanası; Bəhmən Mirzə Qacarın tikdirdiyi "Bab" hamamı; "Həzrət Abbas Şəfa ocağı"; Qotur bulağı; Qacarların məqbərə kompleksi; Qulam Şahın malikanəsi; Qarabağ xanlığının Divan kompleksi; M.P. Vaqifin müəllimlik etdiyi bina; Xan qızı Xurşud Banu Natəvanın sarayı; X.B. Natəvanın tikdirdiyi həbsxana; Aşağı və Yuxarı Gövhər Ağa Məscidləri; İbrahim xanın mülki; İbrahim Xəlil xanın 1801-ci ildə tikdirdiyi mədrəsə kompleksi (Gövhər Ağanın məscidinin həyətində); Qarabağ xanlığının vəziri Mirzə Cəmal bəy Cavanşirin və onun ailəsinin məqbərə kompleksi; Tarixin yaddaşı olan Daş Kitabələr və s.

***Yuxarı Gövhər ağa məscidinin mədrəsəsi***. Yuxarı Gövhər ağa məscidini İbrahimxəlil xanın qızı Gövhər ağa tikdirib (1883–1884). Memarı memar Kərbəlayı Səfixan idi. Məscid bu günümüzə qədər gəlib çıxmışdır.



On doqquzuncu yüzilliyin sonlarında Yuxarı Gövhər ağa məscidində yenidənqurma işləri aparılmış, məscidin ön hissəsində ikimərtəbəli mədrəsə tikilmişdir. Mədrəsənin ikinci mərtəbəsində taxtadan eyvanlar düzəldilmişdir. Onlar dərs otaqları kimi nəzərdə tutulub.

***İsa bulağı*** – Şuşanın adı dillərdə gəzən ən məşhur bulaqlarından, tarixi abidələrindəndir. Rəvayətə görə, bulaq XVIII əsrdə onu qalın meşəlikdə aşkara çıxarmış İsa adlı əkinçinin adı ilə bağlıdır.



Bu bulaq Şuşa şəhərindən təxminən iki kilometr kənarda, dəniz səviyyəsindən haradasa 1500 metr hündürlükdə, meşədə yerləşir. Hazırda İsa bulağı tam bərpa olunub.

***Ağa körpüsü.*** Bu körpü Gövhər ağa tərəfindən tikdirilmişdir. Gövhər ağa İbrahimxəlil xan Cavanşirin sonbeşik qızı idi. Xeyirxahlığı ilə seçilirdi. O zamanlar bu körpüyə camaatın böyük ehtiyacı vardı. Bunu nəzərə alaraq, Gövhər ağa Şuşanı Gəncə ilə birləşdirən karvan yolunun,

yəni qədim Kəhrab dərəsinin üstündə bir körpü inşa etdirdi. Körpü Xəlifəli çayının Daşaltı çayına qovuşduğu yerdə qərar tutan birtağlı körpünün uzunluğu 25 metr, eni isə 7 metr idi.



Az keçmiş *“Ağa körpüsü”* Şuşa ilə şimal şəhərləri arasında əlaqəni təmin edən nəqliyyat yoluna çevrildi. Bu körpü təkcə ticarət karvanlarının deyil, həm də insanların n hərəkət etdikləri məntəqə rolunun oynadı.

Həmin körpü sonradan onu inşa edənin adı ilə “Ağa körpüsü” kimi dillərə düşdü.



***Xan qızı Natəvanın sarayı*** – on səkkizinci yüzilliyə aid tarix-memarlıq abidəsidir. Binanın birinci mərtəbəsində yeddi otaq vardır. Həmin otaqlar xidməti xarakterli və xidmətçilərin yaşaması üçün idi. Cənub tərəfdə üç giriş qapısı var. Ortadakı qapı dəhlizə, yanlardakı iki qapı yan otaqlara aiddir. Sarayın cənub fasadı vertikal şəkildə yerləşdirilmiş bellərlə bölünüb.

İkinci mərtəbənin pəncərələrini çərçivəyə alan bellər başqa bellərə nisbətən xeyli genişdir.

Bu saray Şuşanın ilk günlərində tikilmiş mülklərindən sayılır, böyük ərazini əhatə edən həyətdən, eyni zamanda həyətdəki müxtəlif xidməti tikililərdən ibarətdir.

1932-ci il ildə bu sarayda Şuşa Musiqi Məktəbi yerləşdirilmişdir. 1987-ci ildə binada təmir və yenidənqurma işləri aparılmış, saray Xurşidbanu Natəvanın ev-muzeyi olaraq fəaliyyətə başlamışdı. Muzeyin ilk direktoru Namiq Babayev idi.



***Cıdır düzü*** – "yarış meydanı" deməkdir. Cıdır düzü Şuşanın yaxınlığında, onun cənub, nisbətən düz, lakin daha yüksək hissəsində yerləşir. Çəmənlik dərəyə və Daşaltı çayının 200 metr aşağıdan axan Daşaltı dərəsinə boylanır. Cıdır düzündə, adətən cıdır yarışları təşkil olunardı. Qarabağ xanlığının dövründə isə, bu ərazidə Novruz bayramının, digər şənliklərin, covqan oyunlarının, qaçış oyunlarının, başqa yarışların keçirilməsi adət halını almışdı.

Xanın həyətində xüsusi zorxana olsa da, çox adam havalar xoş olanda özlərini Cıdır düzünə verərdilər.

İbrahimxəlil xan at həvəskarı idi. Atlar və dəvələrlə keçirilən yarışları həvəslə qarşılardı. Yarışlara böyük marağı olduğundan onların öz malikanəsində və Cıdır düzündə keçirilməsini məqsədəuyğun bilirdi. Qaliblər qiymətli hədiyyələrlə mükafatlandırılırdılar.

At belində keçirilən "Baharbəndi" adlı oyun, "Papaq oyunu" və "Yaylıq oyunu" Cıdır düzündə təşkil edilir, insanların böyük sevincinə və

marağına səbəb olurdu. Cıdır düzü eyni zamanda pəhləvanların yarışdığı; ədəbi-musiqili məclislərin, musiqi şənliklərinin də keçirildiyi yer kimi xatirələrdə qalmışdır. Mir Möhsün Nəvvab "Məclisi-Fəramuşan" cəmiyyəti üzvlərini Cıdır düzünə yığar, şeir məclisini burada qurardı. Bayram şənliklərində kəndirbazların, klounların çıxışları da özünə yer alardı.

Cıdır düzü xarici ölkə nümayəndələrini də qəbul edirdi.

***Topxana meşəsi*** meşə və dövlət qoruğudur. Şuşa şəhərinin yaxınlığındadır.

1988-ci ildə, hələ SSRİ-yə daxil olduğumuz ildə ermənilər bu meşəyə divan tutdular. Bu, erməni-azərbaycanlı qarşıdurmasına səbəb oldu. Xam xəyallara düşərək, Böyük Ermənistan yaratmaq kimi sərsəm, ağılsız, cəfəng düşüncələr qapılan Ermənistan Azərbaycanın Dağlıq Qarabağ adlanan ərazisindəki erməniləri qanun pozğunluğuna, qiyam və özbaşınalıqlara məcbur edirdi. Bu isə, Dağlıq Qarabağ müharibəsi ilə nəticələndi.

Topxana meşəsi qara günlərini yaşadı.

Topxana adı necə yaranmışdır? Ağa Məhəmməd şah Qacar Şuşanı mühasirəyə aldığı vaxt (1795) ordusunun topları bu ərazidə yerləşdirilmişdi. Həmin səbəbdən də meşənin adı Topxana olaraq qaldı.

Haqqında bəhs edilən abidələr Şuşanın onlarla abidələrindən yalnız bəziləridir. Azərbaycanın, o cümlədən Şuşanın tarixi abidələri ilə tanış olmaq hər bir azərbaycanlı oğlu və qızı üçün vacibdir. Bu abidələrin yaranma tarixinə bələd olmaq, onların keçdiyi yollar, xoş, firavan günləri, məşəqqətli anları (erməni tapdağında qaldığı uzun illər) barədə təsəvvürə malik olmaq həm vətəndaşlarımızın, təhsilalanların ölkəmizin təbiətinə, tarixi abidələrinə, maddi və mənəvi sərvətlərinə bələd olmaq baxımından faydalıdırsa, eyni zamanda onlarda iftixar hissləri formalaşdırır. Belə gözəl abidələrə, elə gözəl təbiətə, sərvətlərə malik olduqlarına görə qürur hissləri keçirirlər.

Ermənilər ərazilərimizi işğal etmişdilər, insanlarımızın, evlərimizin, təbiətimizin, meşələrimizin, bulaqlarımızın, dağlarımızın başına min oyun açmışdılar. Onlar elə güman edirdilər ki, əzəli torpaqlarımızı, şəhər, rayon, qəsəbə və kəndlərimizi işğal etdiklərinə görə həmin yerlər, sərvətlər həmişəlik onların əllərində qalacaqdır. Amma yanılırdılar. Biz bir daha əvvəlki torpaqlarımıza, şəhər və rayonlarımıza qayıtdıq, düşmənə yerini göstərdik. İşğaldan azad olmuş meşələrimiz, dağlarımız, qayalarımız, ormanlarımız, dərələrimiz, çaylarımız, su anbarlarımız yenə bizimlədir. Eşq olsun Ali Baş Komandan İlham Əliyevə!!! Eşq olsun müzəffər Azərbaycan Ordusuna!!!

**Problemin aktuallığı.** Şuşa mövzusu, Şuşanın tarixi abidələri mövzusu həmişə aktualdır, aktual olaraq qalır.

**Problemin yeniliyi.** Məqalə şagirdlərin Şuşanın tarixi abidələri ilə tanışlığına həsr olunub. Bu, son dərəcə vacib məsələdir.

**Problemin praktik əhəmiyyəti.** Məqalə gənc tədqiqatçılar üçün faydalı olacaqdır.

**Ədəbiyyat**


1. Yuxarı Gövhər ağa məscidi. https://az.wikipedia.org/wiki/Yuxar%C4%B1_G%C3%B6vh%C9%99r_a%C4%9Fa_m%C9%99scidi
2. İsa bulağı https://az.wikipedia.org/wiki/%C4%B0sa_bula%C4%9F%C4%B1
3. Ağa körpüsü. https://az.wikipedia.org/wiki/A%C4%9Fa_k%C3%B6rp%C3%BCs%C3%BC1. Topxana meşəsi https://az.wikipedia.org/wiki/Topxana_me%C5%9F%C9%99si
4. Xan qızı Natəvan sarayı. https://az.wikipedia.org/wiki/Xan_q%C4%B1z%C4%B1_Nat%C9%99van%C4%B1n_saray%C4%B1

*UOT 371*

***İlham Ağaqardaş oğlu Cavadov***
*pedaqogika üzrə fəlsəfə doktoru, dosent*
*Təhsil İnstitutunun direktor müavini*
***Orcid**: https://orcid.org/0009-0004-8522-320X*

***Çingiz Rövşən oğlu Baxşıyev***
*Azərbaycan Dövlət Pedaqoji Universiteti*
***Orcid**: https://orcid.org/0009-0000-0986-3740*

***Jalə Cəlil qızı Kərimova***
*Azərbaycan Dövlət Pedaqoji Universiteti*
***Orcid**: https://orcid.org/0009-0003-8601-8235*

# ALİ TƏHSİL MÜƏSSİSƏLƏRİNDƏ KEYFİYYƏT TƏMİNATI SİSTEMİNDƏ AVROPA STANDARTLARI VƏ TƏLİMATLARININ (ESG) TƏTBİQİNİN ƏHƏMİYYƏTİ

***Ильхам Агагардаш оглы Джавадов***
*доктор философии по педагогике, доцент,*
*заместитель директора*
*Института Образования Азербайджанской Республики*

***Чингиз Ровшан оглы Бахшиев***
*Азербайджанский Государственный Педагогический Университет*

***Жаля Джалиль гызы Керимова***
*Азербайджанский Государственный Педагогический Университет*

# ВАЖНОСТЬ ВНЕДРЕНИЯ ЕВРОПЕЙСКИХ СТАНДАРТОВ И РЕКОМЕНДАЦИЙ (ESG) В СИСТЕМУ ОБЕСПЕЧЕНИЯ КАЧЕСТВА В ВЫСШИХ УЧЕБНЫХ ЗАВЕДЕНИЯХ

***Ilham Aghagardash Javadov***
*doctor of philosophy in pedagogy, associate professor,*
*deputy director of the*
*Institute of Education of the Azerbaijan Republic*

***Chingiz Rovshan Bakhshiyev***
*Azerbaijan State Pedagogical University*

***Jala Jalil Karimova***
*Azerbaijan State Pedagogical University*

# THE IMPORTANCE OF THE IMPLEMENTATION OF EUROPEAN STANDARDS AND GUIDELINES (ESG) IN THE QUALITY ASSURANCE SYSTEM IN HIGHER EDUCATION INSTITUTIONS

**Xülasə.** Keyfiyyət təminatı sahəsində beynəlxalq əməkdaşlıq Avropa Ali Təhsil Məkanı (AATM) yaratmağı hədəfləyən Bolonya prosesinin mühüm elementlərindəndir. Bu işin həyata keçirilməsində əsas alət Avropa Ali Təhsil Məkanında Keyfiyyət Təminatı üzrə Avropa Standartları və Təlimatlarıdır (ESG).

2015-ci ildə başlanılan Ali təhsil sisteminin Avropa Ali Təhsil Məkanının tələblərinə daha da uyğunlaşdırılması məqsədi ilə Azərbaycan Respublikasının Təhsil Nazirliyinə dəstək göstərilməsi üzrə Tvinninq layihəsi ESG-nin Azərbaycan ali təhsilində tətbiq edilməsi imkanı verdi. Layihənin icbari nəticələrindən biri Azərbaycan ali təhsilində ESG-yə uyğun keyfiyyət təminatı üzrə standartların və təlimatların (AzST) hazırlanması və sənədin üç ali təhsil müəssisəsində sınaqdan keçirilməsidir.
***Açar sözlər:*** *Avropa standartları, beynəlxalq əməkdaşlıq, keyfiyyət təminatı, təlimat*

**Резюме.** Международное сотрудничество в области обеспечения качества является одним из важных элементов Болонского процесса, целью которого является создание Европейского пространства высшего образования (ЕПВО). Основным средством реализации этой работы являются Европейские стандарты и рекомендации по обеспечению качества в Европейском пространстве высшего образования (ESG). Запущенный в 2015 году проект Twinning по оказанию поддержки Министерству Образования Азербайджанской Республики с целью дальнейшей адаптации системы высшего образования к требованиям Европейского пространства высшего образования предоставил возможность применить ESG в высшем образовании Азербайджана. Одним из обязательных результатов проекта является подготовка стандартов и руководств по обеспечению качества в соответствии с ESG в азербайджанском высшем образовании (AzST) и апробация документа в трех высших учебных заведениях.
***Ключевые слова:*** *Европейские стандарты, международное сотрудничество, гарантия качества, руководство*

**Summary.** International cooperation in the field of quality assurance is one of the important elements of the Bologna process, which aims to create a European Higher Education Area (EAHE). The main tool in the implementation of this work is the European Standards and Guidelines for Quality Assurance in the European Higher Education Area (ESG). The Twinning project on providing support to the Ministry of Education of the Republic of Azerbaijan with the aim of further adapting the higher education system to the requirements of the European Higher Education Area, launched in 2015, provided an opportunity to apply ESG in Azerbaijan's higher education. One of the mandatory results of the project is the preparation of standards and guidelines for quality assurance in accordance with ESG in Azerbaijani higher education (AzST) and the testing of the document in three higher education institutions.
***Keywords:*** *European standards, international cooperation, quality assurance, management*

Avropa ali təhsil məkanında daxili keyfiyyət təminatı üzrə standartlar və təlimatlar (ESG) Avropa Tələbələr Birliyi (ATB) [1], Ali Təhsil Müəssisələrinin Avropa Assosiasiyası (EURASHE), Avropa Universitetlər Assosiasiyası (EUA) ilə birlikdə Ali Təhsildə Keyfiyyətə Təminat üzrə Avropa Assosiasiyası (ENQA) tərəfindən hazırlanmış təklif əsasında ali təhsil məsələlərinə cavabdeh olan nazirliklər tərəfindən 2005-ci ildə qəbul olunmuşdur. 2005-ci ildən etibarən keyfiyyət təminatında, eləcə də kvalifikasiya çərçivəsi, təlim nəticələrinin istifadəsinin tanınması və təşviqi kimi həyata keçirilən digər Bolonya tədbirlərində əhəmiyyətli irəliləyişlər baş vermişdir. Bütün bunlar tələbələrə əsaslanan tədris və təhsil istiqamətində köklü fikir dəyişikliyinə gətirib çıxarmışdır.

Keyfiyyət təminatı prosesləri, xüsusi ilə xarici keyfiyyət təminatı prosesləri Avropa ali təhsil müəssisələrinin keyfiyyətini nümayiş etdirməyə və şəffaflığı artırmağa imkan verir, beləliklə, qarşılıqlı etimad yaratmağa, ali təhsil müəssisələrinin təsnifatlarının, proqramlarının və xidmətlərinin daha yaxşı tanınmasına yardım edir. Müəssisələr və keyfiyyət təminatı agentlikləri ESG-dən ali təhsildə daxili və xarici keyfiyyət təminatı sistemləri üçün istinad sənəd kimi

istifadə edir. Bundan əlavə, ESG tələblərinə cavab verən keyfiyyət təminatı agentliklərin reyestrinin aparılması üzrə məsul təşkilat olan Ali Təhsildə Keyfiyyət Təminatı üzrə Avropa Reyestri fəaliyyətində ESG-yə əsaslanır.(2)

Ali təhsil sahəsində keyfiyyət təminatı üzrə Avropa standartları və təlimatları Keyfiyyət təminatı üzrə standartlar üç hissəyə bölünür:

1) Daxili keyfiyyət təminatı;
2) Xarici keyfiyyət təminatı;
3) Keyfiyyət təminatı agentlikləri. (1)

Keyfiyyət planlaşdırması: KTS-də hər bir komponentin bir-biri ilə əlaqəsi olduğu və sistemin planlı və sistematik fəaliyyətlərin birləşməsi olduğu üçün daxilindəki fəaliyyətlər və münasibətləri yaxşı planlaşdırılmalı və qurulmalıdır. İlkin qiymətləndirmə ilə müəyyən edilmiş mövcud vəziyyət məlumatları planlaşdırma üçün əhəmiyyətli bir giriş təşkil edir. Bu mərhələdə hədəflər, həyata keçiriləcək fəaliyyətlər və onların mərhələləri, məsul şəxslər, mənbələr, xərclər, vaxt və s. müəyyənləşdirilməsi məqsədəuyğundur.

Daxili KT: Daxili KT-nin əsas məqsədi görülən işlərin və qurulmuş sistemin effektivliyini, hədəflərə uyğunluğunu və sistem tələblərini yaxşılaşdırmaq üçün istifadə edilə bilən imkanları müəyyənləşdirməkdir. Bu şəkildə, müəssisənin xarici KT-dan əvvəl özünü yoxlaması yarana biləcək hər hansı problemin vaxtında aşkar olunmasına və buna görə də təxirə salınmaz tədbirlərin görülməsinə gətirib çıxarır.

Xarici KT: Daxili KT-dən sonra müəssisədə yaranan çatışmazlıqlar və səhvlər düzəldilsə də qərəzsiz və müstəqil bir komanda tərəfindən müəssisə yoxlanılmalıdır. Həmin yoxlama KT sistemlərini bilən və təşkilatın fəaliyyət sahəsində təcrübəsi olan KT agentlikləri tərəfindən aparılmalıdır.

**Azərbaycan və dünya ali təhsilində keyfiyyət təminatı**

Dünyada keyfiyyətdən ATM-nin məsuliyyət daşıması KT-də ən geniş yayılmış yanaşmadır. Ali təhsildə beynəlxalq tələbə hərəkətliliyi artan tendensiyada olduğundan, dövlətlər üçün digər ölkələrdəki proqram və dərəcələrin qiymətləndirilməsi, akkreditasiyası çox vacibdir. Akkreditasiya tədrisdə keyfiyyət təminatı və universitetlərin təlim-tədris keyfiyyətlərinin inkişafına dəstək olan təşəbbüslərin, təcrübələrin təşviqi üçün vacibdir (Makhoul, 2019). ABŞ ali təhsil sistemini səciyyələndirən ən vacib cəhət, sistemin mərkəzləşdirilməmiş bir quruluşa və institusional fərqliliyə sahib olmasıdır. Akkreditasiya xarici keyfiyyət qiymətləndirmə prosedurudur. Amerika akkreditasiya sisteminin ən vacib üstünlüyü Avropa sistemlərindən daha az bürokratik və özünü tənzimləyən olmasıdır. Akkreditasiya könüllüdür və akkreditə olmayan müəssisələr da təhsil vermək hüququna malikdirlər. Belə ki, burda ATM öz akademik keyfiyyətinə görə məsuliyyət daşıyır və akademik keyfiyyətin qorunması və yaxşılaşdırılması üçün institusional muxtariyyət vacibdir. Tanınma institusional və proqram akkreditasiyası üçün milli koordinasiyadan məsul olan özəl qurum olan Ali Təhsil Akkreditasiya Şurası (CHEA) və ya ABŞ Təhsil Nazirliyi yəni federal hökumət tərəfindən həyata keçirilir.

CHEA ABŞ-da institusional və proqram akkreditasiya qurumlarını qəbul edən kollec və universitetlərin birliyidir. 2007-ci ildən etibarən CHEA və ya Təhsil Nazirliyi tərəfindən ümumilikdə 19 institusional akkreditasiya qurumu qeydiyyata alınmışdır. Həmin 19 KT agentlikləri ABŞ-dakı 7000 ATM-i akkreditasiyadan keçirirlər. Bundan əlavə, proqramları akkreditasiya edən 61 təşkilat var ki, onlar da 19000-dən çox təhsil proqramını akkreditasiya edirlər. CHEA, yalnız ali təhsil akkreditasiyası və KT-ni diqqət mərkəzində saxlayan yeganə milli təşkilatdır (5). 25.07.2019-cu il tarixdə Ali Təhsildə Akademik

Dərəcələri və Keyfiyyətin Yüksəldilməsi üzrə Milli Qurumun (NİAD-QE) təşkilatçılığı və bir çox təşkilatların, o cümlədən CHEA-nın dəstəyi ilə Yaponiyada Milli Elmlər Mərkəzində "Dəyişən Zamanlarda Ali Təhsildə Keyfiyyət Təminatı" mövzusunda keçirilmiş Universiteti Keyfiyyət Təminatı 2019 Forumunda CHEA prezidenti Dr. Judith Eaon çıxış edərək ATM-lərin şaxələndirilməsi və rəqəmsal təhsildə KT, çoxtərəfli tələbə mübadiləsi və universitet reytinqləri kimi müxtəlif qlobal dəyişikliklərə diqqət çəkmişdir. Daha sonra J.Eaton ümumi cəmiyyətdə ideal KT və akkreditasiya düşündüyümüz zaman həmin dəyişikliklərin yaxşı tanınmasının vacibliyini vurğulamışdır. Dr. Eaton bu fikirlərin tələbələrin xeyrinə olduğunu və ali təhsil cəmiyyətinin dəyişikliklərə adaptasiyaya çalışdığını izah etmişdir (5)

İNGİLTƏRƏ universitetləri dövlət resursları tərəfindən dəstəkləndiklərinə və muxtar olduqlarına görə idarəetmə, təhsil, tədqiqat və s. baxımından yüksək dərəcədə müstəqilliyə sahibdirlər. İngiltərədəki universitetlərin və digər ATM-lərin xarici qiymətləndirilməsi 1997-ci ildə müstəqil bir status olaraq təsis edilmiş Ali Təhsildə Keyfiyyət Təminatı Agentliyinin (QAA) məsuliyyətidir. QAA İngiltərədəki ali təhsil standartlarını və keyfiyyətini təsdiqləyən müstəqil bir təşkilatdır. İngiltərədəki bütün universitetlər QAA-nın rəsmi üzvləri və ortaqlarıdır. QAA, universitetlərin üzvlük haqları və maliyyə agentliklərinin müqavilələrindən əldə edilən gəlirlər hesabına maliyyələşdirilir.

Agentliyin əsas missiyaları aşağıdakılardır (3):

- İngiltərə ali təhsil sisteminin keyfiyyətinin inkişafı və standartlarının qorunması – harada ki, həmin sistem tətbiq olunur;
- İngiltərədə bir ixtisas dərəcəsi qazanmaq üçün çalışan tələbələrin gözlədikləri ali təhsil almasını yoxlamaq. Agentliyin tələbələrin ehtiyacları ilə məşğul olmaq, standartları qorumaq, inkişaflara nəzarət və Böyük Britaniyanın ali təhsili ilə bağlı cəmiyyətin anlayışını inkişaf etdirmək kimi dörd əsas strateji məqsədləri var. Agentlik, ATM-lərdə və İngiltərədəki ali təhsilin alternativ təminatçılarının akademik standartlarını və keyfiyyətlərini necə qoruduqlarını araşdırmaqla yanaşı, İngiltərənin Xüsusi Şurasına (The Privy Council of the United Kingdom) qurumların dərəcə vermə qabiliyyətləri və universitet adı vermə hüququ ilə bağlı tələblərinə dair məsləhətlər verir. QAA İdarə Heyətində 15 üzv var. 2009-2010-cu il tarixindən etibarən qiymətləndirmə qrupuna bir tələbə də əlavə edilmişdir.

FİNLANDİYA Təhsil Nazirliyinin nəzdindəki Finlandiya Ali Təhsil Qiymətləndirmə Şurası (FINHEEC) ATM-lərin KT sistemlərinə nəzarət edir. Finlandiya keyfiyyətli nəzarət modelində ATM-lər öz KTS-lərinə qərar verə bilər və FINHEEC KTS-lərin fəaliyyətini qiymətləndirir. FINHEEC-in əsas vəzifəsi ATM-lərə və Təhsil Nazirliyinə akkreditasiya ilə bağlı məsələlərdə kömək etmək və ATM-lərin akkreditasiyasını təşkil etməkdir. FINHEEC tərəfindən Finlandiyadakı bütün ATM-lərin institusional yoxlamaları altı illik aparılır. İnstitusional yoxlamalar qurumların KTS-ni qiymətləndirir (Kettunen, 2012). FINHEEC-in əsas məqsədi isə Finlandiya ATM-lərini müqayisə məlumatlarının hazırlanması, inkişaf üçün tövsiyələrin verilməsi, ən yaxşı təcrübələrin tətbiqi və akkreditasiya etmək yolu ilə yaxşılaşdırmaqdır. FINHEEC xüsusilə beynəlxalq və Avropa səviyyəsində əməkdaşlıqda fəal iştirak edir və müxtəlif ölkələrin qiymətləndirmə təşkilatları və şəbəkələri ilə əlaqələr qurur və onu davam etdirir. Bundan əlavə, FINHEEC tərəfindən universitetlərdəki KTS-lərin yoxlanılmasında əsas məqsəd həmin sistemlərin Avropa KT prinsiplərinə cavab verməsini formalaşdırmaqdır (3).

Azərbaycan ali təhsil sistemində Avropa Kredit Transfer Sisteminin tətbiq olunması, Avropanın və dünyanın aparıcı universitetlərinin müsbət təcrübəsinin ölkəmizə gətirilməsi ilə ali təhsildə KT-nin inkişafına şərait yaratmışdır.

XXI əsrin tələblərinə uyğun olaraq rəqabətqabiliyyətli insan kapitalının yetişdirilməsi, tələbə qəbulu qaydalarının təkmilləşdirilməsi, universitetlərdə keyfiyyətin təminatı mərkəzlərinin yaradılması və məzunların işlə təmin olunmasına xidmət edən karyera mərkəzlərinin fəaliyyətində effektivliyinin yüksəldilməsi istiqamətlərində ciddi uğurlar əldə olunmuşdur. Azərbaycan 2015-ci ildən Ali Təhsildə Keyfiyyətin Təminatı üzrə Avropa Reyestri (EQAR) təşkilatının üzv seçilmişdir. Məlumat üçün bildirirəm ki, EQAR Bolonya prosesinə üzv ölkələrin mandatı ilə Ali təhsildə keyfiyyətin təminatı üzrə Avropa Assosiasiyasının (ENQA), Avropa Universitetlər Assosiasiyasının (EUA), ATM-lərin Avropa Assosiasiyasının (EURASHE) və Avropa Tələbələr Birliyinin (ESU) təşəbbüsü əsasında ali təhsildə keyfiyyətə nəzarət üçün yaradılmış ilk rəsmi qurumdur. Azərbaycanda yerli və beynəlxalq səviyyədə qəbul edilmiş standartlara əsaslanan ali, orta ixtisas və əlavə təhsilin keyfiyyətinin müstəqil qiymətləndirilməsi sahəsində peşəkar və mütəxəssis qurum Azərbaycan Respublikası Təhsil Nazirliyinin tabeliyində publik hüquqi şəxs statusu olan Təhsildə Keyfiyyət Təminatı Agentliyidir (TKTA).

TKTA Azərbaycan Respublikası Prezidentinin 29.12.2019-cu il tarixdə imzaladığı müvafiq Fərmana əsasən, Təhsil Nazirliyinin Akkreditasiya və Nostrifikasiya İdarəsinin bazasında təşkil edilmişdir. TKTA-nın məqsədi Azərbaycan Respublikasında effektiv KTS-in fəaliyyətini təşkil etməkdən, keyfiyyət nəticələri və əhatəliliyinə görə dünya ölkələri sırasında qabaqcıl mövqe tutan təhsil sisteminin formalaşdırılmasından, müasir dövrün tələblərinə uyğun bilik, bacarıq, səriştə və təcrübəyə malik rəqabət qabiliyyətli insan kapitalının əmək bazarına çıxışına dəstək göstərilməsindən ibarətdir. TKTA təhsil proqramlarının keyfiyyət səviyyələrinin müəyyənləşdirilməsi və tələblərin həyata keçirilməsini təmin edir və 2017-ci ildə Avropa Ali Təhsil Məkanında Keyfiyyətin Təminatı üzrə Assosiasiyada (ENQA) müşahidəçi üzv statusu qazanmışdır. Təhsil müəssisələrinin akkreditasiyası hər 5 ildən bir həyata keçirilir.

TKTA effektiv KTS-in fəaliyyətini təşkil edərək, müasir dövrün tələblərinə uyğun bilik, bacarıq, səriştə və təcrübəyə malik mütəxəssislərin əmək bazarına çıxışına dəstək göstərməkdədir. TKTA-nın əsas amalı ölkədə "Keyfiyyət-mərkəzli ömür boyu təhsil"in formalaşmasına təminat yaratmaq üçün cəmiyyət və bütün digər təhsil sahəsinin iştirakçıları ilə birlikdə maksimum səmərəli nəticə əldə etməkdir. Bu baxımdan, yeni Akkreditasiya Qaydaları isə təhsil müəssisələrinin akkreditasiyası və KT ilə bağlı bir çox üstünlükləri yaratmaqla cəmiyyətin keyfiyyətli təhsilə olan bir çox gözləntilərinin təmin olunmasına töhfə vermiş olacaqdır (3):

1. Azərbaycan Respublikasında təhsil sisteminin inkişafı, beynəlmiləlləşməsi və təhsilin keyfiyyət səviyyəsinin yüksədilməsinin təmin olunması məqsədilə beynəlxalq təcrübə əsasında təhsil müəssisələrinin elektronlaşdırılmış akkreditasiyası sistemi formalaşacaq;

2. ATM-in fəaliyyətinin və təhsil proqramlarının icrasının qiymətləndirilməsi zamanı Avropa Ali Təhsil Məkanının KT prinsiplərinin də nəzərə alınması təmin olunacaq;

3. Məzunlarına iki və daha çox xarici ölkələrin ATM-lərində təhsil almaq hüququ verən təhsil proqramlarının akkreditasiyası məqsədilə təhsil proqramlarının icrasının qiymətləndirilməsi mexanizmi formalaşacaq;

4. Təhsil müəssisəsinin fəaliyyətinin və ayrı-ayrı təhsil

proqramlarının icrasının qiymətləndirilməsi prosesinə müstəqil ekspertlərlə bərabər təhsil müəssisəsinin fəaliyyətində maraqlı tərəflərin, xüsusən də işəgötürənlərin və təhsilalanların nümayəndələri cəlb ediləcək;

5. Təhsil müəssisələrində daxili KTS-in qurulmasına köməklik göstərəcək və təhsil müəssisələrini öz strateji inkişaf planını və keyfiyyət siyasətini formalaşdırmağa təşviq edəcəkdir.

**Problemin aktuallığı.** Ali təhsilin əlçatarlılığının artması ali təhsil müəssisələrinə daha çox müxtəlif fərdi təcrübələrdən yararlanmaq imkanı yaradır. Ali təhsilin müxtəlifliyə və dəyişən gözləntilərə cavab verə bilməsi üçün ali təhsil müəssisələrinin fəaliyyətində əsaslı dəyişikliklər tələb olunur. Bu dəyişikliklərə təlim və tədris prosesində tələbəyə fərdi yanaşmanın artırılması, yeni şəraitə çevik uyğunlaşa bilən tədris metodlarından istifadə və rəsmi tədris planlarından kənarda əldə edilmiş qabiliyyətlərin tanınması aiddir. Ali təhsil müəssisələri həyata keçirdikləri missiyalara, tədris və əməkdaşlıq imkanlarına, o cümlədən beynəlmiləlləşmənin inkişafına, onların malik olduqları rəqəmsal tədris vasitələrinə və tətbiq etdikləri tədris formalarına görə fərqlənir.

**Problemin yeniliyi.** Ali təhsil sistemlərinin və ali təhsil müəssisələrinin bu dəyişikliklərə cavab verməsində, eləcə də tələbələrin əldə etdiyi təsnifatların təmin edilməsində keyfiyyət təminatının rolu olduqca əhəmiyyətlidir və onların ali təhsil təcrübəsi müəssisənin əsas missiyalarındandır. Ali təhsil məkanında keyfiyyət təminatı üzrə standartlar və təlimatların əsas məqsədi fərqli regionlarda və bütün maraqlı tərəflər arasında təhsil və tədris prosesində keyfiyyət təminatına dair ortaq anlayışın yaradılmasına töhfə verməkdir. Həmin standartlar və təlimatlar Avropa ali təhsil məkanında milli və institusional keyfiyyət təminatı sisteminin təkmilləşdirilməsində və regional əməkdaşlıq məsələsində vacib rol oynayır və rol oynamaqda davam edəcəkdir.

**Problemin praktik əhəmiyyəti.** Ali təhsil, tədqiqatlar və innovasiyalar sosial həmrəyliyin, iqtisadi yüksəlişin və beynəlxalq rəqabətədavamlılığın artırılmasında əhəmiyyətli rol oynayır. Avropa cəmiyyətlərinin daima inkişafda olan və biliklərə əsaslanan cəmiyyət qurmaq istəyini nəzərə aldıqda ali təhsilin sosial-iqtisadi və mədəni inkişafın əhəmiyyətli bir komponenti olduğu qənaətinə gəlmək olar. Eyni zamanda, bacarıq və qabiliyyətlərə dair tələblər artdığı üçün ali təhsil həmin tələblərə yalnız innovativ metodlardan istifadə etməklə cavab verə bilər.

**Nəticə.** KTS müəssisənin və onun keyfiyyət səviyyəsinin davamlı inkişafını təmin edən vacib bir vasitədir. Buna görə qazanılmış keyfiyyət səviyyəsini qorumaqla yanaşı əmək bazarının tələbləri, maraqlı tərəflərin gözləntiləri və çətin rəqabət şərtləri nəzərə alınaraq müəssisə öz proseslərini davamlı inkişaf etdirməli və KT sistemlərini də təkmilləşdirməlidir. Ümumi qiymətləndirildikdə ölkələr arasında KTS-in qəbulundan tutmuş tətbiqinə qədər mühüm fərqlər mövcuddur. Başqa sözlə, KT-nin tətbiqi ilə ali təhsildə milli hədəfin nə olması çox vacibdir ki, bu da KT prosedurlarından tutmuş milli agentliklərin vəzifəsinə, funksiyasına və tərkibinə qədər hər şeyi müəyyənləşdirir.

**Ədəbiyyat:**

1. Westerheijden, Don F., Stensaker, B. və Rosa, M, J. (2007). Quality Assurance In Higher Education. Springer, Dordrecht
2. Tight, M. (2020). Research into Quality Assurance and Quality Management in Higher Education. Theory and Method in Higher Education Research, Vol. 6, pp. 185-202.
3. Carolyn, C, Christina, R. (2002). Quality Assurance and the Development of Course Programmes. Carfax Publishing, Taylor & Francis Ltd, Bucharest
4. Makhoul, S, A. (2019). Higher education accreditation, quality assurance and their impact to teaching and learning enhancement. Journal of Economic and Administrative Sciences. Vol. 35 No. 4, pp. 235-250.

**E-mail:** cingizbaxsiyev675@gmail.com
**Redaksiyaya daxil olub:** 22.02.2024.

*UOT 37.01.*

***Müseyib İbrahim oğlu İlyasov***
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin  kafedra müdiri*
*pedaqogika  elmləri doktoru, professor*

# MÜƏLLİM SƏRİŞTƏLİLİYİ ŞAGİRD ŞƏXSİYYƏTİNİN İNKİŞAF ETDİRİLMƏSİNİN MÜHÜM AMİLİ KİMİ

***Мусейиб Ибрагим оглу Ильясов***
*доктор педагогических наук, профессор*
*заведующий кафедрой Азербайджанского Государственного Педагогического Университета*

# КОМПЕТЕНТНОСТЬ УЧИТЕЛЯ КАК ВАЖНЫЙ ФАКТОР РАЗВИТИЯ ЛИЧНОСТИ УЧЕНИКА

***Museyib Ibrahim Ilyasov***
*head of departament at the Azerbaijan State Pedagogical University,*
*doctor of pedagogical sciences, professor*

# TEACHER COMPETENCE AS AN IMPORTANT FACTOR IN THE DEVELOPMENT OF STUDENT PERSONALITY

**Xülasə.** Müəllimin öz peşəkarlığı və səriştəliliyini daha da inkişaf etdirməyə istiqamətlənmiş fəaliyyəti öz nəticəsini iki istiqamətdə göstərə bilir. Birincisi, müəllimi öz peşəsinin fövqünə qaldırır, onu usta müəllim kimi formalaşdırır, ikincisi, təhsilalanların daha yaxşı öyrənmələrinə, həyati bacarıqlara yiyələnmələrinə və bilavasitə şəxsiyyət kimi formalaşmalarına öz əhəmiyyətli təsirini göstərir. Məqalədə bu problemlərə toxunulmuş, pedaqoji ədəbiyyatda mövcud olan müəllim səriştəliliyinin müxtəlif modellərinin təhlili verilmiş, müəllimin özünühazırlıq və özünüinkişaf istiqamətlərinin əsas parametrləri nəzərdən keçirilmişdir.
***Açar sözlər**: peşə səriştəliliyi; həyati bacarıqlar; özünüinkişaf; şəxsiyyətyönümlü yanaşma; pedaqoji proses.*

**Резюме**. Деятельность педагога, направленная на дальнейшее развитие его профессионализма и компетентности, может показать свои результаты в двух направлениях. Во-первых, это поднимает учителя на вершину его профессии, формирует его как мастера-педагога, а во-вторых, оказывает существенное влияние на лучшее обучение учащихся, приобретение жизненных навыков и формирование личности. Эти проблемы были затронуты в статье, дан анализ различных моделей компетентности учителя, существующих в педагогической литературе, рассмотрены основные параметры направлений самоподготовки и саморазвития учителя,.
***Ключевые слова:*** профессиональная компетентность; жизненные навыки; саморазвитие; личностно-ориентированный подход; педагогический процесс.

**Summary.** The teacher's activity aimed at further developing his professionalism and competence can show its results in two directions. Firstly, it elevates the teacher to the top of his profession, forms him as a master teacher, and

secondly, it has a significant impact on better learning of students, acquisition of life skills and personal formation. hese problems were touched upon in the article, the analysis of various models of teacher competence existing in the pedagogical literature was given, the main parameters of the teacher's self-preparation and self-development directions were reviewed.

***Keywords:*** *professional competence; life skills; self-development; person-oriented approach; pedagogical process.*

Hazırda parta arxasında əyləşən şagirdlərə bu gün verdiyimiz bilik, bacarıq və vərdişlərin və həyata hazırlıq səviyyəsinin 10-15 ildən sonra onların qarşılarına çıxacaq problemləri həll etməyə, həyati vəzifələri yerinə yetirməyə nə dərəcədə cavab verə biləcəyini düşünəndə insan istər-istəməz bir narahatlıq hissləri keçirməli olur. Texnika və texnologiyalar yeniləşir, modifikasiya edilir, dünən yeni olan artıq bu gün köhnəlir, daha yenisi ilə əvəz olunur. Bunlardan asılı olaraq həyatda baş verən hadisələrin dinamikası nəinki uzağı, çox vaxt yaxın gələcəyi belə proqnozlaşdırmağı çətinləşdirir.

Müasir dövrdə internet və digər informasiya vasitələri gündəlik həyatımızda elə daxil olmuşdur ki, nə sosial həyatı, nə də təhsili bunlarsız təsəvvür etmək çətindir. Pedaqoji texnologiyaların inkişafı və digər vasitələrin tədrisdə mühüm yer tutması onun məzmun və gedişində əsaslı dəyişikliklərə səbəb olmuşdur.

Melburn (Avstraliya) universitetinin professoru Patrik Qriffin XXI əsrin insanına aid 10 səriştə müəyyən edir və onları dörd kateqoriyada birləşdirir:

1) yaradıcılığı əks etdirən düşüncə metodları, tənqidi düşüncə, problemlərin həlli və qərarların qəbulu;

2) qarşılıqlı fəaliyyət və əlaqənin olduğu iş üsulları;

3) informasiya-kommunikasiya texnologiyaları kimi iş avadanlıqlarından istifadə və informasiya savadı;

4) vətəndaşlıq, peşə seçimi, şəxsi və sosial məsuliyyət kimi həyati səriştələr [5].

Bunların təhlili belə bir nəticəyə gəlməyə əsas verir ki, bu səriştələri eyni ilə XXI əsrin müəllimlərinə də aid etmək olar.

Müasir şəraitdə məktəblərimizdə aparılan təlim prosesinin xüsusilə üç istiqaməti (texnologiyası) diqqət cəlb edir: 1) fənnin (mövzunun) mənimsədilməsinə istiqamətləndirilmiş təlim (*bilikyönümlü yaxud, fənyönümlü texnologiyalar*), 2) təhsilalanların tələbatlarının ödənilməsinə yönəldilmiş təlim (*şəxsiyyətyönümlü texnologiyalar*) və 3) fənnin mənimsədilməsi və şagirdlərin tələbatlarının təmin olunmasına istiqamətləndirilmiş təlim (*əməkdaşlıq texnologiyaları*). Bunların hər birinin reallaşdırılmasını təmin etmək müəllimin pedaqoji səriştəliliyinin müxtəlif səviyyələrini özündə əks etdirir.

Son illər müəllimlərin peşə səriştəliliyi problemi üzrə bir sıra tədqiqatlar aparılmışdır. Aşağıda təqdim etdiyimiz təqdimatda peşə səriştələri üç qrupa bölünür: 1. İdrakı səriştələr (tənqidi təfəkkür, problemlərin həlli), informasiya-kommunikasiya texnologiyalarından istifadə bacarığı. 2. Kommunikativ səriştələr (sosial – qarşılıqlı fəaliyyət, heyət tərkibində çalışmaq, əməkdaşlıq). 3. İnsanın şəxsi keyfiyyətləri (xüsusiyyətləri) [4].

Bunlar həm də xüsusi meyarlar kimi peşə səriştəliliyinin hansı komponentlərdən ibarət olduğunu

göstərir və peşə səriştəliliyin məzmununu xarakterizə edir.

Digər bir təsnifat tədqiqatçı V.Y. Adolf tərəfindən verilir. O, bir sıra meyarlara (səriştələrə) xüsusi önəm verərək peşə səriştəliliyinin xüsusi meyarlarının aşağıdakılardan ibarət olduğunu göstərir:

1. *Seçicilik.* Bu meyar tələbənin hələ ali məktəbdə təhsil aldığı dövrdə özünü müəllim kimi dərk etmək istəyini ifadə edir və subyektiv olaraq pedaqoji fəaliyyətdə məqsədlərin diferensial şəkildə əks olunmasında özünü göstərir. Eyni zamanda fərd üçün peşəkar və şəxsi əhəmiyyət kəsb edən pedaqoji məqsədlərin qəbul edilməsi dərəcəsi ilə xarakterizə olunur.

2. *Şüurluluq.* Bu, müəllimlərin zehni fəaliyyətini məqsədyönlü şəkildə idarə etmək, peşəkar vəziyyətlərin səriştəli təhlili üsullarını mənimsəmək qabiliyyətinə aiddir.

3. *Nəticəlilik.* Bu, problemli vəziyyətlərin pedaqoji transformasiyası ilə bağlı fəaliyyətin konkret nəticələrində "lazımdır" və "arzu olunan" arasında uyğunsuzluq dərəcəsində özünü göstərir.

4. *Yaradıcı xarakter.* Qeyri-standart pedaqoji vəziyyətləri sosial və şəxsi əhəmiyyətli məqsədlərə çevirmək, onların həlli üçün ən yaxşı variantları tapmaq bacarığı ilə müəyyən edilir.

5. *Maraq.* Şəxsi və peşəkar maraqları birləşdirmək lazımdır [3, s. 54].

Başqa bir təsnifatı da nəzərdən keçirsək, orada da müəllimin peşə səriştəliliyinin bir çox zəruri cəhətlərini görmək olar. Məsələn, tərəfimizdən (2018-ci il) meyar kimi müəllimin 29 peşə səriştəsi müəyyən edilmiş və onlar beş qrupda sistemləşdirilmişdir: 1) *təşkilatçılıq, idarəetmə səriştəliliyi;* 2) *didaktik, öyrədə bilmə səriştəliliyi;* 3) *şagirdlərin idrakının inkişaf etdirilməsi səriştəliliyi;* 4) *pedaqoji prosesə kreativ yanaşma;* 5) *ünsiyyət və əməkdaşlıq səriştəliliyi* [2, s. 92-97].

Bu günki həyat təhsilalanlardan təkcə informasiyaları qavramaq, yadda saxlamaq və yada salmağı tələb etmir. Məktəbin başlıca vəzifəsi böyüyən nəsli fəal həyata hazırlamaq, onları bir şəxsiyyət, vətəndaş, rəqabətqabiliyyətli mütəxəssis kimi formalaşdırmaq olduğundan bu günkü yanaşma tamamilə yeni, gənclərdə həyati bacarıqları formalaşdırmağı önə çəkir. Buna görə də pedaqoji proses tamamilə yeni hədəfləri nəzərə almaqla gənc nəsildə ilk növbədə həyati bacarıqların formalaşdırılmasını təmin etməyə istiqamətləndirilməli və bu missiyanı yerinə yetirməlidir.

Təhsilalanlar aldıqları məlumatları dərk etməyi, onun mahiyyətini anlamağı, onları təhlil etməyi, nəticələr çıxarmağı, eyni zamanda aldıqları bilikləri bacarığa çevirməyi, reallıqda tətbiq etməyi bacarmalıdırlar. Nəyin necə və niyə belə olduğunu anlamalıdırlar. Təhlil etmək, analitik düşüncəyə malik olmaq, düzgün qiymətləndirə bilmək kimi bacarıqlara yiyələnməlidirlər. Təbii ki, bu prosesdə istiqamətverici məhz müəllimlər və məktəbdir.

Hazırda istər orta, istərsə də ali məktəblərə öz üzərində müntəzəm işləyən, fəaliyyətinə həmişə yeniliklər qatan, dövrün artan tələblərinə özünün qabiliyyəti və bacarığı ilə yüksək səviyyədə cavab verən yüzlərlə yenilikçi, novator və yaradıcı müəllimlər vardır. Lakin böyük bir müəllim ordusu içərisində nəinki yaradıcı, öz üzərində işləməyən, yeniliklərdən xəbərdar olmayan müəllimlə də çoxdur. Fənninin dövlət standartlarının nələri tələb etdiyini, təlim nəticələrinin nə olduğunu, məzmun xətti nədir, fənn kurikulumu tədris zamanı hansı prinsiplərin gözlənilməsini tələb edir və s. kimi məsələləri bilməyən və öyrənməyə də

marağı olmayan müəllimlər də az deyildir. Təbii ki, bunlar da öz nəticəsini tədrisdə, təhsilalanların aldıqları bilik, bacarıq və vərdişlərin səviyyəsində göstərir.

Bu günkü gənclərimiz çox şeyləri bilir və bacarırlar. Həm də daha çox şeyləri də bilmək, öyrənmək istəyirlər. Bunlar isə müəllimlərimizdən özlərini inkişaf etdirməyə, öz üzərlərində işləməklə təhsilalanların tələb və tələbatlarını təmin etmək üçün yeniliklər etməyə, dövrün tələblərinə cavab verməyə yeni-yeni impulslar verir. Bizcə bunları iki tərəfdən qiymətləndirmək olar:

*Birincisi,* müəllimlərin özlərini daim təkmilləşdirməyə, fəaliyyətlərini təkcə gündəlik dərslərinə hazır gəlməklə məhdudlaşdırmamaqla əsl usta müəllim səviyyəsinə qalxmaq üçün yeniliklər etməyə, fəaliyyətinə yaradıcılıqla yanaşmağa maraq göstərməsi.

*İkincisi,* təhsilalanları inkişaf etdirmək, onları gələcək həyata normal hazırlamaq, onlarda həyati bilik, bacarıq və vərdişlər formalaşdırmaq üçün özlərini təkmilləşdirməyə, yeni pedaqoji texnologiyaları mənimsəməyə maraqlı olmaları.

Bunların hər ikisi müəllimlərdən özlərini təkmilləşdirmək, inkişaf etdirmək istiqamətində bir sıra işlərinin reallaşdırılmasını zəruri edir. Bunları əsasən aşağıdakı kimi xarakterizə etmək olar:

1. Müəllimin İKT bacarıqlarına malik olması, müxtəlif proqramla işləməyi, pedaqoji prosesdə İKT-dən və internet resurslarından istifadə etməyi bacarması. Qeyd edək ki, bu sahədə son illərdə, xüsusən pandemiya dövründə xeyli təcrübə toplanmışdır. Müəllimlərimizin əksəriyyəti dərslərində bu imkanlardan müntəzəm olaraq istifadə edirlər. Lakin müşahidələr göstərir ki, hələ də bu imkanlardan yararlanmayan, dərslərində yeni təlim texnologiyalarından istifadə etməyən müəllimlərimiz də az deyildir.

2. Müəllimlərin xarici dil bacarıqlarına malik olması. Bu önəmli məsələ müəllimlərin qabaqcıl dünya ölkələrinin təcrübəsinin öyrənilməsi və onlardan yaradıcı şəkildə yararlana bilməsi üçün çox vacib amillərdəndir. Bu sahədə respublikamızda xeyli müsbət irəliləyişlərin olduğu nəzərə çarpır. Magistrantlardan və doktorantlardan xarici dil bacarıqlarının tələb edilməsi zənnimizcə bu prosesin daha da güclənməsinə xeyli təkan verə biləcəkdir.

3. Təhsilalanlarda öyrənməyə həvəs və maraq oyatmağı, onları motivasiya etməyi bacarması. Bu məsələ müasir dövrdə xüsusilə daha önəmli diqqət tələb edir. Təcrübə göstərir ki, şagirdlərin təlim marağının formalaşmasında müəllimlərin rolu böyükdür. Müəllimlər bu işə maraq göstərdikdə onların apardıqları işlər heç də səmərəsiz qalmır. Başlıca məsələ bunu necə, hansı yollarla və formada təşkil etməkdir ki, bu da müəllimin pedaqoji ustalıq məharətindən çox asılıdır. Görkəmli Ukrayna pedaqoqu V.A. Suxomlinski bu münasibətlə yazırdı: "Biliklərə həvəs qığılcımı dərsdə oyadılmalıdır: yeniyetmənin qəlbində bu qığılcımla alov yandırmaq müəllimin mədəniyyətindən asılıdır". Təəssüflər ki, heç də bütün müəllimlər buna nail ola bilmirlər.

Bu problem müəllimləri belə bir sual qarşısında düşünməyi məcbur edir: "Dərsi necə qurmaq, necə aparmaq ki, onun vasitəsilə şagirdlərin oxumaq, öyrənmək, axtarış aparmaq marağını və həvəsini artırmaq mümkün olsun?" Fikrimizcə, bunun üçün pedaqoji prosesin təşkili və gedişində aşağıdakı bir sıra şərtlərin gözlənilməsi yüksək nəticələrin əldə olunmasına öz müsbət təsirini göstərə bilər:

1) bütün dərs boyu şagirdlərdə yüksək əhval-ruhiyyənin olmasına çalışmaq, öyrənmə prosesində sinifdə psixoloji gərginliyin azaldılmasına nail olmaq;

2) dərsin yüksək emosional fonda təşkilinə və aparılmasına nail olmaq;

3) təhsilalanların hər birinə yüksək etimad göstərmək və onlara inam nümayiş etdirmək;

4) əməkdaşlığı bütün dərs boyu gözləmək, şagirdlərin hamısının pedaqoji prosesin iştirakçısı olmasına nail olmaq;

5) pedaqoji prosesdə təhsilalanların fərdi xüsusiyyətlərini nəzərə almaqla diferensiallığa, hər bir təhsilalanın maraq və tələbatlarının ödənilməsinə nail olmaq;

6) dərsdə yeni pedaqoji texnologiyalardan və müasir təlim metodlarından istifadəyə geniş yer vermək;

7) müəllim tərəfindən verilən tələblərdə təhsilalanların inkişaf etdirilməsi hədəfini gözləmək və s.

Nəticə olaraq demək olar ki, müəllimin peşə səriştəliliyinin yüksək olması və onların daim inkişaf etdirilməsi ikitərəfli proses kimi pedaqoji prosesin nəticəyönümlülüyünü şərtləndirən əsas amillərdəndir. Onun səmərəsi özünü bir tərəfdən müəllimi usta-peşəkar mütəxəssis səviyyəsinə qaldırmaq, özünüinkişaf etdirməkdə göstərirsə, ikinci tərəfdən təhsilalanların inkişafında, onların həyata və cəmiyyətə daha mükəmməl hazırlanmalarında büruzə verir. Yəni, peşə səriştəliliyi müəllimin özü, onun şəxsiyyəti və peşə hazırlığı ilə bağlı olsa da, nəticəsi özünü təhsilalanların inkişafında, həyat hazırlıq səviyyələrində göstərir. Başqa sözlə desək, müəllimin öz üzərində inadla işləməsi, yeni-yeni səriştələrə yiyələnməsi, özünühazırlıq və özünü inkişafetdirməsi onu peşəsinin, müəllimlik sənətinin fövqünə qaldırmaqla yanaşı, təhsil və tərbiyə verdiyi gənc nəsli həyata daha dolğun, daha hərtərəfli hazırlamaqla nəticələnir ki, bu da onu bir usta müəllim, peşəkar mütəxəssis kimi tanıtdırır, sevdirir.

**Problemin aktuallığı.** Pedaqoji prosesin səmərəliliyini şərtləndirən amillərdən biri kimi müəllim səriştəliliyinin formalaşdırılması müasir dövrdə ən mühüm pedaqoji problemlərdən biridir. Hazırda məktəblərimizin, təhsilin və təhsilalanların qarşısında duran mühüm vəzifələrin həyata keçirilməsi vəzifəsi müəllimlərin pedaqoji səriştəliliyinin yüksəldilməsini birmənalı olaraq tələb edir.

**Problemin yeniliyi.** Məqalədə müəllimin pedaqoji səriştəliliyinin yüksəldilməsi probleminə bir neçə aspektdən yanaşılmış, onun yüksəldilməsinin vacibliyi bir sıra parametrlərlə əsaslandırılmışdır.

**Problemin praktik əhəmiyyəti.** Məqalədə öz əksini tapan bir sıra müddəalar, müəllim səriştəliliyinin əsas meyarları, onun bir sıra komponentləri, səriştəliliyin hədəfləri haqqında olan nəzəri fikirlər və şagirdlərin həyati bacarıqlara yiyələnmələrində müəllim səriştəliliyinin yeri və rolu haqqında verilən şərhlər praktik müəllimlər və tədqiqatçılar üçün həm müəyyən mənbə, həmdə yeni-yeni tədqiqatların aparılması üçün faydalı olar.

**Ədəbiyyat:**

1. Təhsil haqqında Azərbaycan Respublikasının Qanunu. −Bakı: Çap Evi, −2012, −64 s.
2. İlyasov, M.İ. Müəllim peşəkarlığı və pedaqoji səriştəliliyin müasir problemləri. / M.İ. İlyasov. −Bakı: "Elm və Təhsil", −2018. – 208 s.
3. Адольф, В.Я. Профессиональная компетентность современного учителя: монография. / В.Я. Адольф. – Красноярский гос. ун-т. −Красноярск, 1998. – 310 с.

4. Международное бюро образования: http://www.ibe.unesco.
5. org/en/geqaf/annexes/technical-notes/examples-countries’-definitionskeycore-competencies.
6. Поиск и измерение навыков 21 века: https://intalent.pro/article/ poisk-i-izmerenie-navykov-21-veka.html.

**E-mail:** müseyibilyas@gmail.com
**Redaksiyaya daxil olub:** 10.05.2024

***Həsən Bayram oğlu Bayramov***
*pedaqogika üzrə elmlər doktoru*
*Bakı Qızlar Universitetinin Pedaqogika kafedrasının müdiri*
***Orcid**: 0000-0003-2415-0284*

## XANLAR PEDAQOJİ MƏKTƏBİNİN FƏALİYYƏTİNİN BƏZİ TARİXİ ASPEKTLƏRİ HAQQINDA

***Гасан Байрам оглы Байрамов***
*доктор педагогических наук*
*заведующий кафедрой педагогики Бакинского Университета для Девушек*

## О НЕКОТОРЫХ ИСТОРИЧЕСКИХ АСПЕКТАХ ДЕЯТЕЛЬНОСТИ ХАНЛАРСКОЙ ПЕДАГОГИЧЕСКОЙ ШКОЛЫ

***Hasan Bayram Bayramov***
*doctor of pedagogical sciences*
*head of the department of Pedagogy at Baku University for Girls*

## ABOUT SOME HISTORICAL ASPECTS OF THE ACTIVITIES OF KHANLAR PEDAGOGICAL SCHOOL

**Xülasə.** Məqalədə Qərbi azərbaycanlıların Ermənistandan deportasiya edilməsinin müəllim və tələbələrin taleyində oynadığı həlledici rolun tarixi, sosial, pedaqoji və mənəvi meylləri araşdırılır. Deportasiyadan əziyyət çəkən İrəvandakı Azərbaycan Dövlət Pedaqoji Texnologiya Məktəbinin tarixi əhəmiyyəti, o cümlədən 1948-1971-ci illərdə deportasiya dövrünə aid kadrların çalışdığı Xanlar Pedaqoji Məktəbinin tədris-pedaqoji fəaliyyəti xüsusi vurğulanır.
***Açar sözlər:*** *Deportasiya, Xanlar rayonu, milli maarifçilik, Qərbi Azərbaycan*

**Резюме.** В статье рассматриваются исторические, социальные, педагогические и нравственные тенденции решающей роли, которую сыграла депортация западных азербайджанцев из Армении в судьбах учителей и учеников. Особо освещено историческое значение пострадавшего от депортации Азербайджанского государственного педагогического технологического училища в Иреване, а также учебно-педагогическая деятельность Ханларского педагогического училища, укомплектованного выходцами периода депортации в 1948-1971 годах.
***Ключевые слова:*** *депортация, Ханларский район, национальное образование, Западный Азербайджан.*

**Summary.** The article deals with the historical, social, pedagogical and moral tendencies of the decisive role that the deportation of western Azerbaijanis from Armenia played in the fate of teachers and pupils. Particularly the historical

importance of Azerbaijan State Pedagogical Technological School in Irevan that sufferad from the deportation, as well as the training – pedagogical activity of the Khanlar Pedagogical School staffed by the immigrants of the deportation period during 1948-1971 is illucidated.
***Key words:*** *deportation, Khanlar region, national education, Western Azerbaijan.*

***Qısa tarixi rakurs***

Sovet dövrü Ermənistanda Nəriman Nərimanov adına Azərbaycan Türk Pedaqoji Texnikumu (*kolleci – H.B*) çox çətin şəraitdə, ermənilərin milli azlığa çevirdikləri azərbaycanlıların tədris-pedaqoji mərkəzi olaraq hər cür təxribatları şəraitində öz varlığını qoruyub saxlamışdır. "İrəvan Azərbaycan Pedaqoji Məktəbi fəaliyyət göstərdiyi 1924-1949-cu illər ərzində təkcə tədris müəssisəsi kimi deyil, eyni zamanda Qərbi Azərbaycanda ədəbiyyatımızın, mədəniyyətimizin, incəsənətimizin inkişafında, formalaşmasında və qorunmasında çox böyük rol oynamışdır" (4, s.58).

Texnikum bununla kifayətlənməmiş, həm Çar Rusiyası dövrü İrəvan ərazisində fəaliyyət göstərmiş qəza məktəbləri, gimnaziya, progimnaziya və Müəllimlər seminariyasında çalışmış ərəb, fars, türk, rus dillərində sərbəst danışan ziyalıların tədris-pedaqoji irsini davam etdirmiş, həm də Sovet hakimiyyətinin ilk illərində azərbaycanlıların Ermənistan adlı ərazidə milli varlığını, xüsusilə mədəni-maarif işini qorumaq kimi müqəddəs missiyanın da daşıyıcıları olmuşlar. Çünki "Qərbi Azərbaycan, yəni indiki Ermənistan ərazisi bütöv Azərbaycan tarixinə görə ən qədim, coğrafi-siyasi mövqeyinə görə ən strateji, təbiətinə görə ən zəngin bölgələrindən biri olaraq həmişə milli kimliyimizin mühüm faktorlarından olmuşdur" (5, s. 228).

Amma Sovet imperiyasındakı siyasi-tarixi hadisələr xalqımızı bəzi sürprizlərlə üzbəüz qoymuşdur. Bunlardan biri "Ermənistan SSR-dən kolxozçuların və digər azərbaycanlı əhalinin Azərbaycan SSR-in Kür-Araz ovalığına köçürülməsi haqqında" SSRİ Nazirlər Sovetinin sədri İosif Stalin tərəfindən imzalanmış 1947-ci il 23 dekabr tarixli 4083 saylı və bu qərara yardımçı olan "Kolxozçuların və digər azərbaycanlı əhalinin Ermənistan SSR-dən Azərbaycan SSR-in Kür-Araz ovalığına köçürülməsi tədbirinin maliyyələşdirilməsi" haqqında 1948-ci il 10 mart tarixli 754 saylı qərarları xalqımıza qarşı Çar Rusiyası dövrü ədalətsiz qərarların, yeni tarixi dövrdə, yeni siyasi quruluşda davam etdirildiyini göstərirdi.

SSRİ Nazirlər Sovetinin məlum qərarı ilə Ermənistan SSR-də yaşayan 100.000 nəfər əhalinin Azərbaycan SSR-in Kür-Araz ovalığına "könüllülük prinsipləri əsasında" adı altında təşkil edilən köçü əslində deportasiya idi. Məsələn, Ermənistan SSR-dən köçürülən əhalinin köçürülməsi zamanı "kənd təsərrüfatı köçürülüşü üzrə güzəştlər haqqında SSRİ Mərkəzi İcraiyyə Komitəsi və SSRİ Xalq Komissarları Sovetinin 1937-ci il 17 noyabr tarixli qərarı Kür-Araz ovalığına köçürülən azərbaycanlılara şamil edilməsi nəzərdə tutulurdu. Maraqlıdır ki, bu qərar məhz 1937-ci ildə Sibir, Qazaxıstan və Uzaq Şərq sürgün olunanlara aid idi. Bu, bir daha sübut edir ki, həmin tədbir əslində köçürülmə deyil, sözün əsl mənasında azərbaycanlıların öz ata-baba yurd-yuvalarından deportasiyası idi (1).

Ermənistanda Nəriman Nərimanov adına Azərbaycan Türk Pedaqoji Texnikumu çox çətin şəraitdə, ermənilərin milli azlığa

çevirdikləri azərbaycanlıların tədris-pedaqoji mərkəzi olaraq hər cür təxribatları şəraitində öz varlığını qoruyub saxlamışdır. Texnikum bununla kifayətlənməmiş, həm Çar Rusiyası dövrü İrəvan ərazisində fəaliyyət göstərmiş qəza məktəbləri, gimnaziya, progimnaziya və Müəllimlər seminariyasında çalışmış ərəb, fars, türk, rus dillərində sərbəst danışan ziyalıların tədris pedaqoji irsini davam etdirmiş, həm də Sovet hakimiyyətinin ilk illərində azərbaycanlıların Ermənistan adlı ərazidə milli varlığını, xüsusilə mədəni-maarif işini qorumaq kimi müqəddəs missiyanın da daşıyıcıları olmuşlar. Amma Sovet imperiyasındakı siyasi-tarixi hadisələr xalqımızı bəzi sürprizlərlə üzbəüz qoymuşdur. Bunlardan biri "Ermənistan SSR-dən kolxozçuların və digər azərbaycanlı əhalinin Azərbaycan SSR-in Kür-Araz ovalığına köçürülməsi haqqında" SSRİ Nazirlər Sovetinin sədri İosif Stalin tərəfindən imzalanmış 1947-ci il 23 dekabr tarixli 4083 saylı və bu qərara yardımçı olan 1948-ci il 10 mart tarixli 754 saylı qərarları xalqımıza qarşı Çar Rusiyası dövrü ədalətsiz qərarların, yeni tarixi dövrdə, yeni siyasi quruluşda davam etdirildiyini göstərirdi. Biz az da geniş tarixi və geosiyasi anlamda yanaşsaq, Axıska türklərinin Azərbaycana kütləvi köçü ilə ölkənin yüklənməsi, bu zaman "gəlmə-yerli" ziddiyyətlərinə rəvac verməklə demoqrafik sosial gərginliyi artırmaqla həm də bu ağır yükün altına itələnən respublikanın dirçəliş prosesini geriyə atmaq, onun sənayeləşmə perspektivlərini gecikdirmək idi.

Bundan başqa bu gün Ermənistan adlandırılan respublikanın dağ və dağətəyi rayonlarının səfalı torpaqlarında "əsrlərlə yaşamış azərbaycanlı əhali Kür-Araz ovalığının Şoran torpaqlarına, heç bir infrastrukturu olmayan və buradakı əhalini ancaq sığındıran elatların qışlaqlarına köçürdülər.

Nəticədə bir tərəfdən "türksüz Ermənistan xülyaları reallaşır, digər tərəfdən isə həm Kür-Araz ovalığına köçürülən məcburi köçkünlər bu yerlərin təbii şəraitinə davam gətirə bilməyib, məhv olur, həm də köçürülən rayonların da hazırlıqsız olmasından, yəni ikinci dünya müharibəsinin ağır həyat şəraitindən əziyyət çəkən, heç bir şəraiti olmayan yerli əhalinin evlərinə köçkünlərin də məskunlaşdırılması bəzən "yerli-gəlmə" ziddiyyətlərinə rəvac verərək sosial gərginliyi artırırdı. Beləliklə, ermənilər hər cür tarixi şəraitdən istifadə edərək bu prosesdən yararlanırdılar. Ermənilərin türklərin, çeçenlərin və b. qafqaz müsəlman-türk topluluqlarının Orta Asiyaya köçürülməsini təşviqetmə cəhdləri bu ərazilərdə erməni məskənlərinin salınması ilə planlı və sistemli siyasətin yeni təzahür forması idi.

Sonuncu kütləvi köçürmə faktına toxunan ümummilli lider Heydər Əliyev Respublika günü münasibətilə söylədiyi nitqində demişdir: "Azərbaycan xalqına bu dövrdə vurulan ən böyük zərbələrdən biri də 1947-1948-ci illərdə Azərbaycan xalqına qarşı Sovet hakimiyyəti tərəfindən edilmiş ən böyük ədalətsizlikdir. Təəssüflər olsun ki, tarixçilərimiz və hamımız nədənsə bu hadisəyə o vaxtlar da, indi də, xüsusilə dövlət müstəqilliyimizi əldə edəndən sonra da doğru-düzgün qiymət verə bilməmişik". Ulu öndər 1947-1948-ci illərdəki ən böyük ədalətsizlik deyəndə İ. Stalinin yuxarıdakı qərarlarını nəzərdə tuturdu.

İlk baxışda Azərbaycanın aqrar sənaye potensialını gücləndirmək, çox böyük sosial-iqtisadi məkan formalaşdırmaq baxımından gözəgəlimli görünən qərar burada yaşayan və müharibənin ağır şəraitində daha da müflisləşən əhalinin üstünə yeni

bir köç dalğasının yüklənməsilə, Ermənistan ərazilərində türk çoxluğunu sürətlə aradan qaldırır, həm də antiazərbaycan əhval-ruhiyyəsini Dağlıq Qarabağda yeni müstəviyə keçirməyin hazırlığını aparırdılar. Eləcə də Bakı, Sumqayıt, Gəncə kimi iri yaşayış yerlərinə Azərbaycanın kənd rayonlarındakı ermənilərin kütləvi axınını təşkil edərək şəhərlərin milli tərkibinin güclənməsinin qarşısını alırdılar.

***Deportasiyanın doğurduğu acı həqiqətlər***

23 dekabr 1947-ci il tarixli bədnam qərarla 1948-ci ildə 10000, 1949-cu ildə 40000, 1950-ci ildə isə 50000 nəfər olmaqla 100000 azərbaycanlı kolxozçuların "könüllülük prinsipi" əsasında Azərbaycanın Kür-Araz ovalığına köçürülməsi ilə bağlı kompaniyanın təcili həyata keçirilməsinin əsl mahiyyəti həmin qərarın sonuncu 11-ci maddəsində açıqlanır. Orada yazılırdı ki, "Ermənistan SSR Nazirlər Sovetinə icazə verilsin ki, azırbaycanlı əhalinin Azərbaycanın Kür-Araz ovalığına köçürülməsi ilə əlaqədar onların boşaltdıqları tikililəri və yaşayış evlərini xaricdən Ermənistana gələn erməniləri yerləşdirmək üçün istifadə etsinlər".(1. s83) Heç əslində gələn ermənilər, yəni axbarlar dağ kəndlərinə göndərilmədi. Onlar Yerevan, Leninakan, Kirovakan, Qafan, Dilican sahələrində yerləşdirildi, onlar üçün Sevan, Razdan, Lusavan, Çarensavan adlı yeni sənayeləşmiş şəhərlər yaradıldı. Bu onu göstərirdi ki, bizləri oradan köçürməkdə məqsəd onları yerləşdirmək yox, Ermənistandan azərbaycanlıları təmizləmək idi.

Hələ 1948-ci ilin iyulun 5-də respublika Nazirlər Sovetinin sədri T. Quliyevin SSRİ Nazirlər Soveti sədrinin müavini V. Molotova məktubunda həmin ildə Kür-Araz ovalığına köçürülməsi nəzərdə tutulmuş azərbaycanlı əhalini yerləşdirmək üçün yaşayış binalarının olmamasını nəzərə alaraq onların bir hissəsini respublikanın başqa rayonlarında yerləşdirməyi xahiş edərək, həm də belə bir təkliflə çıxış edirlər ki, gələn köçkünlər Ermənistanın əsasən dağlıq və dağətəyi rayonlarından olduqlarına görə onların Kür-Araz ovalığında isti iqlim şəraitinə çətin uyğunlaşacaqlarını Moskvadan xahiş etsələr də heç bir cavab alınmamışdır. Nəticədə bu səbəbdən köçkün əhalinin xeyli hissəsi bu şəraitə dözməyərək məhv olur, ən yaxşı halda kəndlilər, qohum-əqrəbalar kompakt şəkildə yox, respublikanın 28 rayonuna səpələnir. Demoqrafik vəziyyət, adət-ənənələr, etnik və dini həssaslıq əsas götürülmür, nə olur olsun, harada olur olsun yerləşdirmək kompaniyası başlayır. Səbəbi isə Moskvanın Azərbaycana, onun rəhbərliyinə təzyiqi idi. Guya ki, xaricdən gələn ermənilər sərhəddə çətin vəziyyətdə gözləyirlər. Digər bir məqam planda nəzərdə tutulan köçürmədən başqa, qohum-əqrəbaları ilə eyni yerə köçmək istəyən insanlara, eləcə də özbaşına köçənlərə Ermənistanda göz yumulur, əhali kütləvi köçə təşviq edilir, çətinliklər ucbatındam Azərbaycandan qonşu Bakıya qayıdanlarla bağlı Yerevandan Moskvaya rəsmi teleqramlar vurulur, Azərbaycanı qrafikə əməl etməməkdə təqsirləndirirlər. Məsələn, bir fakta diqqət yetirək; 1950-ci ilin noyabrında Ağcabədi rayonuna köçürülmüş Əmir İsmayılov adlı şəxs Ermənistana doğma Zəngibasar rayonunun Rəhimabad kəndinə qayıdışı ilə bağlı İ. Stalinə məktublar yazaraq bu xahişlərinin nəzərə alınmasını rica edirlər. Ermənistandan gələn etiraza cavab olaraq Moskvadan Baş Köçürmə İdarəsinin inspektoru V. Nesterovic təcili Əmir İsmayılovla Ermənistanda görüşür. Nəticədə həmin şəxsi "qulağından

tutub zurna-balabanın müşayiəti altında yenidən Ağcabədiyə qaytarırlar" (1, s. 20).

Məsələn, Ermənistanın Basarkeçər rayonunun Zod kəndində Bala Hacıyev eyni kənddən 100 ailənin Xanlar rayonuna könüllü köçürülmələrini xahiş etmişdir ki, səpələnib itbata düşməsinlər. Onların xahişini Azərbaycan rəhbərliyi nəzərə almaları faktını Ermənistanda çox böyük razılıqla qarşılamışlar. Təki getsinlər!

Ümumiyyətlə, SSRİ Nazirlər Sovetinin "Kolxozçuların və digər azərbaycanlı əhalinin Ermənistan SSR-dən Azərbaycan SSR-in Kür-Araz ovalığına köçürülməsi haqqında 23 dekabr 1947-ci il tarixli 4083 saylı və 10 mart 1948-ci il tarixli 754 saylı qərarlarının həyata keçirilməsi üçün Azərbaycan hökuməti tərəfindən 1948-1954-cü illərdə 322 qərar, sərəncam, hesabat xarakterli əmrlər verilmişdir".

"Proletar beynəlmiləlçiliyi və qardaşlığı" şüarları altında köçürülən kolxozçu və digər azərbaycanlı əhali arasında təcrübəli kənd təsərrüfatı mütəxəssisləri, sənayeləşmiş sahələrdə çalışan texnoloqlar, həkimlər, müəllimlər də var idi. Onların içərisində müəllimlərin və məktəblilərin qarşılaşdıqları çətinliklər heç də o birilərindən az deyildir.

İlk öncə köçürmənin bu və ya digər məsələləri ilə bağlı qəbul edilmiş sənədlərdə ilk dəfə 6 may 1948-ci tarixli 651 saylı "Kolxozçuların və digər azərbaycanlı əhalinin Ermənistan SSR-dən Azərbaycan SSR-in Kür-Araz ovalığına köçürülməsi tədbirinin maliyyələşdirilməsi haqqında 6 may 1948-ci il tarixli 651 saylı qərarında bəhs edilir". Belə ki, ayrılmış vəsaitin 42000 manatı maarif, 70000 manatı isə mədəni-maarif müəssisələrinin köçürülməsi üçün nəzərdə tutulurdu. Köç zamanı bu sahənin sistemli köçünün baş vermədiyi görünür. Bu sahədə işlərin sistemli həyata keçirilməsi üçün "Köçürülmə işi ilə əlaqədar Azərbaycan SSR-in Ermənistan SSR-də ki nümayəndəsi haqqında "Azərbaycan SSR Nazirlər Sovetinin qərarı ilə Allahverdiyev N.C. respublika Nazirlər Kabinetində köçkünlərlə işi üzrə müvəkkil, M. Məmmədov isə Ermənistan SSR-də Azərbaycanın səlahiyyətli müvəkkili təyin edilir.

Köçürülmə məktəb müəllimlərini də əhatə etmişdir. Belə ki, 1948-ci il iyulun 1-də Azərbaycan SSR Nazirlər Sovetinin qəbul etdiyi İrəvan "Pedaqoji İnstitutun Azərbaycan bölməsinin və İrəvan Azərbaycan Pedaqoji Texnikumunun Ermənistan SSR-ə köçürülməsi haqqında" qərarı ilə İrəvan Pedaqoji İnstitutunun azərbaycanlılar oxuyan dil-ədəbiyyat, coğrafiya və fizika-riyaziyyat fakültələrinin 149 tələbəsi V. Lenin adına Azərbaycan Dövlət Pedaqoji İnstitutunun müvafiq fakültələrinə, həmin fakültələrin qiyabi şöbələrinin 257 tələbəsi isə o vaxtlar ayrıca fəaliyyət göstərən Azərbaycan qiyabi Dövlət Pedaqoji İnstitutunun dil-ədəbiyyat, coğrafiya və fizika-riyaziyyat fakültələrinə yerləşdirilmişdir.

Həmin qərarın 1-ci maddəsinin 5-ci bəndi ilə institutun tədris-pedaqoji heyətini öz istəklərinə uyğun respublikanın ali və orta ixtisas təhsilli müəssisələrində yerləşdirilmə nəzərdə tutulmuşdur.

Qərarın 9-cu bəndi ilə Yerevan Azərbaycan Pedaqoji məktəbi tam tərkibdə, yəni əyani 232, qiyabi şöbədə oxuyan 102 tələbə Gəncə yaxınlığındakı Yelendorf qəsəbəsinə sonrakı adı ilə desək, Xanlar uşaq evinin binasına köçürülmüşdür. Yeri gəlmişkən, hal-hazırda həmin binada Göygöl peşə-texniki məktəbi yerləşir. Həmin qərar ilə Xanlar uşaq evi isə

Çaykənddəki Veterinariya Texnikumunun binasına köçürülmüşdür.

Həmin qərarın 2-ci maddəsi ilə Xanlar rayon sovetinin sədri Apresyana tapşırılır ki, Pedaqoji məktəbin 220 şagirdinin yataqxana və müəllim kollektivinin münasib yaşayış yerləri ilə təmin edilməsində Azərbaycan SSR-in Maarif nazirliyinə şərait yaratsın.

Həmin qərarın 3-cü bəndi Yerevan Azərbaycan Pedaqoji İnstitutunun azərbaycanlılar oxuyan fakültələrinin V. Lenin adına Azərbaycan Pedaqoji İnstitutuna qatılması ilə bağlı onlara keçmiş Tətbiqi Təbabət İnstitutunun binasının ayrılması respublika Elmlər Akademiyasına tapşırılır.

Qərarın 5,6-cı maddələrinin müvafiq bəndlərində tədris vasitələri və avadanlıqlarının Yerevandan köçürülməsinin təmin edilməsi, Azərbaycandakı Pedaqoji məktəblərinin sayının Xanlar Pedaqoji məktəbi adı ilə 8-ə çatdırılması qərarlaşdırılır.

Azərbaycanlıların deportasiyası ilə bağlı tənzimləmə prosesindən irəli gələn bir sıra məsələlərdə də yenə həmin tədris ocaqlarının adı çəkilir.

Məsələn, Azərbaycan SSR Nazirlər Sovetinin "Ermənistan SSR-dən köçürülmüş azərbaycanlıların Azərbaycan SSR-in Xanlar rayonunda yerləşdirilməsi haqqında" 1490 saylı qərarı ilə Xanlara köçürülmüş Pedaqoji Məktəb artıq sənədlərdə Xanlar Pedaqoji Məktəbi adlandı (11, s.704).

Qərarın 6-cı bəndi İrəvan Pedaqoji İnstitutunun əyani və qiyabi şöbələrdəki azərbaycanlı tələbələrinin tam tərkibdə əyani və qiyabi Azərbaycan Pedaqoji İnstitutlarına köçürülməsinin təmin edilməsi məqsədi ilə müxtəlif nazirlik və təşkilatlara göstərişlər verilmişdir.

16 dekabr 1948-ci il 1490 saylı "Ermənistan SSR-dən köçürülmüş azərbaycanlıların Azərbaycan SSR-in Xanlar rayonunda yerləşdirilməsi haqqında" respublika Nazirlər Sovetinin qərarında məskunlaşmadan keçən müddətdə Xanlar Pedaqoji Məktəbinin hələ də yaxşı şəraiti olan bina ilə, eləcə də yanacaqla, yataq dəstləri ilə təmin edilməməsi, eləcə də səhər, günorta və axşam yeməklərinin bahalığı ucbatından tələbələrin istifadə edə bilməmələri ürək ağrısı ilə qeyd edilərək, rayon rəhbərliyi qarşısında konkret həll müddəti qoyulmuşdur.

Bundan başqa, məktəbə təsərrüfat problemlərini həll etmək üçün üç ton yük tutumu olan "Zil" markalı avtomaşın ayrılması, nəhayət neftdən gələn gəlir hesabına tələbələrə həyat şəraitini yaxşılaşdırmaq məqsədi ilə 500 rus rublu məbləğində birdəfəlik təqaüd ayrılması, neftdən gələn gəlir hesabına məktəb hesabına məktəb üçün həyətyanı və təsərrüfat sahəsinin müəyyən edilməsi də qərarlaşdırılmışdır. Nəhayət, məktəbin tədris pedaqoji heyəti üçün yaşayış yerləri, həyətyanı sahələrin ayrılması, onların tikinti materialları ilə təmin edilməsi, eləcə də Azsovxoztrestin istifadəsində olmuş və hal-hazırda SSRİ Daxili İşlər Nazirliyinin 223 saylı istirahət düşərgəsinin hospital binasının məktəbə yataqxana olaraq ayrılmasıdır.

Qəbul edilmiş qərarlarda müəllimlərin yerləşdirilməsi məsələlərinə toxunulmuş bu sahədə o vaxtkı bədnam Dağlıq Qarabağ Vilayətinə köçürülmüş azərbaycanlı kolxozçuların yerləşdirilməsində açıq-aşkar süründürməçilik və etinasızlığa görə respublika Nazirlər Soveti vilayətin inzibati-partiya rəhbərliyinin cəzalandırılması haqqında 15 yanvar 1949-cu il tarixli 98 saylı xüsusi qərar qəbul edilmişdir. Məsələn, Martuni rayonunda 355 nəfər, o cümlədən 86 təsərrüfat, yəni ailə köçürülsə də uşaqların dərsə davamiyyəti təmin

edilməmiş, Güneyçartar kənd məktəbinin azərbaycan dili müəlliməsi heç bir səbəb olmadan rayon maarif şöbəsinin müdiri Ulubabyan tərəfindən azad edilmişdir. Vilayətdə xüsusilə Azərbaycan dilinin tədrisinə qarşı açıq təxribatçı siyasət aparılmış, ya dərs saatları gec müəyyən edilmiş, ya müəllimlərin təyinatı yubadılmış, ya da müəllimlərə kommunal-məişət şəraiti yaradılmamışdır. Vilayətin erməni rəhbərliyi ümumiyyətlə, Qərbi Azərbaycanlıların orada məskunlaşmasına qarşı açıq təxribatla məşğul olmuşlar. Azərbaycanlı müəllimlərə qarşı təxribat isə pik həddə çatmışdır. Vilayət maarif şöbəsinin 18 dekabr 1948-ci il 255 saylı qərarı ilə Gişi orta məktəbinin köçkün rus dili müəllimi 33 yaşlı Müseyib Mahmudov əsassız olaraq işdən çıxarılmışdır. Səbəb isə həmin Hunusinak kəndində azərbaycanlı şagirdlərə şərait yaradılmaması, onların Gişi kəndinə dərsə davam etmələrinə müəllimin etirazı olmuşdur. Digər müəllim Həsənova Klaranın şikayət məktubunun məzmunu ondan ibarət idi ki, məktəbi qızdırmağa yanacaq verilsə də, köçkün müəllimlərə bəhanələrlə yanacaq ayırmırlar ki, məktəbdən uzaqlaşsınlar, şagirdlər oxumasın, valideynlər Azərbaycanın qonşu rayonlarına getsinlər. Müəllimlərdən Babayeva Kübra 6 uşaqla, Abbasova Qəmər 8 uşaqla şəraitsizlikdən məktəblərdə tədrisdən uzaqlaşaraq Tərtər rayonuna köçmüşlər və yaxud Güneyçartar kəndinin briqadiri Lazar Autunyan köçkün müəllim Mariya Rüstəmovanın 2 inəyini, 3000 rubl pulunu, kostyumunu və saatını oğurlasa da ona cəza tətbiq edilməmiş, müəllimə məktəbi tərk etmişdir.

Bunlardan fərqli olaraq müəllimlərin məskunlaşmasına Azərbaycanın digər rayonlarında xüsusi diqqət yetirilirdi. Məsələn, respublika Nazirlər Kabinetinin 9 fevral 1949-cu il tarixli 103 saylı qərarı ilə Qasım İsmayılov indiki Goranboy rayonunda 21 müəllimin, 10 partiya-təsərrüfat rəhbərliyi təcrübəsi olan köçkün ailəsi yerləşdirilmiş, onlara müvafiq sosial şərait yaradılmışdır.

***İrəvan Pedaqoji Texnikumundan Xanlar Pedaqoji Məktəbinin simasında gedən şərəfli yol***

İrəvan Müəllimlər Seminariyasının mənəvi ardıcılları olaraq İrəvan Pedaqoji Texnikumundan Xanlar Pedaqoji Məktəbinə gedən tarixi yol onun fəaliyyətinin üçüncü dövrünü təşkil etdi. Müxtəlif illərdə aşağıdakı şəxslər burada direktor vəzifəsində çalışmışlar: 1948-ci ildən 1950-ci ilədək Cəfərov Əsgər Məmməd oğlu, 1950-ci ildən 1951-ci ilədək Cəfərov İsa Qara oğlu, 1951-1965-ci illərdə Tarix Şəmdin oğlu Şirinov, 1965-1968-ci illərdə Suqra Qoca qızı İsmayılova, 1968-1970-ci illərdə Məmmədov Adil İsmayıl oğlu, nəhayət, 1970-ci ilin aprelindən həmin ilin iyulunadək Qəzənfər Quliyev məktəb direktoru vəzifələrində çalışmışlar. Onlardan Muqbil Bağırov, Raziyyə İsmayılova, Sura Babayeva və Adil Məmmədov həm də uzun müddət tədris işləri üzrə direktor müavini vəzifəsində çalışmışlar.

Hər cür çətinliyə baxmayaraq fəaliyyətini davam etdirən Xanlar Pedaqoji məktəbində 1954-cü ildə I kursdan II kursa 28 nəfər, II kursdan III kursa 29 nəfər, III kursdan IV kursa 53 tələbənin keçməsi haqqında direktorun əmri vardır. Yenə orada göstərilir ki, 1956/57-ci tədris ilində məktəbin yataqxanasında 99 tələbə məskunlaşmışdır.

Məktəb Xanlarda fəaliyyətinə 9 müəllim, 47 tələbə ilə başlamışdır. Onlardan: Mehdi Kazımov – pedaqogi-

ka, psixologiya və rus dili; Muqbil Bağırov – ana dili və ədəbiyyat; Raziyə İsmayılova – tarix; Məmməd Həsənov – fizika-riyaziyyat; Surə Babayeva – coğrafiya və hüsnxət; Bəşir Məmmədov – bədən tərbiyəsi və idman; Məmməd Əsədov – sinifdənkənar bədii dərnəklər müdiri; Sadıq Heydərzadə - təbiətşünaslıq fənləri müəllimləri olaraq fəaliyyətə başlamışlar. Sonralar 11 nəfərlə tədrisə davam edən məktəbin 1970-1971-ci tədris ilində 50 nəfər bitirmişdir ki, bunlar sonuncu məzunlar olmuşlar. Onlar aşağıdakılardır:

Abbasova Həqiqət Cəmil qızı; Allahverdiyeva Şükür Həsən qızı; Bağırova Əsli Gəncə qızı; Vəliyeva Sevil Nəriman qızı; Əlinur Tahir Muxtar oğlu; Əliyev Firudin Həsən oğlu; Əliyeva Rəşidə Rəcəb qızı; Əskərova Lətifə Əsəd qızı; Əsədova Tamilə Məmmədəli qızı; Zeynalov Vahid Əbdüləli oğlu; Zamanova Məzmurə İbrahim qızı; İsmayılov Təhməz Heydər oğlu; İbrahimov Hidayət Əli oğlu; İmamverdiyeva Fatima Hüsüqulu qızı; Məmmədov Tofiq Rum oğlu; Məmmədova Səfurə Qoşqar qızı; Məmmədova Pəri Rüstəm qızı; Abbasova Zərifə Abdulla oğlu; Bağırlı Xalidə Cəlil qızı; Rzayeva Südabə Yunis qızı; Səmədova Yamən Əli qızı; Sadıqova Təzəgül Sərdar qızı; Tapdıqov Oruc Hüseyn oğlu; Hüseynov Əli Dəmir oğlu; Həşimova Həqiqət Abdulla qızı; Hacalıyeva Rəfiqə Alı qızı; Hüseynova Fəridə Hüseyn qızı; Hüseynova Moruq Fərman qızı; Cəfərova Şəhla Cəfər qızı; Cabbarlı Gülgəz Ağababa qızı; Şirinova Ərginaz Nəriman qızı; Şabanova Şəfiqə Ziya oğlu; Məmmədova Əntiqə Əjdər qızı; Əliyev Teymur Dəmir oğlu; İsmayılov İsfəndiyar Müslüm oğlu; Qasımova Elmira Kazım qızı; Qasımova Qənfilə Ziyad qızı; Rzayev Valeh Ağaməmməd oğlu; Nəbiyev Valeh Bəhlul oğlu; Aslanova Müharib Vəli qızı; Babayeva Səmayə Qara qızı; Bikəli Xədicə Allahqulu qızı; Əliyeva Madura Habil qızı; Nəbiyeva Rəna Seyid qızı; Qənbərova Gözəl Bilal qızı; Nəcəfova Gülnar Aslan qızı; Şahverdiyeva Mübarizə İsmayıl qızı; Cavadov Hafiz Teymur oğlu; Məmmədova Lətifə Abbasəli qızı; Vəliyeva Mehri Hümbət qızı (cəmi 50 nəfər) (16.)

1971-ci ildə buraxılış imtahanı zamanı erməni mühasibi Zinaida Arakelova və kassir Tamara Martirosovanın fitvaları ilə müəllimlər arasında gərginliyin yüksək həddə çatması səbəbindən məktəb fəaliyyətini Azərbaycan SSR Ali və Orta ixtisas Təhsil Nazirinin 21 iyun 1971-ci il 201 saylı əmri ilə dayandırmışdır.

Göründüyü kimi, İrəvan Müəllimlər Seminariyası, eləcə də onun mənəvi ardıcılları olan İrəvan Pedaqoji Texnikumu, nəhayət, Xanlar Pedaqoji məktəbi daim erməni təhdidləri ilə qarşılaşsa da şanlı bir yol keçmiş, xalqımızın ən çətin dövründə; -Çar və Sovet Rusiyası işğalı dövründə məqsədli şəkildə bizə qarşı düşmənə çevrilmiş ermənilərin fitnəkarlığını dəf edərək xalqımızı çox böyük güclərlə "Azərbaycan davası" adlı milli mübarizəyə hazırlamışlar. Onun məzunlarından Azərbaycan Dövlət Pedaqoji Universitetinin Pedaqogika kafedrasının professoru Abbas İsmayılovu, Azərbaycan Dövlət Pedaqoji Universitetinin kafedra müdirləri, tarix elmlər doktoru, professor Yusif Yusifovu, filologiya elmlər doktoru, professor Fərhad Fərhadovu, tarix elmlər doktoru, professor, Əməkdar elm xadimi Süleyman Məmmədovu xüsusilə qeyd etməliyik (6, s. 341).

Beləliklə, İrəvan xanlığının ərazisində Çar Rusiyasının əli ilə Ermənistan adlı dövlətin yaranmasından sonra oradan bu ərazilərdə milli zəmində məqsədli qarşıdurmalar yaratmaqla, Azərbaycanın Türk dünyası üçün vacib geosiyasi əhəmiyyətli məkan olması ilə bağlı gələcəkdə yeni-yeni qaynar nöqtələrin

yaradılması prosesi sistemli xarakter aldı.

Bir əsrə yaxın dövrdə ölkəmiz bu təhdidləri dəf etmək zorunda qaldı ki, bunlardan biri də "Dağlıq Qarabağ" adlı qondarma qurumun tarixin zibilliyinə atılması ilə başa çatdı.

Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin dediyi kimi "xalqımız əsrlər boyu öz hüquqlarını qorumaq üçün, öz tarixi torpaqlarında yaşamaq üçün böyük fədakarlıq göstərmişdir. Ancaq buna baxmayaraq, tarixin müxtəlif vaxtlarında bizim xalqımız öz doğma torpaqlarından məhrum edilmişdir. XX əsr bu baxımdan xalqımız üçün çox böyük faciələr gətirmişdir. 1918-ci ildə təzə yaradılmış Azərbaycan Xalq Cümhuriyyəti özünün ilk qərarlarından birində bizim tarixi şəhərimizi – İrəvanı Ermənistana faktiki olaraq bağışlamışdır. Bu, bağışlanmaz bir addım idi, bu, xəyanət idi və cinayət idi. Bunu biz hamımız yaxşı bilirik, xalqımız da bunu bilməlidir. Biz heç vaxt tariximizi təhrif etməməliyik".

**Problemin aktuallığı:** Deportasiya dövrü erməni təhdidlərinin qızğın dövrüdür. İrəvan Pedaqoji Texnikumunun Xanlara köçürülməsi milli məktəb və pedaqoji fikir tarixinin unudulmaz mərhələsi olaraq aktuallığı ilə seçilir.

**Problemin elmi yeniliyi:** Milli məktəb və pedaqoji fikir tarixinin indiyədək işlənməmiş sahəsi olaraq yeni araşdırmalarla tədqiqatçıların gələcəkdə prosesə cəlb edilməsidir. İrəvan məktəb və pedaqoji fikir tarixinin ümumazərbaycan ictimai-humanitar fikrinin tərkib hissəsi kimi ictimailəşdirilməsidir.

**Praktik əhəmiyyəti və tətbiqi:** Milli məktəb və pedaqoji fikir tarixinin az tədqiq edilmiş sahəsinin öyrənilməsi və öyrədilməsidir. Bu, həm də eyni adlı kursun tədrisinin zənginləşməsi baxımından da tətbiqi əhəmiyyəti ilə seçilir.

**Ədəbiyyat:**


1. Azərbaycanlıların Ermənistan SSR-dən deportasiyası (1948-1953). −Bakı, 2013. −784 s.
2. Azərbaycan tarixi. V c. Bakı, 2001.
3. Cəfərov, C. İrəvanda milli maarifçilik mühiti. / C. Cəfərov. C. Allahverdiyev. −Bakı: Şərq-Qərb, − 2017.
4. Cəfərov, C. Təhsil tariximizdən: *İrəvan Pedaqoji Məktəbi.* / C. Cəfərov. C. Allahverdiyev. −*Bakı*: Elm, −2017. −460 s.
5. Ələkbərli, Ə. Qərbi Azərbaycan abidələri. / Ə. Ələkbərli. −Bakı: Ağrıdağ, −*2006.*
6. Rüstəmov, F. Pedaqogika tarixi. / F. Rüstəmov. −Bakı. 2006.
7. Əhmədov, H. Avrasiya xalqlarının məktəb və pedaqoji fikir tarixinə dair oçerklər. / H. Əhmədov. −Bakı: Maarif, −2012.
8. Bayramov, İ. Qədim Azərbaycan şəhəri. İrəvan. / İ. Bayramov. −Ankara, 2023.
9. Həbibbəyli, İ. Azərbaycan ədəbiyyatı: dövrləşdirmə konsepsiyası və inkişaf mərhələləri. / İ. Həbibbəyli. −Bakı: Elm, −2019.
10. Məmmədov, İ. Tariximiz, torpağımız, taleyimiz. / İ. Məmmədov. −Bakı: Adiloğlu, −2003.
11. Mərdanov, M. Azərbaycan təhsil tarixi. I cild. / M. Mərdanov. −Bakı, 2001.
12. Nadir Dövlət Rusiya türklərinin milli mübarizə tarixi (1905-1917). −Bakı. 2002.
13. Nazim Mustafa. İrəvan şəhəri. / Nazim Mustafa. −Bakı, 2020.
14. Rzayev, V. Naxçıvan məktəb və pedaqoji fikir tarixi. / V. Rzayev. −Bakı,2018.
15. Mahmudov, Y. İrəvan xanlığı. / Y. Mahmudov. −Bakı, 2010.
16. Xanlar Rayon Dövlət Arxivi (indiki Göygöl rayonu). Xanlar Pedaqoji Məktəbinin 1970-1971-ci tədris illəri üçün əmr kitabı. N 1-288. Fond 131. Qeyd N 2, saxlama vahidi 1, əlaqə vərəqi 1

UOT 37.01.

**_Lalə Zahir qızı Allahverdiyeva_**
_"Naxçıvan" Universitetinin_
_Pedaqogika və psixologiya kafedrasının dosenti,_
_pedaqogika üzrə fəlsəfə doktoru_
_**Orcid**: 0000000308438632_

# MAGİSTRANTLARDA TƏDQİQATÇILIQ BACARIQLARININ FORMALAŞMASI İMKANLARI

**_Лала Захир гызы Аллахвердиева_**
_доцент кафедры Педагогики и психологии Университета «Нахчыван»,_
_доктор философии по педагогике,_

# ВОЗМОЖНОСТИ ФОРМИРОВАНИЯ НАВЫКОВ ИССЛЕДОВАНИЯ У МАГИСТРАНТОВ

**_Lala Zahir Allahverdiyeva_**
_docent of the department of Pedagogy and psychology of "Nakhchivan" University,_
_doctor of pilosophy in pedagogy_

# OPPORTUNITIES FOR DEVELOPING RESEARCH SKILLS IN MASTER STUDENTS

**Xülasə.** Məqalədə tədqiqatçılıq fəaliyyətinə verilən tələblər, magistrant - pedaqoqların formalaşmasında tədqiqat fəaliyyətinin rolundan geniş bəhs edilir. Magistratura səviyyəsində gələcək pedaqoqların tədqiqat fəaliyyətinin effektivliyini təmin edən əsas formalar kimi magistrlərin tədris və elmi-tədqiqat işləri və auditoriyadankənar vaxtlardakı fəaliyyət imkanları nəzərə çatdırılır. Tədqiqat xarakterli tapşırıqların yerinə yetirilməsi, elmi məqalələrin və tezislərin hazırlanması, eksperimental metodologiyanın əsasları üzrə seminarlarda iştirak etmək, onun nəticələrinin işlənməsi, habelə magistr dissertasiya işinin tərtibi və müdafiəsi, tələbə elmi dərnəklərində işləmək, konfranslarda, seminarlarda, olimpiadalarda iştirak etmə və s. təlim formaları elmi tədqiqat fəaliyyətinin təşkil edilməsinin komponentləri kimi araşdırılır. Elmi tədqiqat fəaliyyətinin yalnız yeni bilik əldə etmək üçün deyil, geniş mənada bütün növ işləri, onun təşkilini və böyük ölçüdə elmi fəaliyyəti əhatə etməsi qənaətinə gəlinir.

***Açar sözlər:*** *elmi tədqiqat, tədqiqatçılıq fəaliyyəti, pedaqoji kadr hazırlığı, fəaliyyət imkanları, keyfiyyətin yüksəldilməsi*

**Резюме.** В статье подробно рассмотрены требования к исследовательской деятельности, роль исследовательской деятельности в формировании педагогов-магистрантов. На уровне магистратуры учитываются педагогическая и научно-исследовательская работа магистров, а также возможности деятельности вне аудитории как основные формы, обеспечивающие эффективность исследовательской деятельности будущих педагогов. Выполнение исследовательских задач, подготовка научных статей и диссертаций, участие на семинарах по основам экспериментальной методологии, обработка ее результатов, а также составление и защита магистерских диссертаций, работа в студенческих научных объединениях, участие на конференциях, семинарах,

олимпиадах и т.д. Формы обучения рассматриваются как составляющие организации научно-исследовательской деятельности. Делается вывод, что научно-исследовательская деятельность направлена не только на получение новых знаний, но в широком смысле включает в себя все виды труда, его организацию и в значительной степени научную деятельность.

***Ключевые слова****: научные исследования, научно-исследовательская деятельность, подготовка педагогических кадров, возможности деятельности, повышение качества.*

**Summary.** The article examines in detail the requirements for research activities, the role of research activities in the formation of graduate students-teachers. At the master's level, the pedagogical and research work of masters, as well as opportunities for activities outside the classroom, are taken into account as the main forms that ensure the effectiveness of the research activities of future teachers. Carrying out research tasks, preparing scientific articles and dissertations, participating in seminars on the basics of experimental methodology, processing its results, as well as compiling and defending master's theses, working in student scientific associations, participating in conferences, seminars, olympics, etc.. forms of training are considered as components of the organization of research activities. It is concluded that research activity is aimed not only at obtaining new knowledge, but in a broad sense includes all types of work, its organization and, to a large extent, scientific activity.

***Key words:*** *scientific research, research activities, training of teaching staff, activity opportunities, quality improvement*

Müasir dövrdə təhsil meyarlarının dəyişməsi yeni informasiya texnologiyaları və kommunikasiyalarının inkişafı sahəsində beynəlxalq əməkdaşlıq və təcrübə mübadiləsi üçün geniş imkanlar yaradır. Bu imkanlardan daha səmərəli və əhəmiyyətli məqsədlər üçün yararlanmaq məqsədilə müasir magistrant-pedaqoqlar peşə kompetensiyalarını mükəmməl öyrənməlidir. Həmin kompetensiyalara tədqiqat aparmaq, özünütəhsil, ömürboyu oxumaq, bir sözlə, təhsildə fasiləsizlik aid edilir.

Məlumdur ki, müasir ali təhsil müəssisələri yüksək ixtisaslı mütəxəssislərin hazırlığının əhəmiyyətli hissəsini təmin edir. Bir çox universitetlər fəlsəfə doktoru və elmlər doktoru hazırlığını həyata keçirməklə fundamental tədqiqatların əsas hissəsinin yaranmasını təmin edir.

Bununla yanaşı, pedaqoji təmayüllü ali məktəblərin xüsusi göstərici olaraq tədqiqatçıdan fərqli olaraq müəllim-tədqiqatçı hazırlığını da yerinə yetirmə öhdəliyi vardır. Mütəxəssis hazırlığının keyfiyyətinin yüksəldilməsi məsələləri ilə bağlı elmi-tədqiqat fəaliyyəti xüsusi əhəmiyyət kəsb edir. V.İ. Boqoslavski və V.V. Laptevin fikrincə, keyfiyyətin təminatı tədqiqat fəaliyyətinə, təşkilati-idarəetmə fəaliyyətinə və koordinasiya fəaliyyətinə əsaslanmalıdır" [19, s. 52].

Ali təhsilin keyfiyyətinin təmin edilməsində elmi-tədqiqat fəaliyyəti mühüm yerlərdən birini tutur.

Professor Ə. Ağayev isə təlim prosesində şagirdlərin tədqiqatçılıq qabiliyyətlərinin inkişafı probleminə nəzər salmış, keçən əsrin ikinci yarısından bir sıra pedaqoq-psixoloqların tədqiqat obyektinə çevrilmiş bu məsələyə öz münasibətini bildirmişdir. Alim yazır: "Hər bir proses, hadisə, inkişaf özündən əvvəlki vəziyyət üzərində baş verir, qurulur, formalaşır, tarixini yaradır. Ötənlərdə yaradılan məzmunu, tutaq ki, təlimin üsullarını və digər pedaqoji təkmilləşmə hallarını bilmədən yenini yaratmaq və qavramaq, perspektivi

görə bilmək mümkün deyil. Eləcə də, bu günə qədər keçmiş yoldan varis qalanı da saf-çürük edə bilmək, ortaya qoymaq əsasdır. Eyni zamanda problemə müasirlik, yeniləşmə təfəkkürü ilə yanaşa bilmək, müasirlik tələblərinə uyğun iş qura bilmək, metodika hazırlamaq bacarığı da mühümdür. Yalnız ən azı bu üç prinsip üzrə elmi-nəzəri, metodik hazırlığı olan şəxslər müasir, dolğun, düzgün perspektivli pedaqogika və metodikanı yarada bilər” [2, s. 235].

Y. Kərimov da tədqiqatçılıq bacarığının əhəmiyyətini və eləcə də ilkin mərhələdə şagird şəxsiyyətinin formalaşmasına təsirini təhlil edərkən yazır: “Tədqiqatçılıq metodu təlimin başlıca yaradıcı metodudur. Bu metod varlığa emosional qiymətləndirici münasibəti inkişaf etdirir. Məktəblinin idrak fəaliyyəti yeni elmi həqiqəti kəşf edən alimin tədqiqatçılıq fəaliyyətinə yaxınlaşır. Doğrudur, şagirdlərin kəşf etdikləri elm üçün yeni deyil, lakin onlar üçün məlum olmayan hadisədir. Tədqiqatçılıq prosesində şagirdlər yaradıcı elmi axtarışlara xas olan mərhələlər keçirirlər: məqsədyönlü müşahidə edir, təcrübə qoyur, eksperiment təşkil edir, təhlil edir, müqayisə edir, ümumiləşdirir, rədd edir, sübut edir, qiymətləndirirlər. Belə işin idrakı əhəmiyyətini, şagirdlərin biliklərini yaradıcı tətbiqetmə bacarığını təmin etdiyini görməmək olmaz” [3,86].

Tədqiqatçılıq metodu hər hansı tədqiqatçılıq tapşırığı ilə əlaqədar problem şəraiti yaradılanda həlli tədqiqatçı tərəfindən tapılması mümkün olan problemin qoyulmasını tələb edir. Problemli şərh və qismən axtarıcılıq metodlarından fərqli olaraq tədqiqatçılıq metodunda elə bir şərait yaranır ki, iştirakçıların hamısı problemin mahiyyətini başa düşür və tədqiqata qoşulur.

Rus tədqiqatçısı İ.Y. Lerner qeyd edir ki, tədqiqatçılıq metodunun mahiyyəti onun funksiyaları ilə şərtlənir:

1) O, sosial təcrübənin üçüncü elementini məzmununu təşkil edən yaradıcı fəaliyyətin əlamətlərini formalaşdırır.
2) Biliklərin yaradıcı mənimsənilməsini təşkil edir, başqa sözlə, problem məsələlərin həlli üçün məlum bilikləri tətbiq etməyi və belə həll nəticəsində yenini əldə etməyi öyrədir.
3) Bu metodların araşdırılması üzrə fəaliyyət prosesində elmi idrak metodlarına yiyələnməyi müəyyən edir.
4) O, marağın yaradıcı fəaliyyətə tələbatın yaranmasının şərtidir. Əks halda maraqda və tələbatda özünü göstərən motivlər fəaliyyətdən kənarda yaranmır. Bunun üçün təkcə fəaliyyət kifayət deyil, lakin onsuz bu məqsədə çatmaq olmaz” [13, s. 103].

“Tədqiqat fəaliyyəti” anlayışına məzmunca kifayət qədər yaxın olan “tələbənin müstəqil işi”, “tələbənin müstəqil fəaliyyəti” anlayışlarıdır. Bəzi müəlliflərin fikrincə, “tələbənin müstəqil işi” termini az və ya çox şəkildə aydın formada müəyyən edilmiş elmi konsepsiya statusuna malik deyil, mənası qeyri-müəyyən, çoxsaylıdır. Bu termin pedaqoji ədəbiyyatda müxtəlif mənalarda ifadə olunur, məsələn: tədris prosesinin təşkilinin konkret forması kimi, təlimin fərdiləşdirilməsi üsulu kimi, müəllimin rəhbərliyi altında tələbələrin qrup işinin forması kimi.

Müstəqil olaraq bir elmi fikrin, ideyanın izinə düşüb, onu arayıb tapmaq, mahiyyətini öyrənmək, yaxud müstəqil fikir söyləmək, özünəməxsus ideya və baxışlara malik olmaq, digər təsirlərə kor-koranə qapılmamaq meyli tələbəlik illərində müstəqil işləməyə alışmaqla yaranır. Ona görə də tələbələrlə müstəqil işin yüksək

pedaqoji-metodik tələblərlə və psixoloji şərtlər nəzərə alınaraq təşkili mühüm əhəmiyyət daşıyır. Bunun üçün isə müstəqil işin mahiyyəti, ilk növbədə imkanları və yolları müəyyənləşdirilməlidir. Pedaqoji prosesdə müstəqil işin mahiyyəti ümumi şəkildə hamı tərəfindən qavranılır, sərbəst müstəqil fəaliyyətə istər idrak, istərsə də əmək fəaliyyətinə hazırlaşmaq, yaxud müstəqil icraçılıq bacarıqları nümayiş etdirmək kimi başa düşülür [6, s. 76].

Tədqiqat fəaliyyətləri bir çox müəlliflərin fikrincə, tələbələrin müstəqil fəaliyyətinin növlərindən biridir, lakin tədqiqat xarakteri ilə ondan fərqlənir. Bu mənada müstəqil iş tədqiqat fəaliyyətinin ən yüksək səviyyəsidir. Tədqiqat fəaliyyəti, yalnız yeni bilik əldə etmək üçün deyil, geniş mənada bütün növ işləri, onun təşkilini və böyük ölçüdə fəaliyyəti əhatə edir. Bu baxımdan elmi və elmi-tədqiqat fəaliyyətinin təşkili forması kimi "tədqiqat işi" ilə "tədqiqat fəaliyyəti" anlayışlarının əldə edilməsi fəaliyyətin bütün xüsusiyyətlərinə malik olan proses kimi yeni biliklərin işlənməsi və yayılması qanunauyğundur. Aydın olur ki, tədqiqat fəaliyyəti daha geniş anlayışdır və tədqiqat işini əhatə edir.

Tədqiqat fəaliyyətinə dair mövcud nöqteyi-nəzərləri ümumiləşdirərək, onun tərifinə bir neçə yanaşmanı ayırd edə bilərik.

Tədqiqat fəaliyyəti yaradıcı şəxsiyyətin inkişaf etdirilməsi vasitəsi kimi stimullaşdırıcı fəaliyyəti, müstəqilliyi və şəxsi məsuliyyəti, "elmlə və elm üzərində işləməyi", bilik və bacarıqların yaradıcı tətbiqini, elmi-texniki yaradıcılıq metodologiyasını mənimsəməyi əhatə edir.

Tədqiqat fəaliyyəti müstəqil təhsil fəaliyyəti kimi problemləri təhlil etmək, vacib və qeyri-vacibləri ayırmaq, müxtəlif fərziyyələr irəli sürmək və onların həlli üçün modellər qurmaq, habelə tənqidi düşünmək, problemin həlli üçün səbəbləri və şərtləri təhlil etmək bacarığını inkişaf etdirir.

Tədqiqat fəaliyyəti cəmiyyətin sosial sifarişinin həyata keçirilməsi kimi səmərəli fəaliyyət göstərə bilən, bütün həyatı boyu iş şəraiti və texnologiyalarının dəyişməsinə uyğunlaşa bilən mütəxəssislərin hazırlanmasına yönəldilmişdir.

Tədqiqat fəaliyyətinin nəzərə alınmasının müxtəlif səviyyələrini də ayırmaq olar. Tədqiqatçılar universitet daxilində tədqiqat fəaliyyətini bir sistem hesab edirlər. Bu yanaşma ilə oradakı idarəetmənin aşağıdakı səviyyələri ayırd edilir:

- özünü təşkil etmə və özünü idarə etmə;
- tədqiqat fəaliyyətinin məzmun tərəfini idarə edən müvafiq kafedra;
- fakültədə elmi işin təşkilinə rəhbərlik edən dekan;
- tədqiqat fəaliyyətini əlaqələndirən, tənzimləyən elmi tədqiqat şöbəsi.

İdarəetmə strukturunda təhsil, elm və ya dövlət müəssisələrinin inzibati işçilərinin fəaliyyətində tədqiqat fəaliyyəti aşağıdakı kimi çıxış edir:

- elmi öyrənmək və təkmilləşdirmək üçün alət;
- elmi fəaliyyət sahəsində ehtiyatların aşkar edilməsi və səfərbər edilməsi vasitələri;
- elmi fəaliyyətə və onun tədris prosesində həyata keçirilməsinə nəzarət vasitələri;
- elmin idarə edilməsi strategiyasının işlənib hazırlanması vasitələri.

Tədqiqat fəaliyyətini magistrantların və bakalavrların peşə hazırlığının mühüm hissəsi kimi də nəzərdən keçirmək olar. Bu təlim

sahəsi həm də iyerarxik olaraq daha böyük olanın (elmi hissə – fakültə – kafedranın müəllimləri – magistrant) alt sistemi olan bir sistem hesab edilə bilər.

Elmi tədqiqat fəaliyyətinin qiymətləndirilməsinin qeyri-müəyyənliyi ondan ibarətdir ki, o, təkcə iqtisadi deyil, həm də onun sosial, elmi-texniki və tədris-tədqiqat təsirini nəzərə almalıdır. "Cəmiyyətin müasir inkişaf səviyyəsi ciddi və əhəmiyyətli intellektual axtarışlar tələb edir. Və bu axtarışlar insana xidmət etməli olduğu üçün insana aid, insanın münasibətdə olduğu, insanın fəaliyyətini kompleks təmin edən elmlərin vəhdətində, əlaqədə nəzərə alınmasını şərtləndirir. Artıq "elmi-texniki tərəqqi əsri" ifadəsi hazırki dövrü səciyyələndirmir. İndi ideyalar, düşüncələr, təbiətə və onun varlığına bütöv yanaşma, onu tam öyrənmə əsridir" [6,38].

Magistraturada elmi-tədqiqat fəaliyyətinin həyata keçirilməsi məsələsinin nəzərdən keçirilməsi məqsədilə magistrlərin hazırlanması ilkin olaraq elmi-tədqiqat və elmi-pedaqoji fəaliyyətə yönəldilir. Magistrlərin elmi-tədqiqat fəaliyyəti onların müstəqil tədris işinin əsas növüdür. Burada magistrlər birbaşa rəhbərin köməyi ilə plan tutur, magistratura hazırlığının tədris proqramını mənimsəmək üçün magistr hazırlığı prosesində, eləcə də auditoriya dərslərində qazandığı peşəkar və yaradıcı təcrübələrə arxalanırlar.

V.İ. Boqoslovskinin və başqalarının [11] fikrincə, universitetdə tələbələrin elmi-tədqiqat işinin vahid sisteminin təşkili və saxlanmasının əsas məqsədi tələbələr tərəfindən elmi, tədqiqat və yaradıcılıq işlərini yerinə yetirmək bacarığı, yaradıcılıq qabiliyyətlərinin inkişafı, müstəqillik, dərslərdə və gələcək fəaliyyətlərdə təşəbbüskarlıq və s. göstəricilər vasitəsilə ali peşə təhsilli mütəxəssislərin hazırlığı səviyyəsinin yüksəldilməsidir.

Hazırlanmış təhsil proqramlarında (təhsilin məqsəd və məzmunu səviyyəsində) tələbələrin elmi-tədqiqat işi aşağıda qeyd edilən hallar üçün əhəmiyyətli hesab edilir:

- tələbələrin ümumi mədəni kompetensiyalarına nail olmaq və onların fundamental hazırlığını zənginləşdirməkdə;
- tədqiqat elmi bacarıqlarının inkişaf etdirməkdə (metodoloji kompetensiyanın əldə edilməsi);
- əlavə təhsil proqramının seçimində (çoxpilləli təhsil sisteminin ən yüksək səviyyəsində) və peşə fəaliyyətində öz müqəddəratını təyin etməkdə;
- ünsiyyət qurmaq, müasir sosial problemləri həll etmək, informasiya ilə işləmək bacarığının inkişaf etdirməkdə;
- şəxsiyyətin özünütərbiyəsi və özünü inkişaf etdirməsində;
- təhsilin müasir inkişafı şəraitində magistrantın pedaqoji fəaliyyətə və pedaqoji yaradıcılığa hazırlanmasında.

Universitetdə tələbələrin elmi-tədqiqat işi sistemi özlüyündə məqsəd deyil, peşəkar, elmi, pedaqoji və sosial problemləri fərdi və kollektiv şəkildə yaradıcılıqla həll etməyə qadir olan ixtisaslı mütəxəssislərin hazırlanmasının tərkib hissəsidir.

Magistratura səviyyəsində gələcək pedaqoqların tədqiqat fəaliyyətinin effektivliyini təsdiqləyən əsas formalar bunlardır:

- magistrlərin tədris və elmi-tədqiqat işləri çərçivəsində: tədqiqat xarakterli tapşırıqların yerinə yetirilməsi, elmi məqalələrin və tezislərin hazırlanması, eksperimental metodologiyanın əsasları üzrə seminarlarda iştirak etmək, onun nəticələrinin işlənməsi, habelə

magistr dissertasiya işinin tərtibi və müdafiəsi;
- auditoriyadankənar vaxtda: tələbə elmi dərnəklərində işləmək, konfranslarda, seminarlarda, olimpiadalarda, müsabiqələrdə iştirak, kafedraların, elmi-tədqiqat hissəsinin, universitetin digər elmi bölmələrinin, beynəlxalq tədqiqat proqramlarının planlaşdırılmış elmi tədqiqatlarında iştirak etmək. Auditoriyadankənar işin xarakterik xüsusiyyətlərinə auditoriyadankənar vaxtda elmi-tədqiqat tapşırıqlarının yerinə yetirilməsi, eyni zamanda, dərin müstəqil elmi tədqiqatlar aparmaq üçün geniş imkanlar əldə edilməsi aid edilə bilər.

Tədqiqat fəaliyyəti zamanı tədqiqatlar konkret şəxslərlə olan əlaqələrlə məhdudlaşdırıla bilməz. Bu proses həmçinin alimlərlə, mütəxəssislərlə təcrübəçi magistrantların şəxsi təmaslarını, seminar və konfransların keçirilməsini, elmi məlumatların mövcudluğunu və çox mövzulu müzakirələri əhatə edir. Buna görə də, auditoriyadankənar tədqiqat fəaliyyətinin özünəməxsus formaları kimi həyata keçirilən elmi və təşkilati işləri aşağıdakı kimi ayırmaq olar:
- magistratura səviyyəsində gələcək pedaqoqların Azərbaycanın və xarici ölkələrin aparıcı ekspertləri, alim və pedaqoqları ilə görüşləri;
- Azərbaycanda və xarici ölkələrdə müxtəlif təhsil müəssisələrinin fəaliyyəti ilə tanışlıq;
- beynəlxalq, ümumazərbaycan, regional, universitetlərarası, ümumuniversitet elmi konfrans və seminarların işində iştirak;
- fakültələrdə TEC konfranslarının və universitet miqyasında keçirilən TEC konfranslarının təşkili və iştirakı;
- şəxsi qrantlar üzrə müsabiqələrdə iştirak;
- ən yaxşı magistr işi üzrə müsabiqələrdə iştirak;
- magistratura səviyyəsi üçün təşkil edilən müsabiqələrdə iştirak;
- magistrlərin elmi işlərinin toplularının hazırlanması və nəşri.

Tədqiqat fəaliyyətinin kompetensiyalı təşkili magistrantların məhsuldar yaradıcılıq, tədqiqat fəaliyyətinə keyfiyyətli hazırlanmasını şərtlərindən biridir.

Ali təhsil müəssisələrində magistrlərin elmi-tədqiqat işləri sisteminin təşkilinin əsas prinsipi onun mürəkkəbliyini təmin etməkdir. Magistratura səviyyəsinin təhsil proqramı magistrantların cəlb olunduğu elmi yaradıcılıq formaları, elmi tədqiqatların aparılması, onların nəticələrinin həyata keçirilməsi üçün metod və üsulların mənimsənilməsi və istifadəsinin ardıcıllığını, hərtərəfliliyini, təhsilin mərhələləri (kursları) üzrə tədqiqat işlərinin davamlılığını, metodların məntiqi mürəkkəbliyini nəzərdə tutur. Təhsil proqramı magistratura səviyyəsində tələbələrin müstəqil tədqiqat fəaliyyəti prosesində gələcək pedaqoq-mütəxəssisin şəxsi keyfiyyətlərini yaxşılaşdırmalıdır. Şəxsi keyfiyyətlərə aid edilir:
- problemləri təhlil etmək, onun həllində vacib və qeyri-vacibləri ayırd etmək bacarığı;
- müxtəlif fərziyyələr irəli sürmək və onun həlli üçün modellər qurmaq, ən rasional olanları seçmək;
- tənqidi düşünmək;
- problemin həlli üçün səbəbləri və şərtləri təhlil etmək.

Magistratura səviyyəsində təhsil alan gələcək pedaqoqun yaradıcı potensialı əsasən tədqiqat bacarıqlarının inkişaf səviyyəsi ilə

müəyyən edilir, çünki tədqiqat bacarıqları yaradıcılığın mühüm tərkib hissəsi olmaqla onun spesifik növüdür.

Əsas tədqiqat bacarıqlarına aid edilir:

- ilkin mənbələrlə işləmək;
- pedaqoji hadisələrin müşahidələrini və təhlilini aparmaq;
- fərziyyələr formalaşdırmaq;
- eksperiment tərtib etmək və keçirmək;
- nəticələrini ümumiləşdirmək və emal etmək;
- tədqiqatın nəticələrini hesabat, referat, məruzə və metodik tövsiyələr şəklində tərtib etmək.

Magistr hazırlığının tədqiqatyönlü olması təhsilin məzmununda, tədris prosesinin təşkili formalarında, magistrantların elmi fəaliyyətində öz izini qoyur. Magistr tələbələrini elmi-tədqiqat və elmi-pedaqoji fəaliyyətə hərtərəfli hazırlanması işinə aşağıdakılar daxildir:

1. Elmi işlərin yerinə yetirilməsi və təlim məşğələlərinin keçirilməsi üsullarını, prinsiplərini və prosedurlarını mənimsəmək;

2. Elmi-pedaqoji işin təşkili üzrə bacarıqlara yiyələnmək;

3. Elmi informasiya mənbəyi ilə işləmək üçün metod və üsulları öyrənmək;

4. Tədqiqat fəaliyyətində istifadə olunan kompüter və digər texniki vasitələrin mənimsəmək;

5. Tədqiqat təcrübəsi zamanı ETİ-nin planlaşdırılması və təşkili üzrə təcrübə toplamaq;

6. Elmi-pedaqoji təcrübə keçərkən tədris işinin planlaşdırılması və aparılması təcrübəsini toplamaq;

7. Elmi işlərin, dərsliklərin, tədris-metodiki vəsaitlərin nəşrinə hazırlıq təcrübəsini əldə etmək;

8. Tədris prosesinə daxil edilmiş tədqiqat işlərini həyata keçirmək;

9. Tədris prosesini tamamlayan elmi konfranslarda, seminarlarda, müsabiqələrdə, sərgilərdə iştirak etmək;

10. Tədris prosesi ilə paralel olaraq elmi-tədqiqat qruplarında elmi-tədqiqat işlərinin həyata keçirilməsində, o cümlədən ödənişli şəkildə iştirak etmək.

Magistratura təhsil proqramının tədqiqat və elmi-pedaqoji hissələri onun müstəqil seçdiyi elmi biliklər sahəsində mütəxəssislərin hazırlanmasını nəzərdə tutur. Tədqiqat təcrübəsinin məqsədi magistrantlar üçün elmi problemlərin işlənməsi, elmi məlumatların axtarışı, emalı və istifadəsi üçün müasir metodlar; elmi ədəbiyyatın təhlili üsulları; pedaqoji biliklərin tərcüməsi üsullarını mənimsəməkdən ibarətdir.

Tədqiqat təcrübəsinin məzmunu: biblioqrafik mənbələrin təhlili, elmi konfranslarda məqalələrin, məruzələrin və çıxışların hazırlanması, həmçinin yeni nəticələrin əldə edilməsi və sınaqdan keçirilməsi ilə bağlı ekspert işidir.

Elmi-pedaqoji təcrübənin məqsədi magistrantlar tərəfindən pedaqoji fəaliyyət-də istifadə etmək üçün informasiya materialının axtarışı və şərhi üçün müasir elmi vasitələrə malik olan tədqiqatçı-müəllim vərdişlərinə yiyələnməkdir. Bu, müəyyən bir təhsil müəssisəsi (orta və ya ali) üçün təhsil kurikulumlarının təşkili, eləcə də orada birbaşa pedaqoji fəaliyyət ola bilər.

Təcrübə və tədqiqat işlərinin bütün həcminin uğurla həlli üçün müvafiq şərtlər lazımdır:

- yüksək ixtisaslı elmi və pedaqoji kadrların olması;
- tədris və elmi laboratoriyaların mövcudluğu;
- müasir avadanlıq və texnologiyalara, elmi məlumat mənbələrinə çıxışın mümkünlüyü.

Yadda saxlamaq lazımdır ki, təhsilə hazırlığın səviyyəsi artdıqca təhsilin özü ilə yaradıcı fəaliyyət birləşir. Magistratura məhz bu problemi həll edən təhsil həlqəsidir. Qeyd edilməlidir ki, elmi tədqiqat təcrübəsi zamanı magistrantlar nəzəri biliklərini genişləndirməli və dərinləşdirməli; təcrübədə əldə etdiyi nəticələrdən magistr dissertasiyası və gələcək elmi yaradıcılıq fəaliyyətində istifadə edə bilmək bacarığı əldə etməli; elmi tədqiqat işlərinin layihələndirilməsi və təşkilinin metodik işini reallaşdırmağı bacarmalı; dissertasiya elmi fərziyyəsinə uyğun olaraq eksperimentlər aparmalı; referatlar, elmi məqalələr yazmalı; biblioqrafiya, kataloqlarla işləməyi və s. bacarmalıdır.

Sadalanan bu və ya digər bacarıqlar magistrant-pedaqoqların tədqiqatçılıq fəaliyyətinin formalaşmasını təmin edən göstəricilər olmaqla onlarda elmi tədqiqat fəaliyyətinin daha da təkmil formalaşmasına səbəb olur.

**Problemin aktuallığı**. Magistratura səviyyəsində təhsil alan tələbələrin tədqiqatçılıq fəaliyyətinin təşkilinin zəruriliyi Ali təhsil pilləsinin Dövlət Standartı Magistratura səviyyəsinin ixtisaslar üzrə təhsil proqramında (2020) əksini tapır. Elmi-tədqiqat təcrübəsi magistr hazırlığı proqramlarının ayrılmaz tərkib hissəsi olduğu üçün onun yerinə yetirilməsi zəruridir. Bu baxımdan problemin öyrənilməsini aktual hesab edərək təhlillər aparılır.

**Problemin elmi yeniliyi** onunla müəyyən olunur ki, magistratura səviyyəsində təhsil alan tələbələrdə auditoriyada və auditoriyadan kənar müddətdə formalaşacaq bacarıqlar müəyyənlədirilməsinə dair araşdırma aparılır.

**Problemin praktik əhəmiyyəti**. Problemim məzmunu, orada yer alan fikirlər, əsas elmi ideyalar və tədqiqatın nəticələri pedaqoji ali məktəblərin bakalavriat, magistratura pilləsində təhsil alan tələbələr, doktorantlar, gənc tədqiqatçılar, habelə orta məktəb müəllimləri üçün əhəmiyyət kəsb edir.

**Ədəbiyyat:**


1. Abbasov A.N. Pedaqogika. Dərs vəsaiti./ A. N. Abbasov. − Bakı: Mütərcim, − 2013. − 360 s.
2. Ağayev Ə.A. Seçilmiş pedaqoji əsərlər. 2 cilddə, I cild. / Ə.A. Ağayev −Bakı: Mütərcim, − 2011. − 442 s.
3. Kazımov N.M. Məktəb pedaqogikası / N.M. Kazımov. − Bakı: Çaşıoğlu, − 2002.
4. Kərimov Y.Ş. Təlim metodları. Dərs vəsaiti. / Y.Ş. Kərimov. − Bakı, 2009. − 280 s.
5. Sadıqov F. Pedaqogika. Dərs vəsaiti. / F. Sadıqov. − Bakı: Adiloğlu, − 2012.
6. Mahmudova R. Ali məktəbdə tələbə müstəqil işinin imkanları və yolları. Metodik vəsait. − Bakı: Çaşıoğlu, − 2005. − 136 s.
7. Mehrabov A. və b. Pedaqoji texnologiyalar. − Bakı, 2006. − 372 s.
8. Nəzərov M. Pedaqoji texnologiyalar. / M. Nəzərov, N. Quliyev. − Bakı, 2019. − 467 s.
9. Əhmədov H. Pedaqogika. Dərslik. / H. Əhmədov, N. Zeynalova. −Bakı: Elm və təhsil, − 2016. −456 s.
10. Paşayev Ə.X. Pedaqogika. Yeni kurs. Dərs vəsaiti. / Ə.X. Paşayev, F.A. Rüstəmov. − Bakı: Çaşıoğlu, − 2004.
11. Богословский В.И., Нестеров А.А., Трапицын С.Ю. Организация и содержание научно-исследовательской работы студентов педагогических вузов: Методическое пособие / Под ред. В.И. Богословского. – СПб.: Издательство С. – Петербургского университета, 1999. – 87 с.

12. Богословский В.И., Лаптев В.В. Вузовская наука во взаимосвязи с подготовкой кадров высшей квалификации // Подготовка специалиста в области образования: Научноорганизационные проблемы подготовки кадров высшей квалификации: Коллективная монография. - СПб.: Изд-во РГПУ им. А.И. Герцена, − 2000. Вып. IX. – с. 45 - 52.
13. Лернер И.Я. Дидактические основы методов обучения / И.Я. Лурнер. − Москва: Педагогика, − 1981. − 103 с.

**E-mail:** lale.allahverdiyeva.81@bk.ru
**Redaksiyaya daxil olub**: 27.02.2024.

*UOT 37.*

***Mehriban Nağı qızı Sərdarova***
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin elmi işçisi*
***Orcid**: 0009-0000-8876-7051*

## HEYDƏR ƏLİYEVİN MİLLİ TƏHSİL SİYASƏTİNDƏ RESPUBLİKA TƏHSİL ŞURASININ YERİ

***Мехрибан Наги гызы Сардарова***
*научный сотрудник*
*Азербайджанского Государственного Педагогического Университета*

## МЕСТО РЕСПУБЛИКАНСКОГО СОВЕТА ПО ОБРАЗОВАНИЮ В НАЦИОНАЛЬНОЙ ОБРАЗОВАТЕЛЬНОЙ ПОЛИТИКЕ ГЕЙДАРА АЛИЕВА

***Mehriban Naghy Sardarova***
*scientific worker at the Azerbaijan State Pedagogical University,*

## THE PLACE REPUBLIC OF THE BOARD OF EDUCATION IN NATIONAL EDUCATION POLICY OF HAYDER ALIYEV

**Xülasə.** Müstəqil Azərbaycan Respublikasının təhsil tarixində Respublika Təhsil Şurası öz yaranma tarixi, məzmunu, daşıdığı zəngin irsi ilə mühüm yer tutur. Bu məqalədə müstəqil dövlətimizin təhsil quruculuğu prosesində uzun illər əhəmiyyətli mövqe tutan Respublika Təhsil Şurası Heydər Əliyevin təhsil irsi kimi nəzərdən keçirilir və onun milli təhsil quruculuğundakı yerinin öyrənilməsindən bəhs edilir.
***Açar sözlər:*** *Heydər Əliyev, milli təhsil siyasəti, Müəllimlər qurultayı, Respublika Təhsil Şurası, milli təhsil quruculuğu*

***Резюме:*** В истории образования независимой Азербайджанской Республики Республиканский Совет по образованию занимает важное место своей историей создания, содержанием и богатым наследием. В данной статье Республиканский Совет по образованию, на протяжении многих лет занимающий важную позицию в процессе образовательного строительства нашего независимого государства, рассматривается как образовательное наследие Гейдара Алиева, а также изучается его место в построении национальной системы образования.
***Ключевые слова:*** *Гейдар Алиев, национальная образовательная политика, Конгресс учителей, Республиканский Совет по образованию, строительство национального образования.*

***Summary:*** In the educational history of the independent Republic of Azerbaijan, the Republican Education Council occupies an important place with its history of creation, content, and rich heritage. In this article, the Republican Education Council, which has held an important position in the process of educational construction of our independent state for many years, is considered as the educational heritage of Heydar Aliyev, and the study of its place in the construction of national education is discussed.

***Key words**: Heydar Aliyev, national education policy, Teachers' Congress, Republican Education Council, national education construction*

On illər keçir, müstəqil Azərbaycan dövlətinin qurucusu, görkəmli siyasi və dövlət xadimi Heydər Əliyevin zəngin irsinə, düşüncələrinə maraq nəinki zəifləmir, əksinə daha da güclənir. Bu, bir tərəfdən də Heydər Əliyevin ölməz ideyalarının aktuallığı ilə bağlıdır.

Heydər Əliyevin ideyası əsasında yaranan, təklif və tövsiyələri ilə fəaliyyət istiqamətini quran respublika Təhsil Şurası müstəqil Azərbaycan Respublikasının təhsil tarixində öz yaranma tarixinə, məzmununa, daşıdığı zəngin irsə görə mühüm yerə malikdir. Öncə qeyd edək ki, Təhsil Şurası müstəqil Azərbaycan Respublikasının ilk müəllimlər qurultayında təhsilin problemlərinin öyrənilməsi ilə əlaqədar təhsilşünas dövlət xadimi Heydər Əliyevin tövsiyəsi ilə qeyri-hökumət təşkilatı kimi yaradılmışdır.

Azərbaycan Müəllimlərinin XI Qurultayı haqqında vikipediya məqaləsi iki məqamla diqqəti çəkir: ilk dəfə olaraq Azərbaycan müəllimlərinin himni bu qurultayda səsləndirilib, respublika Təhsil Şurası yaradılıb.

Müstəqil Azərbaycan müəllimlərinin ən mötəbər məclisi olan bu qurultayın təhsilimizin qarşısında duran məsələlərin həlli yolunda mühüm addım olacağına və pedaqoji fikir tariximizdə əhəmiyyətli yer tutacağına ümidvar olduğunu Heydər Əliyev qurultay iştirakçılarına ünvanladığı təbrik məktubunda xüsusi vurğulamışdır. Ona görə də Heydər Əliyevin təhsil irsində onun Azərbaycan müəllimlərinin XI qurultayındakı çıxışı önəmli yerlərdən birini tutur. Təsadüfi deyildir ki, Ulu Öndərin müəllim, ümumiyyətlə, Azərbaycan müəllimi haqqında şüar kimi səslənən, müstəqil ömür qazanan kəlam və aforizmlərinin, habelə müəllimlik peşəsinə münasibətinin ifadə olunduğu fikirlərin mühüm hissəsi bu qurultayının payına düşür. Qurultayda Azərbaycan Respublikasında milli təhsil quruculuğunun fundamental konsepsiyası hesab edilən İslahat Proqramının fəaliyyət istiqamətləri, vəzifələrin həlli yolları barədə müəyyən təkliflər irəli sürülmüş, qərarlar qəbul edilmişdir. Təhsilşünas ölkə başçısı Heydər Əliyevin təkliflərindən biri də Respublika Təhsil Şurasının yaradılması olmuşdur. Təhsil Şurasının təməl pinsiplərinin yaranması milli təhsilinin quruculuğunun konseptual sənədi olan İslahat Proqramının nəzəri əsaslarının müəyyənləşdirilməsi ilə eyni vaxta düşür. Azərbaycan müəllimlərinin milli təhsil prinsipləri ilə təşkilatlanmasında, Heydər Əliyevin milli təhsil müddəaları ilə Azərbaycan təhsili və müəllimi qarşısında qoyduğu vəzifələrin həll edilməsində nəzəri və praktik cəhətdən istiqamət verməsi ilə bu ictimai təşkilat təhsil tariximizdə bir mərhələ təşkil edir.

Respublika Təhsil Şurasının yaradılması ideyasının əsaslanması, onun tərkibinin müəyyənləşməsi, məzmunun, məqsəd və vəzifələrinin təyin olunduğu müəllimlər qurultayında Heydər Əliyevin tarixi çıxışı əslində Təhsil Şuraşının konseptual əsaslarını təşkil edir: *"Bu gün biz müstəqil Azərbaycanda bütün təhsilin – orta, texniki peşə, orta ixtisas məktəblərinin və ali məktəblərin işinin yaxşılaşdırılması sahəsində ciddi tədbirlər görməliyik. Mən hesab edirəm ki, bunlar da həm qəbul olunacaq təhsil qanununda, həm də təhsil islahatı ilə əlaqədar qəbul ediləcək qanunda və qərarlarda öz əksini tapacaqdır"* [8, s. 353]

Bu baxımdan qətiyyətlə demək olar ki, Təhsil Şurası məktəb və təhsil problemlərinin həllində Heydər Əliyevin qayğı və diqqətinin ictimai birlik formasında orqanı kimi çıxış edir.

Heydər Əliyevin irəli sürdüyü Təhsil Şurası ideyasının bütöv, mükəmməl və sistemli bir ictimai birlik səviyyəsinə qaldırılması ictimai təcrübədən irəli gəlməsi ilə, qurultayda özünün də diqqətə çatdırdığı kimi, birinci dövr təhsil quruculuğu fəaliyyətini, ittifaq səviyyəsində təhsil nazirliklərinə rəhbərlik təcrübələrini, eyni zamanda müasir beynəlxalq təcrübəni ehtiva etməsi ilə xarakterikdir. O, milli olduğu qədər də ümumbəşəri elmi təfəkkür modelləri ilə ifadə oluna bilməsi və humanizmə, insanlığa xidmət etməsi ilə diqqəti çəkir.

Maraqlıdır ki, Azərbaycan Müəllimlərinin XI qurultayında Azərbaycan təhsil işçiləri, müəllimləri tərəfindən irəli sürülən təkliflər, Ümummilli Liderin həmin təklifləri müəyyən dəyişikliklərlə dəyərləndirməsi, qəbul edilən qətnamə Azərbaycan Təhsil Şurasının Nizamnaməsinin əsasını təşkil etməklə onun fəaliyyətinin istiqamətlərini müəyyən etmişdir. Əslində qətnamədəki bu məqamlar, Azərbaycan Təhsil Şurasının qarşısına qoyulan vəzifə və tapşırıqlar onu göstərir ki, təhsil quruculuğunda dövlətçilik əhəmiyyətli milli təhlükəsizlik məsələlərinin qorunmasını Heydər Əliyev Respublika Təhsil Şurasının birgə iştirakı ilə olan fəaliyyətə etibar edir.

Fikrimizi əsaslandırmaq üçün qətnaməyə diqqət yetirək: *"Azərbaycanın Təhsil Şurası Azərbaycan Respublikasının Təhsil Nazirliyi və digər aidiyyəti olan qurumlar ilə birlikdə aşağıdakı istiqamətlərdə uzunmüddətli fəaliyyət proqramı formalaşdırıb həyata keçirsin"* [11, s. 552]

Təhsil Şurasının da qarşısına vəzifə kimi qoyulan, bütün təhsil pillələrini, onların məzmununa daxil olan istiqamətləri əhatə edən bu geniş fəaliyyət proqramının bəzi mühüm məqamlarını nəzərə çatdıraq:

- Müstəqillik idealları və milli zəminə uyğun gələn milli və ümumbəşəri dəyərlərə, demokratik və dünyəvi prinsiplərə əsaslanan müasir təhsil sisteminin qurulması;
- Azərbaycanda təhsilin strateji, ümummilli və ümumdövlət əhəmiyyətinə malik olan fəaliyyət sahəsinə çevrilməsinə dövlət təminatının təsbit edilməsi;
- Təhsilin məzmununun yeniləşdirilməsi sahəsində kompleks tədbirlərin həyata keçirilməsi;
- Azərbaycanda fəaliyyət göstərən bütün təhsil müəssisələrində dövlət təhsil siyasətinin həyata keçirilməsinin təmin edilməsi;
- Təhsilin maliyyələşdirilməsinin yeni mexanizminin hazırlanması;
- Ümumtəhsil məktəblərində şagirdin şəxsiyyət və vətəndaş kimi formalaşdırılmasında milli-mənəvi tərbiyənin ön plana çəkilməsi;
- Peşə təhsilinin ölkənin sosial-iqtisadi inkişaf perspektivləri nəzərə alınmaqla yenidən qurulması;
- Azərbaycan dövlətinin strateji mənafeyinə uyğun olaraq ali təhsil sisteminin yenidən qurulması və s.

Bu sənəddə milli təhsil quruculuğunun konstitusion əsasını təşkil edən İslahat Proqramının başlıca müddəalarının formalaşdırılması da Təhsil Şurasına tapşırılır: *"Azərbaycanın Təhsil Şurasına tapşırılır ki, təhsil sahəsinin müasir dövrün tələblərinə uyğun maliyyələşdirilməsi və idarə olunması ilə bağlı islahatlar Proqramını bir ay*

*müddətinə hazırlayıb Təhsil İslahatları üzrə Dövlət Komissiyasında təsdiq etdirsin*." [11, s. 552]

Göründüyü kimi, Təhsil Şurasının qarşısına qoyulmuş vəzifə və tapşırıqlar təhsilin bütün pillələrini əhatə edir. Təhsil Nazirliyi çərçivəsində, əsasən pedaqoq-alimlərin hazırladıqları bir sıra prinsipial məsələlərdə özünü doğrulda bilməyən sənədlərin strateji əhəmiyyətə malik olan fəaliyyət sahəsinə çevrilməsinə dövlət təminatı Təhsil Şurasının öhdəsinə buraxılır. Bunun üçün Təhsil Şurasının tərkibi müəyyənləşəndə Ümummilli Lider təşkilatda yalnız müəllimlərin, bilavasitə təhsil sahəsində işləyənlərin, təhsillə məşğul olanların bu tərkibdə fəaliyyət göstərməsini məqsədəuyğun hesab edir. Təhsilin problemlərində həqiqəti axtarıb tapılmasında və onun haqqında düz danışılmasında bir çox məsul vəzifəli şəxslərin vəzifə səlahiyyətindən istifadə edib səhlənkarlığa yol verəcəyindən narahatlığını gizlətmir, onların adlarını Şuranın siyahı tərkibindən çıxarılmasını tövsiyə edir: *"Şuraya hökumət üzvlərini salmaqla bu şuranın tamamilə mənasını dəyişirsiniz. Mən hesab edirəm ki, bu şuranın müstəqil olması üçün orada dövlət nümayəndələri olmamalıdır. Gərək bu şura müstəqil olsun, ictimai təşkilat olsun, öz sözünü hökumətə, hakimiyyət orqanlarına desin və öz təkliflərini irəli sürsün"* [8, s.366 ]. Bununla belə qarşıya cıxa biləcək mümkün çətinliklərin həllinə də nəzarət edəcəyini bəyan edir: *"Mən sizə söz verirəm ki, hər bir nazirin, hökumət nümayəndəsinin sizin şuranın bütün təkliflərinə, qərarlarına baxmasını təmin edəcəyəm*"[8, s. 366]

Heydər Əliyev çıxışında Təhsil Şurasının uzunmüddətli fəaliyyətinə böyük ümidlər bəslədiyini də qeyd edir: *"Əminəm ki, bu Şura formal bir təşkilat yox, işlək təşkilat olacaq və təhsilin, müəllimin, məktəbin problemlərini həll etmək üçün həmişə fəal olacaqdır"* [8, s. 366]

Respublika Təhsil Şurasının Ə. Ağayevin rəhbərliyi ilə fəaliyyət dövrünün araşdırılmasından çıxan nəticə onu göstərir ki, Şura iyirmi ilə yaxın fəaliyyəti müddətində Ümummilli Liderin ideyalarından dəstək almışdır.

Respublika Təhsil Şurasının ilk sədri, bu ictimai birliyin həyat və fəaliyyətində iyirmi illik dövrə öz imzasını qoyan professor Əjdər Ağayevin Təhsil Şurasına sədr seçilməsi də cəsarətlə deyə bilərik, Heydər Əliyevin Azərbaycan təhsilinə xidmətlərindəndir. Müstəqil dövlətçiliyimizin milli təhsil quruculuğunun ilk illərində təhsil islahatlarına ciddi zərurət yarandığı bir vaxtda Əjdər Ağayevin təlim prosesində ənənə və müasirliyin – təhsilin strateji prinsipi kimi irəli sürməsi, Azərbaycan məktəbinin uğurlu təcrübəsinə diqqəti cəlb etməsi, qabaqcıl və yenilikçi müəllimlərin innovasiyalarını dəyərləndirməsi, xarici ölkə məktəblərinin təcrübəsinin Azərbaycan məktəblərinə tətbiqinin səmərəli yollarını araşdırıb təqdim etməsi, yeni təlim texnologiyalarının mahiyyətini açıqlaması reallığa ən yaxın konsepsiya kimi ölkə ictimaiyyəti tərəfindən qəbul edilməsi əhəmiyyətsiz qalmadı və bu konsepsiya Təhsil Şurasının məzmununa daxil olan fəaliyyətdə əks olundu.

Şuranın fəaliyyəti əks olunan mənbələrin tədqiqindən aydın olur ki, milli təhsilin inkişafına təkan verən fərman və sərəncamların formalaşmasında Təhsil Şurası öz intellektual potensialından istifadə edərək iştirak etmişdir [2].

Dövri mətbuatın tədqiqi də göstərir ki, Təhsil Şurası pedaqoji kadr hazırlığı, təhsilin məzmununun müasir tələblərə uyğunlaşdırılması,

yeni təlim metod və texnologiyalarından istifadənin optimal yollarının tapılması, vətəndaş təhsilinin sivil ölkələr təcrübəsində öyrənilməsi və milli mənəvi bazada tətbiqi, məktəbli gənclərin tərbiyəsində Heydər Əliyev irsindən istifadə, şagirdlərin sinifdənxaric oxu problemi, müəllimlərin özünütəhsil problemi, yaddaş testindən intellektual testə keçilməsinin elmi-nəzəri və praktik şərtləri və digər aktual mövzularda konfranslar, müzakirələr, "dəyirmi masa" söhbətləri, mətbuat konfransları, ümumi yığıncaqlar və s. milli təhsil quruculuğuna xidmət edən onlarla tədbirlər keçirmiş, bu tədbirlərin bir çoxunda Təhsil Nazirliyinin rəhbərliyi, Milli Məclis üzvləri, aparıcı təhsil işçiləri, görkəmli elm və təhsil xadimləri iştirak etmişlər [1].

Müstəqilliyimizin ilk illərində məlum olan uzun böhran, müəyyən dərəcədə mənəvi deqradasiya proseslərindən sonra bərpa dövründə cəmiyyətdə müəllim nüfuzunun yenidən bərqərar olmasında Təhsil Şurasının həyata keçirdiyi tədbirlərin, görüşlərin, müzakirələrin xüsusi yeri var.

Təhsil Şurasının mühüm istiqamətlərindən birini elm və təhsilin inkişafı istiqamətində təhsilin bütün pillələrini əhatə edən müxtəlif layihələrin keçirilməsi təşkil edib. Birini qeyd edək. "Uşaqları ibtidai siniflərdə oxuyan valideynlərin maarifləndirilməsi" layihəsi əsasında pedaqoji-psixoloji məsləhət mərkəzi yaradılmış, yüzlərlə valideyn uşaqların təhsil və tərbiyəsi işi ilə əlaqədar maarifləndirilmişdir.

Təqdirəlayiq bir haldır ki, Təhsil Şurası layihələri ictimaiyyətin diqqətinə ayrı-ayrılıqda deyil, biri-biri ilə əlaqəli, vəhdətdə təqdim edir. Məsələn, kadr hazırlığının xüsusiyyətlərini həm də qabaqcıl təcrübə əsasında təqdim etmək, yaxud təhsil və təlimin bu və ya digər fənlərlə zənginləşdirilməsində ənənəvi təhsil təcrübəsindən, müasir dünya təhsil mənzərəsində onun yerindən bəhs edərək əsaslandırmaq və s.

Təhsil Şurası milli təhsildə musiqi tədrisinin yeri, zəruriliyi, problemləri ilə bağlı müxtəlif vaxtlarda geniş müzakirə və konfranslar keçirmişdir [7; 9].

Təhsil Şurası bu və ya digər pedaqoji-psixoloji problemlərin müzakirəsi istiqamətində onlarla müzakirələr, elmi konfranslar keçirib [1]. Bu istiqamət üzrə mütəxəssislər müxtəlif illərdə təhsil qanununun hazırlanmasında, elm haqqında qanunun müzakirələrində iştirak etməklə vaxtaşırı olaraq müəyyən təkliflərlə çıxış etmişlər. Habelə "Pedaqoji mətbuat və müasir müəllim" mövzusunda keçirilən elmi-praktik konfrans ilə regionlarda yaşayan, müasir metod və texnologiyalarla işləyən 70-dən artıq müəllimin öz təcrübələrini bölüşməsini, konkret təkliflər irəli sürülməsini təmin etmişlər [1]. Qabaqcıl məktəb direktorlarının təcrübəsinin təbliğinə aid layihə ilə isə 50 məktəb direktorunun iş təcrübəsini əhatə edən "Məktəb direktoru" kitabı nəşr edilmişdir. Nümunəvi təcrübəyə malik pedaqoji kollektivlər haqqında ayrıca kitab buraxılmış, geniş məqalələr yazılıb Təhsil Şurasının mətbuat orqanı olan "Körpü" (2002-ci ilin dekabr ayından fəaliyyətə başlayan mətbu orqanı sonrakı illərdə "Təhsil və Zaman" adı ilə fəaliyyət göstərmişdir. – M.S) qəzetində dərc edilmişdir.

Qeyd etmək yerinə düşər ki, "Təhsil və Zaman" qəzeti maarifləndirici, inkişafetdirici "Ən yaxşı məqalə müsabiqəsi", "Ziyalı ünsiyyəti", "Qabaqcıl təcrübənin ünvanı", "Metodik tövsiyə", "Psixopedaqoji məsələlər", "Təhsil ta-

riximizdən", "Milli vətənpərvərlik tərbiyəsi" rubrikaları ilə Azərbaycan müəllimlərini mütəmadi milli təhsil meyarları ilə canlandırmış, bununla milli təhsilin inkişafına öz töhfəsini vermişdir [3].

Hamımıza məlum olan ağır illərdə, çadır şəhərciklərində, müxtəlif bölgələrdə yerləşdirilən qaçqın məktəblərində görüşlər olmuş, müəllimlərlə söhbətlər aparılmışdır. Təhsil Şurası bir ənənə yaradaraq keçirdiyi iclas və tədbirlərdə 60-65 illik elmi-pedaqoji təcrübəsi olan görkəmli alim-müəllimləri təbrik etmiş, onların fəaliyyətinin örnək olaraq öyrənilməsini tövsiyə etmişdir [12].

Təhsil Şurasının əsas istiqamətlərindən biri də azərbaycanşünaslığı öyrənib təqdir, təbliğ etmək olub. Bu niyyətlə müstəqil dövlətçiliyimizdə azərbaycanşünaslıq ideyasının banisi Ümummilli Lider Heydər Əliyev irsinin öyrənilməsi və təbliği sahəsində ölkə üzrə şuradaxili bir neçə layihədən istifadə edilib. Belə ki, Ulu Öndər Heydər Əliyevin təhsil, milli-mənəvi tərbiyə, ali məktəb elmi, kadr hazırlığı, milli dərslik və s. məsələlərlə əlaqədar olaraq dövlət təhsil siyasətinə dair fikirləri, məruzə və çıxışları, sərəncamları tədqiqata cəlb edilmiş, nəticələri konfranslarda, toplantı və tədbirlərdə, mətbuatda şərh edilmişdir. Heydər Əliyevin təhsillə bağlı ideyalarını təbliğ etməyi qarşıya məqsəd kimi qoyan Təhsil Şurası 2000-ci illərin əvvəllərində Şuranın nəzdində Heydər Əliyev Universiteti yaratmışdır[2; 10]

Şura müasir Azərbaycan dövlətçiliyinin təməl daşını qoymuş, möhkəm özülünü yaratmış böyük şəxsiyyətin ideya dünyasını onun davamçılarının fəaliyyətində də öyrənib ənənəni davam etdirmişdir. Belə ki, 2003-cü ildə Təhsil Şurasının xətti ilə Respublika Sarayına toplaşan 2500 müəllim "Yeni Azərbaycan naminə" hərəkatına qoşularaq dövlətçilik, azərbaycançılıq mövqeyini qəti və açıq şəkildə bəyan etmiş, Heydər Əliyev siyasətinin təntənəsinə, Heydər Əliyev quruculuğunun uğurlu davamına – prezidentliyə namizəd İlham Əliyevə səs verməyi qərarlaşdırmışdır.

2008-ci il aprelin 26-da Azərbaycan Dövlət Akademik Opera və Balet Teatrında Respublika Təhsil Şurasının Təhsil Nazirliyi ilə birgə təhsil islahatlarına həsr olunmuş yığıncağı Ulu Öndərin 85 illik yubileyinə həsr olunmaqla onun əsasını qoyduğu yolun prezident İlham Əliyevin praqmatik siyasəti nəticəsində uğurla davam etdirilməsi, təhsil sistemində bir çox proqram və layihələrin həyata keçirilməsi, yüzlərlə təhsil işçisinin dövlət mükafatlarına layiq görülməsi, yüzlərlə məktəblərin tikilməsi, bərpa olunması, ümumiyyətlə, təhsilə kompleks yanaşılmanın təhsil ictimaiyyəti tərəfindən böyük razılıqla qarşılanması xüsusilə vurğulanmışdır [16].

Heydər Əliyev Fondunun Prezidenti Mehriban xanım Əliyevanın məktəb tikintisi, ehtiyacı olan istedadlı uşaqlara qayğısını, milli musiqinin inkişafı, ümumiyyətlə, Azərbaycan milli-mədəni-mənəvi irsinin qorunmasındakı xidmətlərini Təhsil Şurası layihələndirərək geniş ictimaiyyətə çatdırmışdır. Bu istiqamət üzrə layihələr yüzlərlə istedadlı uşaq və gənci beynəlxalq müsabiqələrə, festivallara cəlb edib, yaradıcılıq müsabiqələrində iştirakına şərait yaradıb.

Təhsil Şurasının mühüm layihələrindən biri, respublikanın təhsil ictimaiyyətinin böyük marağına səbəb olan beynəlxalq layihəsidir. Təhsil Şurasının beynəlxalq layihəsi ilə "Beynəlxalq təcrübə mübadiləsi təlim keyfiyyətini yüksəldən vasitə kimi" mövzusunda beynəlxalq elmi-təcrübi konfrans keçirmiş,

Azərbaycan müəllimlərinin xarici həmkarlarının dərslərində iştirak etməklə təcrübə mübadiləsi aparmalarına, qabaqcıl iş təcrübəsini öyrənmələrinə, bununla yanaşı öz təcrübələrini bölüşmələrinə şərait yaratmışdır.

Beynəlxalq layihə Təhsil Şurasının fəaliyyətində dövlətçilik, azərbaycançılıq əhəmiyyəti daşıyan digər tədbiri önə çıxarır. Təhsil Şurası Azərbaycanın gələcək uğurlu inkişafı üçün öz uzaqgörən, müdrik siyasəti ilə seçdiyi dəqiq ideoloji hədəflərdən biri, nəinki ölkə daxilində, beynəlxalq aləmdə, dövlətlərarası dialoqlarında öz səmərəli nəticələri ilə insanlara qarşılıqlı anlayış, sülh, əmin-amanlıq, qarşılıqlı hörmət bəxş etməyə yönəldilmiş, dövlət siyasətinin tərkib hissəsi və prioritetlərindən olan multikulturalizm probleminin tədqiqi, təbliği, tədrisi istiqamətində aparılan geniş işlərə dəstək nümayiş etdirmişdir [13]

Təhsil Şurası fəaliyyəti dövründə təhsildə rast gəlinən, təhsil ictimaiyyətini dərin narahat edən təhsil probleminə mütəmadi diqqət çəkmişdir. Məsələn, Qərb təcrübəsinə həddindən artıq aludəçiliyin onillərlə dövlətçiliyimizə faydalı şəxsiyyətlər yetişdirməsinə nail olan möhkəm elmi-nəzəri və metodik əsaslı indiyə qədərki təlim-tərbiyə ənənəsinin “gözdən salınmasını”, arxa plana atılmasını mətbuatda problem kimi qaldırmış, yazılarla çıxış etmışdır. Azərbaycan təhsilində digər həlli vacib problemlərə – təhsil kadrları sisteminə təhsil peşəkarlığı olmayan icra strukturlarının müdaxiləsini aradan qaldırmağın vacibliyini, vətəndaş təhsili konsepsiyasının hazırlanmasını və s. əsaslandıran mövqeyə mətbuatda geniş yer verib.

Təhsil Şurasının fəaliyyətində forumların xüsusi yeri izlənilir. Bu tədbirlərdə müəllim və təhsil məsələləri ilə bağlı aydınlaşdırıcı geniş müzakirələr aparılıb.

Təhsildə uğurlara və problemlərə həsr olunmuş Qabaqcıl müəllimlərin Birinci Respublika Forumunda (2016) təhsilin inkişafında müəllimin əsas rol oynaması müzakirənin başlıca mövzusu olmuşdur. Müəllimlərin fəaliyyətinin qlobal çağırışlarla səslənməsini Azərbaycan təhsilinin nailiyyəti hesab edən Ə. Ağayev çıxışında göstərib ki, bu uğurda Təhsil Şurasının “Qabaqcıl iş təcrübəsinin öyrənilməsi və yayılması” layihəsinin mühüm rolu vardır. O da göstərilmişdir ki, Azərbaycan müəllimlərinin malik olduğu qabaqcıl iş təcrübəsi xarici ölkələrdə qürurla nümayiş etdirmək imkanındadır. Bu qənaət Təhsil Şurasının layihələrinin nəticələrinə əsasən irəli sürülmüşdür. Forumda Azərbaycan təhsilinin uğurlarının dünya arenasına çıxarılmasında, eyni zamanda, müəllimlərin dünya təhsilində gedən yenilikləri öyrənməsində mühüm rol oynamasında, bu sahədə əhəmiyyətli layihələr həyata keçirmək istiqamətini prioritet seçməsində Təhsil Şurasının rolundan bəhs edilmişdir.

Forumda ölkə təhsilində xarici təcrübənin öyrənilməsi və tətbiqinə geniş yer verilməsi məsələsindən bəhs edilərkən yaranan problemlərə də toxunulub. Belə ki, ənənə ilə müasirliyin vəhdətini nəzərə alınmamasından yaranan, təhsildə narahatlıq doğuran problemin formaya aludə olub, məzmuna əhəmiyyət verməmək olduğu müəyyən edilib. Təhsil Şurası Forumda təhsil ictimaiyyətinin nəzərinə çatdırıb ki, xarici təcrübəni olduğu kimi tətbiq etmək, mövcud milli təcrübəni nəzərə almamaq, bu və ya digər hallarda “xaricidir, deməli üstündür” təfəkkürü ilə mövcud ənənəvi təcrübəyə lüzumsuz müdaxilələr heç də təhsilin inkişafına deyil,

reqresiyasına səbəb olan hallardır [14].

İndi də geniş rast gəlinən bu problem milli təhlükəsizlik məsələsi kimi nəzərdən keçirilə bilər. Təsadüfi deyildir ki, müdrik rəhbər Heydər Əliyevin təhsil müddəalarına əsasən bu məsələ İslahat Proqramında *"İslahatlar, varisliyi saxlamaqla, mütərəqqi dünya təcrübəsinə əsaslanmalıdır"* kimi müəyyənləşdirilib [6].

Təhsil Şurası "Məktəbəqədər Təhsil İşçilərinin Birinci Respublika Forumu"(2016) ilə Azərbaycanda məktəbəqədər təhsil sisteminin yeniləşməsinə, qabaqcıl təcrübəni ümumiləşdirmək, yaymaq, mövcud problemləri müzakirə etmək və aradan qaldırmaq yollarını müəyyənləşdirmək üçün məktəbəqədər təhsil müəssisələrində çalışanların toplantısını təşkil etmişdir. "Məktəbəqədər təhsil müasirlik müstəvisində" adlı Forumun keçirilməsində əsas məqsədlərdən biri məktəbəqədər təhsil işçilərinin peşəkarlığının artırılmasında modernləşmədən istifadənin nümayişi və qabaqcıl təcrübənin təbliği olmuşdur[15].

Qeyd etməliyik ki, Respublika Təhsil Şurasının milli təhsilin inkişafı ilə bağlı fəaliyyətini əhatə edən tədbirlərin hamısının üzərində dayanmaq təqdim olunan bu məqalənin imkanı xaricində olduğundan biz yalnız bunlardan bir qrupunu diqqət mərkəzinə gətirdik.

Beləliklə, Respublika Təhsil Şurasının ölkəmizin təhsil siyasətində yeri və rolu tədqiq edilərək bu qənaətə gəlinir ki, Şura milli təhsil quruculuğuna xidmət göstərməklə "ilk növbədə müəllimi dinləməliyik" prinsipinə əsaslanıb, ölkənin bütün müəllimləri, təhsil işçiləri ilə birgə təhsilimizdə mövcud olan problemləri yaradıcı şəkildə aradan qaldırmağın yollarını araşdırıb.

**Problemin aktuallığı**. Ümummilli Lider Heydər Əliyevin milli təhsil quruculuğundakı geniş və hərtərəfli fəaliyyəti bir fundamental konsepsiya təşkil edir, dövlətimizin təhsilinin davamlı inkişafında onu öyrənmək öz aktuallığı ilə seçilir.

**Problemin yeniliyi.** Respublika Təhsil Şurasının müstəqil dövlətimizin təhsilinin inkişafındakı rolu milli təhsil quruculuğunun tərkib hissəsi kimi ilk dəfədir tədqiq edilir.

**Problemin praktik əhəmiyyəti.** Məqalədə diqqət yetirilən məsələlər təhsilşünas dövlət xadimi Heydər Əliyevin irsini araşdıranlar, öyrənənlər üçün əhəmiyyətli ola bilər.

**Ədəbiyyat:**


1. Ağayev, Ə. Azərbaycan müəllimlərinin XII qurultayında çıxışı // Təhsil və Zaman. – 2003, 9 oktyabr. – s.1
2. Ağayev, Ə. Heydər Əliyev irsində vətəndaş tərbiyəsi məsələləri // Azərbaycan müəllimi. – 2005, 9 dekabr. – s.3
3. Ağayev, Ə. “Təhsil və zaman” – zamanın qəzetidir // Azərbaycan müəllimi. – 2012, 21 dekabr. – s.4
4. Ağayev, Ə. Uşaq ədəbiyyatının əhəmiyyəti //Xalq Cəbhəsi. – 2014, 19 fevral. – s.14
5. Aprelin 26-da Azərbaycan Dövlət Opera və Balet Teatrında Respublika Təhsil Şurasının ümumi yığıncağı keçirilib. https://edu.gov.az/printpage/1163
6. Azərbaycan Respublikasının təhsil sahəsində İslahat Proqramının təsdiq edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin Sərəncamı https://e-qanun.az/framework/5363
7. Azərbaycan təhsil sistemində musiqi təhsilinin öz yeri vardır // Azərbaycan müəllimi. – 2012, 12 aprel. – s.4
8. Əliyev, H.Ə. Müstəqilliyimiz əbədidir: [46 cilddə] / H. Əliyev. – Bakı: Azərnəşr, – 2005. c. 17. – 528 s.
9. Əliyev Y. Təhsil Şurası musiqi təhsilinə dair konfrans keçirdi // Azərbaycan müəllimi. – 2010, 28 may. – s.4
10. Hüseynzadə, F. Gənclərimiz ölkəmizin tarixini, dövlətçilik ənənəsini zəngin mədəni irsini yüksək dəyərləndirir // Palitra. – 2013, 13 iyun. – s. 11
11. Mərdanov, M. Azərbaycan Müəllimlərinin qurultayları – I-XII / M. Mərdanov. – Bakı: Çaşıoglu, – 2008. – s. 783
12. Mikayıllı, B. Şuşa təhsilinin ənənələrini yaşadan məktəb // Təhsil və Zaman. – 2008, 11 may, – s.4.
13. Multikulturalizm və təhsil // Azərbaycan müəllimi. – 2015, 24 oktyabr. – s.10
14. Təhsil Şurası Qabaqcıl müəllimlərin Birinci Respublika Forumunu keçirdi // Təhsil və Zaman. – 2016, 7 dekabr. – s. 1
15. Təhsil Şurası Məktəbəqədər Təhsil işçilərinin Birinci Respublika Forumunu keçirdi // Təhsil və Zaman. – 2016, 13 noyabr. – s.1
16. Təhsil Şurasının yığıncağında dövlət başçısı İlham Əliyevin prezident seçkilərində namizədliyi irəli sürülmüşdür // Azərbaycan, №89. – 2008, 27 aprel. – s.1



**E-mail:** mehribanserdarova@mail.ru



**Redaksiyaya daxil olub:** 02.05.2024

*UOT 37.0*

***Aytəkin Vaqif qızı Əliyeva***
*fəlsəfə doktoru proqramı üzrə doktorant*
*Naxçıvan Müəllimlər İnstitutunun Pedaqogika və psixologiya kafedrası*
***Orcid:*** *https://orcid.org/0009-0007-2348-764X*

## “PEDAQOJİ SƏRİŞTƏLİLİK” ANLAYIŞININ MAHİYYƏTİ VƏ MƏZMUNUNA DAİR MÜLAHİZƏLƏR

***Айтекин Вагиф гызы Алиева***
*докторант по программе доктора философии*
*кафедры Педагогики и психологии*
*Нахичеванского Педагогического Института*

## РАССУЖДЕНИЯ О СУЩНОСТИ И СОДЕРЖАНИИ ПОНЯТИЯ «ПЕДАГОГИЧЕСКАЯ КОМПЕТЕНТНОСТЬ»

***Aitakin Vagif Aliyeva***
*doctorial student in the program of doctor of philosophy*
*of the department of Pedagogy and psychology*
*at the Nakhchivan Pedagogical Institute*

## DISCUSSIONS ABOUT THE ESSENCE AND CONTENT OF THE CONCEPT OF “PEDAGOGICAL COMPETENCE”

**Xülasə.** Deyilənləri ümumiləşdirsək, “pedaqoji mərifət”, “pedaqoji ustalıq”, “pedaqoji mədəniyyət”, “pedaqoji peşəkarlıq”, “pedaqoji keyfiyyətlər” və s. bu kimi məfhumlar nə qədər oxşar, bir-birinə çox yaxın mahiyyəti ifadə etsələr də pedaqoji prosesin müxtəlif mürəkkəb cəhətlərindən asılı olaraq bir-birindən, eləcə də “pedaqoji səriştə” və “pedaqoji səriştəlilik” anlayışlarından fərqli məzmun kəsb edir. Pedaqoji səriştəlilik haqqında fikirlərini bu cür ümumiləşdirmək olar: Müəllimin səriştəliliyi onun yüksək əxlaqi keyfiyyətlərində, milli və bəşəri dəyərlərə sahib olmasında, dərin biliyində, ixtisasını mükəmməl bilməsində və öyrətməsində özünü göstərir.

***Açar sözlər:*** *pedaqoji səriştəlilik, pedaqoji ustalıq, pedaqoji mahiyyət, peşə kompetensiyaları, pedaqoji qabiliyyətlər*

**Резюме.** Обобщив сказанное, отмечается, что такие понятия как «педагогическое мастерство», «педагогическая культура», «педагогический профессионализм», «педагогические качества» и другие качества как бы не были схожи и очень близки по сущности, в зависимости от разных сложных сторон педагогического процесса, а также от понятий «педагогическая компетенция» и «педагогическая компетентность» имеют различные содержания. Их взгляды на педагогическую компетентность можно обобщить следующим образом: компетентность учителя проявляется в его высоких моральных качествах, национальных и общечеловеческих ценностях, глубоких знаниях, совершенном знании своей специальности и в преподавании.

***Ключевые слова:*** *педагогическая компетентность, педагогическое мастерство, педагогическая сущность, профессиональные компетенции, педагогические способности*

**Summary.** Summarizing what has been said, it is noted that concepts such as "pedagogical delicacy", "pedagogical skill", "pedagogical culture", "pedagogical professionalism", "pedagogical qualities", etc., no matter how similar and very close in essence, depending on different complex aspects of the pedagogical process, as well as from the concepts of "pedagogical competency" and "pedagogical competence" have different contents. Their views on pedagogical competence can be summarized as follows: The competence of a teacher is manifested in his high moral qualities, national and universal values, deep knowledge, and perfect knowledge of his specialty and in teaching.

***Keywords:*** *pedagogical competence, pedagogical skill, pedagogical essence, professional competencies, pedagogical abilities*

Keçən əsrin 90-cı illərindən başlayaraq pedaqoji səriştəlilik anlayışı pedaqogikaya dair tədris ədəbiyyatında "pedaqoji ustalıq", "müəllimin peşəkarlığı", "pedaqoji keyfiyyətlər", "müəllimə verilən tələblər" məfhumları ilə ifadə edilməyə başladı. Y. Talıbov, Ə. Ağayev, İ. İsayev, A. Eminovun "Pedaqogika" (Bakı: Adiloğlu, 2003), N. Kazımov, Ə. Həşimovun "Pedaqogika" (Bakı: "Maarif", 1996), N. Kazımovun "Pedaqoji ustalığın problemləri" (Bakı: OKA Ofset, 2011), Ə. Paşayev və F. Rüstəmovun "Pedaqogika" (Bakı: Nurlan, 2002), L. Qasımova və R. Mahmudovanın "Pedaqogika" (Bakı: "Ekoprint", 2021), R. Hüseynzadənin "Pedaqogika" (Bakı: Mütərcim, – 2021) və s. dərslik və dərs vəsaitlərini buna nümunə gətirmək olar.

"Pedaqoji səriştə" (kompetensiya) məfhumu "Azərbaycan Respublikasının ali təhsil pilləsində ibtidai sinif müəllimlərinin hazırlığı üzrə Çərçivə Kurikulumu" (Bakı, 2008) adlı sənədin qəbulundan sonra pedaqoji aləmdə daha çox işlənməyə başladı. Bundan sonra elmi və tədris ədəbiyyatında "peşə kompetensiyaları", "pedaqoji kompetensiyalar", nəhayət "pedaqoji səriştə" anlayışları möhkəmləndi.

"Peşə ixtisas seçimi" adlı əsərində gələcək müəllimlərdə pedaqoji qabiliyyətlər formalaşdırılmasını müəllim hazırlığında mühüm amil hesab edən M. İlyasov yazır: "pedaqoji qabiliyyətlər – bu, təlim-tərbiyə məqsədilə başqa adamlara təsir etmək qabiliyyətləridir: pedaqoji fəaliyyətə maraq; uşaqlara məhəbbət; uşaq kollektivini təşkil etmək bacarığı; kiçik yaşlı uşaqlarla işləmək meyli; uşaqlara rəhbərlik etmək; nitqin aydınlığı və inandırıcılığı; tələbkarlıq; vicdanlılıq" [2, s.60].

Pedaqoji araşdırmalardan aydın olur ki, Azərbaycan təhsilində səriştəli və peşəkar müəllimlərə, yeni texnologiyaları dərindən mənimsəyən, onlardan tədrisdə müvəffəqiyyətlə istifadə edən, innovasiyaları, yenilikləri özünün, fəaliyyətində tətbiq edən, məktəbə, öz peşəsinə bağlı olan, müəllimliyi özünün həyat kredosu hesab edən, sözün əsl mənasında onunla nəfəs alan müəllimlərə tələbat çoxdur.

Bir sıra pedaqoqlar isə "səriştəliliklə" "peşəkarlığın" eyni anlayışlar olmadığını, fərqli mahiyyət daşıdığını qəbul edirlər. Onlar göstərirlər ki, "yeni texnologiyaları dərindən mənimsə"mək, onlardan tədrisdə müvəffəqiyyətlə istifadə edə bilmək, "innovasiyaları, yenilikləri özünün fəaliyyətinə tətbiq edə" bilmək keyfiyyətləri daha çox səriştəliliyin, "məktəbə, öz peşəsinə bağlı olmaq, müəllimliyi özündə həyat kredosu hesab etmək" keyfiyyətləri isə daha çox peşəkarlığın əlamətləri hesab oluna bilər [2, s.18].

Peşəkarlıq-müəllimin lazımi biliyə, bacarıqlara, şagirdlərlə yaradıcı şəkildə işləyə bilmək texnologiyalarına sahib olması, pedaqoji prosesin incəliklərinə dərindən yiyələnməsidir. Səriştəlilik-müəllimin pedaqoji prosesi məharətlə, daha əlverişli metodlarla reallaşdıra bilməsidir.

Peşəkar fəaliyyət üçün zəruri olan yüksək həssaslıq, humanizm, peşə mədəniyyəti, pedaqoji fəaliyyətin inkişafının düzgün qiymətləndirilməsi və s. kimi xüsusiyyətlər də müəllimin peşəkarlığını xarakterizə edən cəhətlərdir.

Pedaqoji ədəbiyyatda peşəkar və səriştəli müəllimləri digərlərindən fərqləndirən və daha üstün pedaqoji səviyyədə saxlayan cəhətlər də müəyyənləşdirilmişdir. Prof. A.N. Abbasovun fikrincə, bu əlamətlər müəllimin səriştəli olmasının meyarları kimi önəmli xarakter daşıyır: 1. Təşkilatçılıq, idarəetmə səriştəliliyi; 2. Didaktik (öyrədə bilmə) səriştəliliyi; 3. Şagirdlərin idrakının inkişaf etdirilməsi səriştəliliyi; 4. Pedaqoji prosesə kreativ yanaşma; 5. Ünsiyyət və əməkdaşlıq səriştəliliyi [1, s. 95-96].

Tədqiqatımız göstərdi ki, müəllim peşəkarlığı və səriştəliliyinin formalaşması şərtləri bunlardır: müəllimin qabaqcıl təcrübəyə yiyələnməsi və onun yaradıcı tətbiqi; məktəbdə metodik işin yüksək səviyyədə təşkili və müəllimin ondan yararlana bilməsi; müəllimin özünütəhsil və özünütərbiyəsinin müntəzəmliyi; məktəbdə yaradıcı və yenilikçi mühitin olması.

Tədqiqat nəticəsində o da aydınlaşdırıldı ki, gələcək müəllimlərdə peşəkarlıq və səriştəlilik formalaşdırılması prosesində aşağıdakılara xüsusi fikir vermək zəruridir: tələbələrdə peşəkarlıq və səriştəlilik motivlərinin formalaşdırılmasına; yeni təhsil texnologiyalarından istifadəyə; pedaqoji təcrübələrdə peşəkarlıq və səriştəlilik formalaşdırılması imkanlarından istifadəyə.

L.N. Qasımova pedaqoji səriştələri əsasən, pedaqoji bacarıq, peşə qabiliyyətləri və pedaqoji qabiliyyətlər kimi qəbul edir. Alim, haqlı olaraq, pedaqoji qabiliyyətləri şəxsi keyfiyyətlər, didaktik qabiliyyətlər və təşkilati-kommunikativ qabiliyyətlər kimi qruplaşdırır [3, s.303-312].

Pedaqoji səriştə, onun formalaşdırılması yolları, pedaqoji şərtləri və imkanları barədə aparılan bir çox tədqiqatlar son vaxtlar dissertasiyalar şəklində təqdim edilir. Onlar arasında daha çox diqqəti cəlb edənlərdən biri F.E. Əfəndiyevanın "Gələcək ibtidai sinif müəllimlərinin peşə səriştələrinin formalaşdırılmasının pedaqoji şərtləri" adlı dissertasiyasıdır. Dissertasiyada bizim araşdırdığımız məsələ baxımından maraqlı olan məsələlərdən biri də odur ki, müəllif pedaqoji ədəbiyyatda müəyyən müddət ancaq "kompetensiya" kimi işlənən məfhumun "səriştə" termini ilə ifadə olunmasını daha məqsədəuyğun hesab edir: "Müasir pedaqoq və psixoloqlar arasında "kompetensiya" neologizm termini və ya alınma mənşəli digər söz və terminlər elə bil dəb halına düşmüşdür. ... Bəzi həmkarlarımızdan fərqli olaraq biz belə hesab edirik ki, kompetensiya... "səriştə", "səriştəli"... "səriştəlilik" sözləri eyniköklüdür" [5, s.18].

Müəllif səriştə və səriştəlilik anlayışlarının mahiyyətinə dair öz fikirlərini bu cür ümumiləşdirir: "... biz hesab edirik ki, səriştə – bir-birindən qarşılıqlı asılılığı olan, qarşılıqlı əlaqəli bilik, bacarıq və təcrübənin müəyyən mühitdə, xüsusən, təlim-tərbiyə, təhsil fəaliyyətində məcmuyu və bu fəaliyyətin sosial əhəmiyyətinin şəxsiyyət tərəfindən dərk edilməsidir. O, obyektiv şəkildə real aləmdə mövcuddur, onu mənimsəmək,

formalaşdırmaq, inkişaf etdirmək və təkmilləşdirmək mümkündür. Səriştəlilik isə müəyyən səriştələrə malik olmaq, həmçinin şəxsiyyətin fəaliyyətinin səmərəliliyi ilə əlaqədar olan xarakteristikasıdı” [5, s.22].

“Səriştə”, “səriştəlilik”, “peşəkarlıq” anlayışlarına R.L. Hüseynzadənin də maraqlı yanaşmaları vardır. Onun fikrincə: “Müəllimin səriştəliliyi və müəllimin səriştələri anlayışları da vardır ki, onlar müxtəlif məna daşıyırlar. Səriştəlilik müəllimin yerinə yetirdiyi ümumi funksiyanı tələb olunan səviyyədə yerinə yetirməsi deməkdir. Səriştələr isə müəllimin müxtəlif pedaqoji qabiliyyətlərə, müxtəlif müsbət keyfiyyətlərə sahib olması, müxtəlif pedaqoji sahələrdə xüsusi bacarıq və qabiliyyətlərini, istedadını bildirir” [4, s.91]. Onun fikrincə, müəllim səriştəliliyini, peşə ustalığını inkişaf etdirərək, təkmilləşdirərək, təcrübələr toplayaraq peşəkarlığa yetişir.

Pedaqoji səriştəlilik haqqında fikirlərini bu cür ümumiləşdirmək olar: Müəllimin səriştəliliyi onun yüksək əxlaqi keyfiyyətlərində, milli və bəşəri dəyərlərə sahib olmasında, dərin biliyində, ixtisasını mükəmməl bilməsində və öyrətməsində, yüksək pedaqoji qabiliyyətlərində, innovativ idarəçiliyində, pedaqoji-psixoloji biliklərə vaqif olmasında, yeni texnika və texnologiyaları, innovasiyaları tətbiq etməsində, öz yetişdirmələrinə dərin hörmət və qayğıkeşliklə yanaşmasında, tədqiqatçılıq və natiqlik qabiliyyətində, yüksək mədəni davranışında, sağlam, xoş görüşündə, mehriban ünsiyyətində, səliqəli geyimində, mehriban rəftarında özünü göstərir.

Buraya qədər deyilənləri ümumiləşdirsək, bizim fikrimizcə “pedaqoji mərifət”, “pedaqoji ustalıq”, “pedaqoji mədəniyyət”, “pedaqoji peşəkarlıq”, “pedaqoji keyfiyyətlər” və s. bu kimi məfhumlar nə qədər oxşar, bir-birinə çox yaxın mahiyyəti ifadə etsələr də pedaqoji prosesin müxtəlif mürəkkəb cəhətlərindən asılı olaraq bir-birindən, eləcə də “pedaqoji səriştə” və “pedaqoji səriştəlilik” anlayışlarından fərqli məzmun kəsb edir.

**Problemin aktuallığı.** Müasir dövrdə ölkəmizdə səriştəyə əsaslanan təhsilə xüsusi fikir verilir. Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət strategiyasında “birinci strateji istiqamət səriştəyə əsaslanan şəxsiyyətyönümlü təhsil məzmununun yaradılmasına yönəldilmişdir. İkinci strateji istiqamət təhsil sahəsində insan resurslarının müasirləşdirilməsini nəzərdə tutur”. Bu istiqamət innovativ təlim metodlarını tətbiq edən, təhsilin məzmununun səmərəli mənimsənilməsini təmin edən səriştəli təhsilverənin formalaşdırılmasına xidmət edir.

**Problemin elmi yeniliyi** ondan ibarətdir ki, pedaqoji kadr hazırlığında ibtidai sinif müəllimlərinin etnopedaqoji səriştəliliyinin formalaşdırılması prosesinin əsas parametrlərini müəyyənləşdirilmişdir. Bu parametrlər özündə qarşılıqlı əlaqədə olan aşağıdakı komponentləri birləşdirir: təlimin məqsədi, vəzifələri, prinsipləri, təşkilat formaları, təlim və tərbiyənin metodları.

**Problemin praktik əhəmiyyəti.** Tədqiqatın materialları “İbtidai təhsilin pedaqogikası” kursunun tədris proqramına etnopedaqoji bilik və bacarıqlar formalaşdırılmasına xidmət edən mövzuların daxil edilməsinə imkan verir.

**Ədəbiyyat:**


1. Abbasov, A.N. Pedaqogika nəzəriyyəsi və tarixi. / A.N. Abbasov, L.A. Məmmədli, İ.B. Əmirəliyeva. – Bakı: Mütərcim, – 2022. – 464 s.
2. İlyasov, M.İ. Müəllimin peşəkarlığı və pedaqoji səriştəliliyin müasir problemləri. / M.İ. İlyasov. – Bakı: ADPU, – 2018. – 208 s.

3. Qasımova, L.N. Pedaqogika. Dərslik. / L.N. Qasımova, R.M. Mahmudova. – Bakı: Ekoprint, – 2021. – 612 s.
4. Hüseynzadə, R.L. və b. Pedaqogika: Dərslik. – Bakı: Mütərcim, – 2021. – 488 s.
5. Əfəndiyeva, F.E. Gələcək ibtidai sinif müəllimlərinin peşə səriştələrinin formalaşdırılmasının pedaqoji şərtləri / pedaqogika üzrə fəlsəfə doktoru diss./ – Bakı, 2023. – 136 s.

**E-mail:** aytekinmammadli@gmail.com
**Redaksiyaya daxil olub:** 15.04.2024

*UOT 37.0*

***Amil Seydəmir oğlu Dadaşov***
*fəlsəfə doktoru proqramı üzrə doktorant*
*Azərbaycan Respublikasının Təhsil İnstitutu,*
*Əliyev adına Hərbi İnstitutun baş müəllimi*
***Orcid***: *https://orcid.org/0000-0002-9379-0798*

# HƏRBİ İNSTİTUTDA PROFESSOR MÜƏLLİM HEYƏTİ VƏ TƏLƏBƏLƏRİN MÜHƏNDİS HAZIRLIĞININ DİDAKTİK LAYİHƏLƏNDİRİLMƏSİ SƏVİYYƏSİNİN YÜKSƏLDİLMƏSİ İMKANLARI

***Амиль Сейдемир оглы Дадашов***
*докторант по програме доктора философии*
*Институт Образования Азербайджанской Республики*
*старший преподаватель Военного Института имени Гейдара Алиева*

# ВОЗМОЖНОСТИ ПОВЫШЕНИЯ УРОВНЯ ДИДАКТИЧЕСКОГО ПРОЕКТИРОВАНИЯ ИНЖЕНЕРНОЙ ПОДГОТОВКИ ПРЕПОДАВАТЕЛЬСКОГО СОСТАВА И СТУДЕНТОВ ВОЕННОГО ИНСТИТУТА

***Amil Seydemir oglu Dadashov***
*doctoral student in the Ph.D. program*
*at the Institute of Education of the Republic of Azerbaijan*
*head teacher of the Military Institute named after Heydar Aliyev*

# POSSIBILITIES OF IMPROVING THE LEVEL OF DIDACTIC DESIGN OF ENGINEERING TRAINING OF PROFESSORS AND STUDENTS AT A MILITARY INSTITUTE

**Xülasə.** Məqalə Hərbi İnstitutda professor-müəllim heyətinin və tələbələrin mühəndis hazırlığının didaktik layihələndirilməsi səviyyəsinin yüksəldilməsi probleminə həsr edilmişdir. Məqalədə Hərbi İnstitutda mühəndis hazırlığının didaktik layihələndirilməsi səviyyəsinin yüksəldilməsi işinə hazırlanması, işin mahiyyəti, məzmunu, məqsəd və vəzifələri ilə bağlı elmi, pedaqoji, metodik cəhətdən əsaslandırılmış fikirlər vurğulanır və müvafiq ümumiləşdirmələr aparılır. Məqalədə Hərbi İnstitutda mühəndis hazırlığının didaktik layihələndirilməsi səviyyəsinin yüksəldilməsi problemi sahəsində çalışan akademik heyət, təhsilverənlər və təh-silalanlar üçün faydalı fikirlər irəli sürülür.

***Açar sözlər:*** *mühəndis hazırlığı, hərbi institut, didaktik layihələndirmə, didaktik əsaslar, fənlərarası əlaqə, didaktik yanaşma, kurikulumun təkmilləşdirliməsi, müasir təlim texnologiyaları*

**Резюме.** Статья посвящена проблеме повышения уровня дидактического проектирования инженерной подготовки преподавателей и студентов Военного института. В статье подчеркнуты научные, педагогические, методически обоснованные идеи по подготовке к повышению уровня дидактического проектирования инженерной подготовки в Военном институте, сущность, содержание, цели и задачи работы и сделаны соответствующие обобщения. В статье предлагаются полезные идеи для профессорско-преподавательского состава, преподавателей и студентов, работающих в области проблемы

повышения уровня дидактического проектирования инженерной подготовки в Военном институте.
***Ключевые слова:*** *инженерная подготовка, военный институт, дидактическое проектирование, дидактические основы, межпредметная связь, дидактический подход, усовершенствование курикулума, современные технологии обучения.*

**Summary.** The article is devoted to the problem of raising the level of didactic design of engineering training of faculty and students at the Military Institute. In the article, the scientific, pedagogical, methodically based ideas on the preparation for raising the level of didactic design of engineering training at the Military Institute, the essence, content, goals and tasks of the work are emphasized and relevant generalizations are made. The article offers useful ideas for the academic staff, educators and students working in the field of the problem of raising the level of didactic design of engineering training at the Military Institute.
***Keywords:*** *engineer training, military institute, didactic design, didactic foundations, interdisciplinarity, didactic approach, curriculum improvement, modern learning technologies*

Ölkəmizdə müvəffəqiyyətlə həyata keçirilən təhsil islahatlarına dair direktiv materiallarda və Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin silahlı qüvvələrin qarşısında qoyduğu tapşırıqlarında hərbi təhsil sisteminin yeni model təhsilə inteqrasiyası o cümlədən hərbi mühəndislərin hazırlığı ilə bağlı görülən işlərin inkişaf etdirilməsi, beynəlxalq tələblərə müvafiq olaraq təkmilləşdirilməsi, zəruri hesab edilir. Bunun üçün Hərbi İnstitutda mühəndis hazırlığı işinin didaktik layihələndirilməsi sahəsində tədqiqatların genişləndirilməsi mühüm aktuallıq kəsb edir. Məhz bu baxımdan Hərbi İnstitutda hərtərəfli biliklərə və yüksək səriştəyə malik olan mütəxəssislərin hazırlanması faydalı sayılır. Səriştəli, yüksək texnoloji biliklərə yiyələnən, orduda müasir dövrün hərbi mühəndislərin hazırlığının dinamik inkişafını təmin etmək, bu istiqamətdə mühəndis hazırlığı proqramlarının didaktik layihələndirməsi işinin səviyyəsinin davamlı olaraq təkmilləşdirilməsi günün ən aktual tələblərindən biridir. Araşdırmalar göstərir ki, yeni kadr hazırlığında müasir texnologiyanın tədris prosesinə inteqrasiyası gələcəyin müəllimlərinin yaradıcı düşüncəsinin, pedaqoji bacarıqlarının və təhsilverənlərin akademik nailiyyətlərinin inkişafının əsas təminatçısıdır [1]. Hərbi təhsil müəssisələrinin diqqətində olan müasir texnologiyaların didaktik prosesə inteqrasiyası bir sıra fənlərlə yanaşı eyni zamanda mühəndis hazırlığının effektivliyini daha da artıra, öyrənənlərin simulyasiyalara, virtual laboratoriyalara və onlayn resurslara çıxışını asanlaşdırır [2]. Bunun üçün Hərbi İnstitutlarda mühəndis hazırlığının didaktik layihələndirilməsi işinin beynəlxalq norma və tələblərə, təcrübələrə uyğun təkmilləşdirilərək modernləşdirilməsinə zəruri ehtiyac duyulur. Professor-müəllim heyəti üçün müasir pedaqoji hazırlığın, texnologiyaların tədrisdə tətbiqi bacarıqlarının və təcrübəsinin təmin edilməsi prosesi Hərbi İnstitutun prioritet sahələrindəndir [3]. Xüsusi hərbi elm sahələri ilə yanaşı hərbi mühəndis hazırlığında da bu prioritet sahələrin məqsədyönlü və planlı şəkildə həyata keçirilməsi lazımdır. Mühəndis hazırlığının didaktik layihələndirilməsində əsas şərtlərdən

biri professor-müəllim heyətinin seçilməsi prosesi sayılır. Ona görə ki mühəndis hazırlığının didaktik layihələndirilməsi işinin mahiyyəti etibarı ilə ətraflı öyrənməkdən ötrü, professor-müəllim heyətinin proses zamanı interdisiplinar tədqiqatlar və onların nəticələri barədə elmi, fəlsəfi, sosioloji, psixoloji və pedaqoji cəhətdən əsaslandırılmış informasiyaların əldə edilməsi zəruri sayılır. Məhz bu baxımdan mühəndis hazırlığının didaktik layihələndirilməsi işinin məqsədyönlü planlı olaraq həyata keçirilməsi bu sahədə nəzərdə tutulan təkmilləşdirmə işlərinin davamlı olaraq həyata keçirilməsinə öz dinamik təsirini göstərmiş olur. Davamlı təkmilləşdirmə işlərinin əsasını təhsilalanlara təqdim edilən mühazirə mətnlərinin elmi, pedaqoji, psixoloji və metodik əsaslar üzrə nümunəvi şəkildə hazırlanması təşkil edir. Mühəndis hazırlığının didaktik layihələndirilməsinin pedaqoji əsaslarının düzgün müəyyənləşdirilməsi işində ümumididaktik tələblərin gözlənilməsi faydalı sayılır. Ona görə ki, belə tələblərin gözlənilməsi davamlı təkmilləşdirmə işlərinin nümunəvi şəkildə həyata keçirilməsinə geniş imkanlar yaratmış olur. Davamlı təkmilləşdirmələr, yüksək keyfiyyətli təhsil prosesi üçün lazımi tədris texnikalarının səmərəli tətbiqinə və təlim metodları ilə təchizatına səbəb olacaq ki, bu da müasir təlim imkanlarının mənimsənilməsinə səmərə verə bilər. Mühəndis hazırlığının didaktik layihələndirilməsi işində güclü sənaye tərəfdaşlarının yaradılması və davamlı qiymətləndirmənin nümunəvi təşkili də mühüm amillərdən hesab olunur. Müdafiəyönlü sənaye müəssisələrilə intensiv əməkdaşlıqların gücləndirilməsi, həmçinin öyrənənlərə praktiki təcrübələr və peşəkar hərbi sənaye sahələrilə tanışlıqların (turların icrası) təşkili, akademiya(hərb təhsil müəssisələri) və real dünya tətbiqləri, ordu əməliyyat fəaliyyətləri arasında körpü yarada bilər. Öyrənənlərin irəliləyişini ölçmək, təkmilləşməli sahələri müəyyən etmək və vaxtında verilən tapşırıqları yerinə yetirmək pedaqoji fəaliyyətin nümunəvi təşkilindən çox asılıdır. Pedaqoji fəaliyyətin bütün istiqamətlər üzrə nümunəvi təşkilindən ötrü müəllimlərin mövcud pedaqoji ədəbiyyatlarla tanış olmaları və tələb olunan məlumatları həmin ədəbiyyatlardakı umumididaktik prinsiplərə istinad edərək vermələri məqsədəmüvafiq hesab olunur. Deməli mühəndis hazırlığının didaktik layihələndirilməsi üzrə həyata keçirilən işlərin əsas istiqamətlərindən biri təhsilalanlara pedaqoji elmlər sistemində yer alan ədəbiyyatlarla, mühazirə və seminar məşğələləri, qrup çalışmaları və qrup məşğələləri aparan müəllimlərin tanış edilməsi nəzərdə tutulur. Onların ümumpedaqoji prinsiplərə istinad etmələri, ümumdidaktik metodları tətbiq etməklə tələbələrə istiqamətlər üzrə bilikləri verməli, bacarıq və vərdişləri aşılamalıdır [4].

Belə yanaşmaları isə mühəndis hazırlığının didaktik layihələndirilməsi işlərinin əsas istiqamətlərindən biri kimi də dəyərləndirə bilərik. Bu sahədə həyata keçirilən işlərə fənlərarası əlaqə və fərdi yanaşma problemləri üzrə aparılan tədqiqatlara da istinad etməyi faydalı sayırıq. Mühəndis hazırlığının didaktik layihələndirilməsi bu fənnin digər fənlərlə inteqrasiyasının düzgün təşkili haqqında danışılan problemin müvəffəqiyyətli həlli baxımından mühüm əhəmiyyət kəsb edir. Çünki bu proseslə pedaqoji texnologiyalardan və innovasiyalardan istifadə edilməsi mühəndis hazırlığının didaktik layihə-

ləndirməsi və mühəndis kadrların hazırlanması işinin nümunəvi təşkili üçün prioritet fəaliyyət istiqamətlərindən sayılır. Yuxarıda qeyd etdiyimiz kimi bu prosesdə fənlərin inteqrasiyasından da yararlanmaq səmərəli olar. Bundan ötrü inteqrasiya üçün zəruri sayılan fənlərin düzgün seçilməsinə diqqət edilməsi zəruri ehtiyac duyulur. Fikrimizcə Hərbi İnstitutlarda Mühəndis hazırlığının didaktik layihələndirilməsi, "Mühəndis hazırlığı fənninin" digər fənlərlə inteqrasiyası üçün "Pedaqogika", "Ali məktəb pedaqogikası", "Hərbi pedaqogika və psixologiya", "Psixologiya", "Ümumi psixologiya", "Sosiologiya", "Hərbi əməliyyatların idarəedilməsi", "Mühəndis qrafikası", "İnformasiya texnologiyaları" və bir sıra texniki fənlərinin seçilməsi daha məqsədəuyğun sayılmalıdır. Birincisi, ona görə ki, sadalanan fənlərin hər birinə aid son illərdə çap olunan dərsliklər, dərs vəsaitləri və digər metodiki vəsaitlər, ədəbiyyatlar vardır. İkincisi, inteqrasiya zamanı tələblər pedaqogika fənləri vasitəsilə təhsil sistemi, pedaqoji fəaliyyətin strukturu, didaktika, ali məktəb didaktikası, ali məktəb və təlimin metodları təlimin təşkili formaları, pedaqoji texnologiyalar, yeni pedaqoji innovasiyalar təlimin keyfiyyətinin diaqnostikası, ali məktəb tələbələrinin tərbiyəsinin sosial-pedaqoji əsasları, pedaqoji psixologiya, hərbi vətənpərvərlik və milli təhlükəsizlik, müasir texnologiyalar haqda mövzuları üzrə əsaslı biliklər əldə edəcəklər. Bütün bunlar onların mühəndis hazırlığının didaktik layihələndirilməsi üzrə görüləcək işlərin nəticəsi olaraq təlim dövründə əldə etdikləri biliklərini zənginləşdirəcək, bacarıq və vərdişlərini formalaşdıracaqdır. Mühəndis hazırlığının didaktik layihələndirilməsi üzrə bu fənnin psixologiya və hərbi psixologiya fənləri ilə inteqrasiya edilməsi prosesində isə tələbələr, fəaliyyət və ünsiyyət, şəxsiyyətin psixologiyası, şəxsiyyətlərarası münasibətlər, qrupların psixologiyası, psixi proseslər, diqqət, duyğular, qavrayış, hafizə, təfəkkür, təxəyyül, emosional hallar, qabiliyyətlər və bu kimi digər məlumatları əldə etmiş olurlar [5]. Deməli, mühəndis hazırlığının didaktik layihələndirilməsi işində pedaqoji-psixologiyanın bütün imkanlarından istifadə edilməsi faydalı sayılır [6].

Bu sadalananlarla yanaşı dərsliklər, metodik vəsaitlər, tədqiqat işləri və rəqəmsal alətlər (elektron bazalar, online kitabxana və beynəlxalq elmi tədqiqat mərkəzlərinə əlçatanlıq) kimi müasir təlim resurslarının mövcudluğunu təmin etməklə professor müəllim heyətinin elmi metodiki və didaktik layihələndirmə işi inkişaf etdirilə bilər.

Didaktik layihələndirmə işinin mahiyyətinə effektiv biliklərin mənimsənilməsi və bacarıqların inkişafı, məzmununa isə ordunun cari mühəndis təminatı vəzifələrinə kadr hazırlığı üçün tədris və təlim fəaliyyətinin planlaşdırılması və təşkili aiddir. Didaktik layihələndirmə prosesini təkmilləşdirməklə mühəndis hazırlığının keyfiyyətini əhəmiyyətli dərəcədə yaxşılaşdırmaq olar ki, bunun nəticəsində məzunlar müasir mühəndisliyin aktual tələblərindən olan texniki təcrübə və problem həll etmə bacarıqları ilə təchiz oluna bilər [7]. Müasir təhsilin texnoloji və innovasiyalı didaktik imkanlarını nəzərə alaraq professor-müəllim kollektivi öz tədris təcrübələrini təkmilləşdirə və təhsilalanlar isə daha cəlbedici, təsirli öyrənmə təcrübəsindən faydalana bilərlər [8]. Təklif olunan imkanlara kurikulumun (təlim-tədris proqramının) və ixtisas fənni proqramının mühəndislik

sahəsində yaranan tendensiyalara və sənaye ehtiyaclarına uyğunluğunu təmin etmək üçün yenidən baxılması daxildir. Baxılması vacib olan belə prosesdə fəal təlim strategiyalarının daxil edilməsi, birgə öyrənmənin təşviqi, texnologiyanın inteqrasiyası və pedaqoji təlimin səmərəli təmin edilməsi də nəzərə alınmalı vacib tədbirlərdir. Bundan əlavə, güclü sənaye tərəfdaşlıqlarının yaradılması və davamlı qiymətləndirmə metodlarının həyata keçirilməsi mühəndis hazırlığının səmərəliliyinə daha çox töhfə verir.

Sahənin inkişafının əsas proritet istiqamətlərindən olan təhsil prosesinin keyfiyyətini və səmərəliliyini artırmaqdan ötrü müasir texnologiyaların didaktik imkanlarına baxanda ötən on il üçün demək olar ki hər il inkişaf nəzərə çarpmaqdadır. Belə ki, didaktik layihələndirmə işin keyfiyyətinin artırılmasında təhsil prosesinin forma və metodlarına yeni texnologiyaların tətbiqi dayanır. İnkişaf etmiş dövlətlərin ali təhsil və hərbi təhsil müəssisələri sistemlərinin praktikasında tədrisin səmərəliliyini artırmaq üçün didaktik multimediya və simulyasiya kimi əhəmiyyətli təlim vasitələrin tətbiqi ilə tədris metodları və pedaqoji işin formaları intensiv şəkildə təkmilləşdirilir [9]. Bu gün mövcud texnologiyaların modernləşdirilməsi prosesi daha sürətli gedir və haqlı olaraq hərbi təhsil müəssisələri və fakültələrin innovativ prosesləri izləmələri, ordu və hərbi müəssisələrin tələblərinə uyğun gənc mütəxəssislərin hazırlanması örnək fəaliyyət istiqamətlərindən biri kimi qiymətləndirilməlidir.

Dünyanın əksər ölkələri həm dövlət və həm də özəl təhsil müəssisələrinin prioritet göstəricisi kimi didaktik informasiya texnologiya vasitələri və avadanlıqları ilə təchiz olunmalarıdır. Təhsil müəssisələri institut və universitetlər təhsil alanlara didaktik işin metod və formalarının müasirləşdirilməsini lazımi şəkildə tətbiq etməyi perspektiv planlarına daxil etmişlər. Müasir tədrisin didaktik texnologiya vasitələri və avadanlıqları ilə, xüsusilə də kompüter texnologiyalarının, multimedia və internetdən kütləvi istifadə etməklə təqdim olunan materialların interaktivliyi və keyfiyyəti ənənəvi auditoriyalarda keçirilən tədrislə müqayisədə daha zəngin məzmun və səmərə verir.

Texnologiya vasitələrinin və avadanlıqlarının tətbiqi, hərbi təhsil müəssisələrinin həm professor-müəllim heyətinin müasir təlim resurslarına çıxışını təmin etmək və təcrübi öyrənmə imkanları yaratmaqla yanaşı, həmdə kursantların nəzəri biliklərini praktiki şəraitdə tətbiq etmə bacarıqlarını təkmilləşdirə və onların peşəkar yüksəlişinə təkan verə bilər [10]. Göründüyü kimi, hərbi təhsil müəssisələrində, ixtisas və peşə sahəsində pedaqoji prosesdə texnoloji təkmilləşmə, əsas inkişafa yol açan baza təhsilin məzmununda yeni imkanlara şərait yaratmaqdır. Ali təhsil müəssisələrinin işi müasir innovasiyanı əks etdirən didaktik yanaşmaları təlim və tərbiyənin yeni texnoloji modelinə uyğunlaşdırmaq, sistemli şəkildə texnologiya və biliklərə inteqrasiya tələblərini reallaşdırmaqdır. Bu istiqamətdə fakültələrin rolu isə didaktik yanaşmada mütəxəssislərin innovativ texnologiyaları mənimsənilməsinin icraçısı olmaqdır [11].

Nəhayət, mövcud imkanların araşdırılması və yeni tələblərin gözlənilməsilə həyata keçirilməsi hərbi institutlarda mühəndis hazırlığında didaktik layihələndirmə səviyyəsi yüksəldilə bilər. Hərbi islahatların və yeniliklərin mühəndis hazırlığında didaktik layihələndirmə prosesinin inkişafına, professor-

müəllim heyətinə, kursantlara və bütövlükdə hərbi təhsil sahəsindəki çalışanlara öz töhfəsini verəcəkdir.

Hərbi təhsil dövlətin müdafiəsi və döyüş gücünün məzmun xəttinin bir elementi olaraq, Silahlı Qüvvələrin, Ordu və digər silahlı birləşmələrin qarşısında qoyulan vəzifələri yüksək peşəkarlıqla yerinə yetirməyi bacaran hərbi elmi biliklərə yiyələnmiş xüsusi kadrların hazırlanması fəaliyyətidir. Hərbi elm və təhsil sisteminin əsas məqsədlərinin (Azərbaycan Ordusunun hərbi təhsili) birincisi “ – Azərbaycan xalqı və dövləti qarşısında öz məsuliyyətini dərk edən, vətəninə və xalqına sadiq olan, xalqının milli-mənəvi dəyərlərinə və demokratik prinsiplərinə, insan hüquqlarına və azərbaycanlılıq ideyalarına sadiq olan, müstəqil və yaradıcı düşünən hərbi qulluqçuların (zabit, gizir və müddətdən artıq həqiqi hərbi xidmət hərbi qulluqçularının)” hazırlanmasıdır.

İkinci Qarabağ müharibəsindən sonra müzəffər Azərbaycan Ordusunun hərbi təhsilində islahatların keçirilməsinə başlanıldı. Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin 5 mart 2022-ci il tarixli, 1626 nömrəli fərmanında öz əksini tapan əsas müddəanın məqsədi, qabaqcıl xarici orduların praktikasına əsaslanaraq Milli Müdafiə Universitetinin yaradılmasıdır. Milli Müdafiə Universiteti-tabeliyindəki xüsusi təyinatlı təhsil müəssisələri(– ali təhsilin bakalavr, magistr və adyunktura (doktorantura) səviyyələrinə müvafiq olaraq) vasitəsilə ali təhsilin bütün səviyyələri üzrə mütəxəssis hazırlığının təhsil proqramlarının (Ali təhsilin bakalavr səviyyəsi üzrə zabit kadrlarının hazırlanması Heydər Əliyev adına Hərbi İnstitutda, magistr səviyyəsi üzrə zabit kadrlarının hazırlanması Hərbi İdarəetmə İnstitutunda, adyun-ktura (doktorantura) səviyyəsi üzrə zabit kadrlarının hazırlanması Hərbi Elmi Tədqiqat İnstitutunda həyata keçirilir) həyata keçirilməsini təmin edən, fundamental, nəzəri-metodoloji, pedaqoji-metodiki və tətbiqi-elmi tədqiqatlar aparan, Azərbaycan Respublikası Müdafiə Nazirliyinin strukturuna daxil olan xüsusi təyinatlı ali təhsil müəssisəsidir [12].

Müvafiq olaraq müasir təhsil modelinin tətbiqinin didaktik yanaşmaları zamanı professor-müəllim heyətinin özlərinin də etiraf etdiyi kimi bəzi çətinliklər arasında gələcək nəslin ehtiyaclarına uyğun tətbiqi informasiya və kommunikasiya texnologiyaların, elektronik (e-Learning, online) öyrənmə modelləri təhsilalan və təhsilverənlərin əksəriyyətinin təcrübəsizliyi, mənimsəmə qavrayışlarının yetərli texnoloji vasitələrin və potensial idrakın yetərsizliyini aşkar edir [8]. Hərbi ali təhsildə milli və beynəlxalq səviyyədə təhsil, tədqiqat və pedaqoji fəaliyyətlərin beynəlxalq keyfiyyətinə uyğunlaşmaq üçün texnoloji imkanların elektron öyrənmə və online rəqəmsal öyrənmə modellərinə inteqrasiya olunmalı və sürətli transformasiya proqramları tətbiq edilməlidir. Son illərdə təhsildə müasir didaktik yanaşmaların pedaqoji mobilliyinin artırılması, yeni model təhsil bazasının formalaşması müsbət nəticələrinin əldə olunmasına səbəb olub. Yeni model texnologiyalı didaktik təhsilin məzmunu hərbi ali təhsildə pedaqoji proseslərə dərindən nəzər salır, mövcud texnologiyadan ideal istifadəni formalaşdırması və bu texnologiyaların təhsildə yeni didaktik sistemlərin tətbiqinin yaradılmasıdır [13].

Bütün bu qeyd olunanlara baxmayaraq Hərbi təhsil sistemi qarşısında qoyulan məqsəd və vəzifələrdə, ordunun yeni modelinin yaradılması və sürətli islahatların aparılması, silahlandırmaya daxil olan

yeni sistem və qurğuların tətbiqi üzrə innovativ biliklərə malik kadrlara artan ehtiyaclar müasir didaktik yanaşmaların tətbiqini zəruri edir. Bunun üçün ən müasir metodlardan istifadə edilməsi vacib hesab edilir. Onların bir neçəsini nəzərdən keçirək.

**Aktiv Öyrənmə Strategiyaları metodu.** Fəal öyrənmə strategiyalarının həyata keçirilməsi mühəndis hazırlığı proqramının səmərəliliyini əhəmiyyətli dərəcədə artıra bilər. Aktiv öyrənmə öyrənənləri məlumatı passiv qəbul etmək əvəzinə, materialla aktiv şəkildə məşğul olmağa təşviq edir. Qrup müzakirələri, nümunə araşdırmaları, praktik layihələr və simulyasiyalar kimi fəaliyyətlərin birləşdirilməsi tənqidi düşünmə, problem həll etmə və qərar qəbul etmə bacarıqlarını inkişaf etdirir. Aktiv öyrənmə strategiyaları nəzəri konsepsiyaları real dünya ssenarilərinə tətbiq etmək imkanlarına malik olduğundan, öyrənənlərin məşğulluğunu və motivasiyasını da artırır. Fəal iştirak vasitəsilə öyrənənlər öz təlim prosesində fəal iştirakçı olurlar, nəticədə mühəndislik prinsipləri və konsepsiyalarını daha dərindən dərk edirlər.

**Birgə Öyrənmə metodu.** Əməkdaşlıq mühəndislik işinin mühüm tərkib hissəsidir, çünki mühəndislər mürəkkəb problemləri həll etmək üçün çox vaxt komandalar şəklində işləyirlər. Buna görə də, mühəndis təlimi proqramları çərçivəsində birgə öyrənmə mühitlərini inkişaf etdirmək vacibdir. Qrup layihələrini, komanda əsaslı tapşırıqları və həmyaşıd öyrənmə imkanlarını daxil etməklə, öyrənənlər əsas komanda işi və ünsiyyət bacarıqlarını inkişaf etdirə bilərlər. Birgə öyrənmənin təşviqi öyrənənlərə bir-birlərinin müxtəlif perspektivlərindən öyrənməyə, bilikləri paylaşmağa və kollektiv şəkildə problemləri həll etmək bacarıqlarını təkmilləşdirməyə kömək edir. Effektiv şəkildə komanda dinamikasını asanlaşdırmaq onları peşəkar mühəndislik karyeralarında qarşılaşacaqları birgə işə hazırlayır.

**Texnologiyanın inteqrasiyası metodu.** Texnologiyanın didaktik layihələndirmədə inteqrasiyası mühəndislik peşəsini öyrənənləri müasir, texnoloji cəhətdən inkişaf etmiş dünyaya hazırlamaqda çox vacibdir. Ən müasir alətlərin, proqram təminatının və simulyasiyaların istifadəsi öyrənmə təcrübəsini artıra və öyrənənlərə sənaye standartı texnologiyaları ilə praktiki şəkildə tanış olmağı təmin edə bilər. Virtual laboratoriyalar (VR), kompüter dəstəkli layihələndirmə (CAD) proqramı və simulyasiya vasitələri öyrənənlərə təhlükəsiz və idarə olunan mühitdə mühəndislik problemlərini sınaqdan keçirməyə, təhlil etməyə və həll etməyə imkan verir. Texnologiyanın inteqrasiyası həm də uzaqdan öyrənməyə (e-Learning) və geniş spektrli təhsil resurslarına çıxışa imkan verir, hərtərəfli mühəndislik hazırlığı imkanlarını genişləndirir.

**Müəllimlər üçün Pedaqoji Təlim metodları.** Didaktik tərtibatın səviyyəsini yüksəltmək üçün pedaqoqların davamlı peşəkar inkişafı və pedaqoji hazırlığının təmin edilməsi vacibdir. Effektiv təlim metodları, qiymətləndirmə üsulları, tədris və təlimdə texnologiyadan istifadə vurğulanmalıdır. Peşəkar inkişaf proqramları vasitəsilə pedaqoqlar öz tədris bacarıqlarını təkmilləşdirə, innovativ təcrübələri birləşdirə və mühəndislik təhsilində ən son nailiyyətlərdən xəbərdar ola bilərlər. Professor-müəllim heyətini pedaqoji bilik və bacarıqlarla təchiz etməklə

mühəndis hazırlığının ümumi keyfiyyəti yüksəlir. Yaxşı innovativ təlim keçmiş pedaqoqlar cəlbedici, öyrənən mərkəzli təlimatı effektiv şəkildə tərtib edə və çatdıra bilər ki, bu da öyrənənlər üçün daha zəngin öyrənmə təcrübəsi ilə nəticələnir.

**Davamlı qiymətləndirmə metodları.** Davamlı qiymətləndirmə metodlarının tətbiqi öyrənənlər üçün dəyərli rəy təmin edir və təlimatçılara onların tərəqqisini effektiv şəkildə qiymətləndirməyə imkan verir. Ənənəvi imtahanlar öyrənənlərin hərtərəfli anlayışını və praktiki problem həll etmə bacarıqlarını qiymətləndirmək üçün məhduddur. Bunun əvəzinə, layihə əsaslı qiymətləndirmələr, portfoliolar, təqdimatlar və praktiki nümayişlər kimi müxtəlif qiymətləndirmə strategiyalarının didaktik prosesə daxil edilməsi öyrənənlərin imkanlarının daha səmərəli, obyektiv və sürətli qiymətləndirilməsini təmin edə bilər. Davamlı qiymətləndirmə metodlarının üstünlüyü öyrənənləri öz bilik və bacarıqlarını real ssenarilərdə tətbiq etməyə təşviq edir.

**Nəticə.** Hərbi İnstitutda mühəndis hazırlığının didaktik layihələndirmə səviyyəsinin yüksəldilməsi və bu istiqamətdə işin hazırlanması, işin mahiyyəti, məzmunu, məqsəd və vəzifələri çoxşaxəli yanaşma tələb edir. Tədris proqramında aşağıdakıları nəzərə almaqla professor-müəllim heyəti və öyrənənlər təkmilləşdirilmiş öyrənmə təcrübəsindən faydalana bilərlər. Bunlara sənaye ehtiyaclarına uyğunlaşdırmaq, fəal öyrənmə və əməkdaşlığı birləşdirmək, müasir texnologiyanı inteqrasiya etmək, təhsil işçiləri üçün pedaqoji təlim vermək, davamlı qiymətləndirmə metodlarını tətbiq etmək və sənaye tərəfdaşlığı yaratmaq aiddir. Bu imkanlar vasitəsilə hərbi institutlar mühəndislik sahəsinin mürəkkəb problemlərinin öhdəsindən gəlmək üçün yaxşı təchiz olunmuş yüksək səriştəli mühəndislər yetişdirə bilər. Hərbi İnstitut mühəndis hazırlığında didaktik layihələndirməni davamlı müasir texnoloji innovasiyaların dinamik inkişafına uyğun olaraq təkmilləşdirmək yolu ilə hərbi ali təhsilin, professor-müəllim heyətinin və gələcək hərbi mühəndis kadrların səmərəli inkişafına nail ola bilər. Məhz bu baxımdan mühəndis hazırlığının didaktik layihələndirilməsi ali hərbi məktəb tələbələrinin milli təhlükəsizlik, hərbi vətənpərvərlik tərbiyəsilə yanaşı onların elmi dünyagörüşünün və şəxsiyyətyönlü inkişafının səviyyəsini yüksəltmiş olar.

**Problemin aktuallığı.** Hərbi İnstitutda müasir, hərtərəfli biliklərə və yüksək səriştəyə malik olan mütəxəssislərin hazırlanması əsas vəzifələrdən biridir. Səriştəli, yüksək texnoloji biliklərə yiyələnən, orduda müasir dövrün hərbi mühəndislərin hazırlığının dinamik inkişafını təmin etmək, bu istiqamətdə mühəndis hazırlığı proqramlarının didaktik layihələndirməsi işinin davamlı olaraq təkmilləşdirilməsi ali hərbi təhsil sisteminin ən aktual tələblərindəndir. O, müasir hərbi sistemin tələblərinə cavab verə bilən yüksək ixtisaslı hərbi mühəndislərin hazırlanmasında mühüm rol oynayır. Buda məqalənin mövzusunu daha da aktuallaşdırırr.

**Problemin elmi yeniliyi.** Məqalədə Hərbi İnstitutda mühəndis hazırlığının didaktik layihələndirilməsi işinin mahiyyəti və məzmunu diqqət mərkəzinə gətirilir və ümumiləşdirilir. Bu tədqiqatın məqsədi mövzunun elmi yeniliyinə və sahəyə mümkün töhfələrinə diqqət yetirərək, hərbi institutlar daxilində mühəndis hazırlığında didaktik layihələndirmə işinin mahiyyəti və məzmununun mövcud vəziyyətini araşdırmaqdır.

**Problemin praktik əhəmiyyəti**. Problemin məzmunu, orada yer alan

fikirlər, əsas elmi ideyalar və tədqiqatın nəticələri hərbi ali təhsil müəssisələrinin bakalavriat, magistratura pilləsində təhsil alan tələbələr, doktorantlar və hərbi institutun müəllimləri üçün xüsusi əhəmiyyət kəsb edir.

**Ədəbiyyat:**


1. Adem Yılmaz., The Effect of Technology Integration in Education on Prospective Teachers' Critical and Creative Thinking, Multidimensional 21st Century Skills and Academic Achievements. Participatory Educational Research (PER) Vol. 8(2), pp.163-199, April 2021 https://files.eric.ed.gov/fulltext/EJ1283596.pdf
2. Sagan, O., Yakovleva, S., Anisimova, E. E., Balokha, A., & Yeremenko, H. (2020). Digital didactics as a new model in the theory of education.
3. Sadıqov. F.B., Ümumi pedaqogika. Dərs vəsaiti. / F.B. Sadıqov. – Bakı: Maarif, – 2023. – 852 s.
4. Sadıqov, F.B., Ali məktəb pedaqogikası. Ali məktəblər üçün dərslik. / F.B. Sadıqov, – Bakı: Mürtəcim, – 2023. – 250 s.
5. Muxtarov, V.Ə., Hərbi psixologiya: Ali Hərbi məktəblər üçün dərs vəsaiti / V.Ə. Muxtarov. – Bakı: Elm və təhsil, – 2021. – 367 s.
6. Salamova, K.B., Ümumi psixologiya. Dərs vəsaiti / K.B. Salamova. – Bakı: Elm və təhsil, – 2014. –448 s.
7. Eder, W.E., & Hubka §, V. (2005). Curriculum, pedagogics and didactics for design education. Journal of Engineering Design, 16(1), 45-61.
8. Kędzierska, B., & Wnęk-Gozdek, J. (2015). Modern didactics in contemporary education. International Journal of Electronics and Telecommunications, 61(3), 251-260. https://bibliotekanauki.pl/articles/226859.pdf
9. Dutton, W. H., & Loader, B. D. (Eds.). (2005). Digital academe: new media in higher education and learning. Routledge.
10. Dragan Obradovic, Lakshmi Narayan Mishra, & Vishnu Narayan Mishra. (2021). Didactic-Information Innovations in Educational Technology. International Journal of Mathematics And Its Applications, 9(2), 39–48. Retrieved from http://ijmaa.in/index.php/ijmaa/article/view/63
11. Bespartochna, O., Ovdiichuk, L., & Piddubna, N. (2021). Features of the introduction of innovative technologies in the professional training of Teachers. Revista Tempos e Espaços em Educação, 14(33), 1-10.
12. Azərbaycan Respublikasının Müdafiyə Nazirliyi, Azərbaycan Ordusunun hərbi elm və təhsil sistemi. Retrieved from. https://mod.gov.az/az/azerbaycan-ordusunun-herbi-elm-ve-tehsil-sistemi-326/
13. Abysova, M., Kravchuk, M., & Hurniak, O. (2023). Digitalization in university education: didactic aspects. Information Technologies and Learning Tools, 2023, Vol 93, №1.



**E-mail:** amilodas@gmail.com



**Redaksiyaya daxil olub:** 05.03.2024.

*UOT 37.0*

***Sevda Hidayət qızı Axundova***
*Xəzər Universitetinin*
*fəlsəfə doktoru proqramı üzrə dissertantı*
***Orcid:*** *https://orcid.org/*0000-0001-9192-2307

# KOLLECLƏRDƏ İNNOVATİV FƏALİYYƏTİN TƏLİMİN KEYFİYYƏTİNƏ TƏSİRİ

***Севда Гидаят гызы Ахундова***
*диссертант по программе доктора философии*
*Университета Хазар*

# ВЛИЯНИЕ ИННОВАЦИОННОЙ ДЕЯТЕЛЬНОСТИ В КОЛЛЕДЖАХ НА КАЧЕСТВО ОБУЧЕНИЯ

***Sevda Hidayat Akhundova***
*dissertation candidate in the PhD program*
*at Khazar University*

# INFLUENCE OF INNOVATION ACTIVITY IN COLLEGE ON THE QUALITY OF TRAINING

**Xülasə.** Kolleclər çoxfunksiyalı təhsil müəssisələridir; belə ki, onlar yeni sosial-iqtisadi şəraitə ən çox uyğunlaşdırılmış, regional təhsil komplekslərinə mümkün qədər inteqrasiya olunan və bu günə qədər idarəetmə problemləri müəyyən qədər araşdırılmış subbakalavr təhsil müəssisələri kimi çıxış edir. İnstitusional missiyaların dəyişməsinə baxmayaraq, pedaqojiyönlü kolleclərin əksəriyyəti Azərbaycanda gələcək universitet tələbələri üçün ilkin giriş qapısı hesab edilir. Bu müəssisələrin digər bir xüsusiyyəti də onların bağlı olduğu icmanın dəyişən və innovativ tələbatına cavab verməsi zəruriyyəti ilə əlaqədardır.

***Açar sözlər:*** *innovativ, kolleclər, idarə olunma, fəaliyyət, təlim, təhsil*

**Резюме.** Колледжи являются многофункциональными учебными заведениями; то есть, они выступают как образовательные учреждения суббакалавриата, наиболее адаптированные к новым социально-экономическим условиям, максимально интегрированные в региональные образовательные комплексы, а проблемы управления в той или иной степени исследованы. Несмотря на изменение институциональных задач, большинство колледжей педагогической направленности считаются основными вступлением для будущих студентов университетов в Азербайджане. Другая особенность этих учреждений связана с необходимостью реагировать на меняющиеся и инновационные потребности сообщества, к которому они принадлежат.

***Ключевые слова:*** *инновационные, колледжи, управление, деятельность, обучение, образование.*

**Summary.** Colleges are multifunctional educational institutions; that is, they act as sub-baccalaureate educational institutions, most adapted to new socio-economic conditions, maximally integrated into regional educational complexes, and management problems have been studied to one degree or another. Despite changing institutional objectives, most colleges of pedagogical orientation are considered the

main entry points for future university students in Azerbaijan. Another characteristic of these institutions is the need to respond to the changing and innovative needs of the community to which they belong.
***Key words:*** *innovative, colleges, management, activities, training, education.*

Azərbaycanda təlim və tərbiyəyə verilən böyük qiymət bu sahədə aparılan böyük ölçüdə elmi tədqiqatlarda da öz əksini tapmışdır. Həm keçmişdə, həm də son illərdə təlim keyfiyyətinin prinsipləri, metodları, təlimdə istifadə olunan texnologiyalar və onların innovativ tətbiqi, təlim keyfiyyətinə təsir edən faktorların araşdırılması və digər bu kimi problemlərin şərhinə dair azərbaycanlı alimlər tərəfindən xeyli sayda dərsliklər, monoqrafiyalar, dərs vəsaitləri, elmi məqalələr yazılmış və geniş miqyasda təhlillər aparılmışdır.

Kolleclərin innovativ idarə edilməsi, onların fərdi strategiyası ilə birbaşa əlaqədar olduğundan, onlar öz konkret dəyərlərinə görə idarəetmə prosesi hesab olunur. Hər şeydən əvvəl qeyd olunmalıdır ki, bu həm də açıq bir prosesdir, zamanla və konkret strateji konsepsiyalarla dəyişən innovasiya modelidir. Bu, prosesdə idarəetmə qərarlarını lazımi anda asanlaşdırır və kolleclərə zamanla dəyişməyə imkan verir, çünki innovativ fəaliyyətin idarə edilməsi idarəetmə prosesindən, tədbirlər kompleksi və göstəricilərdən istifadə etməklə daim təkmilləşmə prosesi keçirir. Buna görə də, innovativ idarəetmə bütöv bir silsilə təşkil edir və təhsil sektorunda yeni tətbiqlərin, biliklər sisteminin yaradılmasını və yeni texnologiyaların meydana gəlməsini şərtləndirir. Yəni həm özəl, həm də ictimai və ya qarışıq tipli olmaqla, kolleclər bu yolu qət etdikdə innovativ hesab oluna bilərlər.

Kolleclərin innovativ idarə edilməsinin reallaşdırılması konseptual baxımdan onun təlimin son keyfiyyətində əks olunması ilə sıx bağlıdır, çünki son nəticədə artmış təlim keyfiyyəti elə özü də innovativ idarəetmənin sayəsində strateji hesab edilir. Bu səbəbdən, kolleclərin innovativ idarə edilməsinin həyata keçirilməsində hansı resurslardan istifadə olunmasına baxmayaraq, təlim və onu nəticələri həmişə hədəf olaraq qalırlar.

Digər mühüm bir məsələ ondan ibarətdir ki, innovasiyalı idarəetmədə innovativliyin elm və texnologiya deyil, məhz dəyər olması nəzərə alınmalıdır. Doğrudur, fəaliyyət növü birbaşa innovasiyaların təcrübi işi olan bəzi təşkilatlar da mövcuddur və onlar öz xüsusiyyətindən asılı olaraq innovasiyanı tədqiqat baxımından deyil, tətbiqetmə baxımından qiymətləndirirlər. Lakin kolleclərdə innovasiyalı idarəetmə, həm də kolleclərin ümumi məqsədlər sisteminin bir hissəsi olduğu üçün, adətən həmin müəssisələrdə gedən proseslərin daim yenilməsi bir zəruriyyətdir.

Kolleclərin innovativ idarə edilməsində atılacaq strateji addımlar çox vaxt tətbiq sahəsi üçün nəzərdə tutulmuş sahələrin identifikasiyası ilə başlanır. Burada zəruri mərhələ bəzən idarəetmədə özünü büruzə verən müəyyən siqnallar vasitəsi ilə, bəzən də ümumi innovativ idarəetmə tədbirləri çərçivəsində müəyyən edilir. Bu addımların hesablanması mümkün qədər böyük maliyyə itkisi olmadan idarəetməni təşkil etməyə köməklik göstərir. Odur ki, müvəffəqiyyətin təmin olunmasında qabaqlayıcı tədbirlər daim rəğbətlə qarşılanır; əks təqdirdə, bəzən innovativ idarəetmə kollec həyatında bir buxova çevrilmiş olur. Bu zaman innovasiyalar yox, kvazi innovasiyalar işə düşmüş olur. Məhz bu səbəbdən, çox vaxt innovasiyalı idarəetmə işçi və

tələbə heyətinin ümumi müzakirəsindən sonra xüsusi motiv qrupları tərəfindən müvəffəqiyyətlə müdafiə edildikdən dərhal sonra onun həyata keçirilməsi prosesinə start verilir.

Kolleclərin innovativ idarə olunması modelinin hazırlanmasında çox vaxt alimlər mühüm bir dilemma ilə qarşılaşırlar: İnnovasiya modelləri haqqında nəzəriyyə innovasiya idarəetmə modellərinə nə dərəcədə aiddir? İnnovasiya prosesi modeli və innovativ idarəetmə modelləri ayrılıqda nəyi nəzərdə tutur? Bu sualların cavablarını tam aydınlaşdırması innovasiyaların növləri, çoxsahəliliyi, mədəni və psixoloji dəyərlərin mövcudluğu, innovasiyaların miqyası və sair kimi məsələlər nəzərə alınmaqla araşdırılmalıdır.

Bir neçə onilliklər ərzində bəzi ölkələrdən olan tədqiqatçılar innovasiya modellərini daha geniş elmi-tədqiqat proseslərini təyin edən bir amil kimi nəzərdən keçirmişlər. Əslində, kollec həyatının innovativ idarə edilməsi modeli daha konkret bir sahəni əhatə etdiyindən, bu innovasiyaların iştirakçıları, proses və qarşıda duran vəzifələr ön plana çəkməli, idarəetməninin səviyyələri, taksomoniyası və mərhələlərini təhlil etməlidir. Lakin kolleclərin innovasiyalı idarə edilməsi, fəaliyyət növünün rəngarəngliyini, buraya daxil olan elementlərin qarşılıqlı əlaqəsini, innovasiyanın tətbiq olunduğu konkret tarixi şəraiti nəzərə almadan heç vaxt real görünə bilməz.

İnnovasiyalı fəaliyyət təcrübi, elmi, təşkilatı-pedaqoji struktur elementlərindən ibarətdir. Birinci, təcrübə elementi idarəetmədən başqa, həm də pedaqoqların təlim sistemində daha çox müraciət etdikləri pedaqoji metod və priyomlarda ibarətdir. Bu üsullar bəzən öz xarakterindən, səmərəliliyindən asılı olaraq innovativ təlim də adlandırılırlar; yəni innovasiyanın məzmunu səhvən yalnız təcrübə ilə məhdudlaşdırlır. Lakin burada vacib bir məqamın vurğulanması mühüm hesab edilir: bu təcrübə işdə vaxtı azaltmaqla, səmərəliliyə xidmət edirmi, yoxsa sadəcə təcrübədən ibarətdir? Odur ki, innovativ təlimin məzmun komponentlərinə bu elementlərin daxil olması ilə onun yeni keyfiyyət halına gətirilməsi üzərində iş prosesləri, dəstəklənməsi, geniş ölçüdə tətbiqi və digər mərhələlər yalnız sadəcə pedaqoji təcrübə ilə eyniləşdirilə bilməz.

İdarəetmə elmi tədqiqatla sıx surətdə bağlıdır, çünki o bir sıra elmi və nəzəri vəsilələrdən, məsələn, gələcək fəaliyyətin planlaşdırılması, kollec işçilərinin emosional durumunun qiymətləndirilməsi, idarəetmədə tətbiq etdikləri diferensial metodların güclü və zəif tərəflərini, ictimai rəy və fikirlərin təhlilini və digər aspektləri nəzərə almaqla reallaşdırılır. Yəni, kolleclərin innovasiyalı idarə edilməsi - sistemli və kompozit elementlərdən təşkil olunmuş mürəkkəb bir strukturdur. İnnovativ idarəetmənin təlim keyfiyyətinə təsir parametrlərinin müəyyən edilməsi, həm də təlim hədəfləri ilə sıx surətdə bağlıdır. Lakin seçilmiş hədəflər müxtəlif olduğundan bu sahədə irəli sürülən modellər də öz məzmununa görə fərqlidir. İnnovasiyaların növlərinin çoxluğu elmi və nəzəri ədəbiyyatda onların reallaşdırılması modellərinin də çoxalmasına səbəb olmuşdur. Məsələn, hazırda həm elm-texnologiya-cəmiyyət, həm də elm-texnologiya-innovasiya triadalarına həsr edilmiş tədqiqat nəticələrinin modelləşdirilməsi nəzəri cəhətdən daha çox təhlil olunur. Bu nəzəriyyələrin bir qismi innovativ idarəetmənin mərhələlərinə aid olan (a) düzxətli modelləri və (b) digərləri

isə bütöv sistemli və ya vahid modelləri əhatə edir.

Məlumdur ki, zamanla innovasiyalar daim meydana gəlir və zaman keçdikcə hansısa bir mərhələdə tətbiqdən kənarlaşdırılır. Lakin elə hallar da mövcuddur ki, bəzən bir müəllif zamanla eyni modelin bir çox versiyasını yaradır və inkişaf etdirir. Beləliklə, bu çoxluq həm də bu modellərin genişmiqyaslı tənqidinə geniş yollar açır. Deməli, innovasiyalı idarəetmənin dinamik bir proses olması, onun təlimlə olan daimi əlaqəsi daha yeni modellərinin yaranmasına da səbəb olur. Belə imkanları müəyyənləşdirmək üçün müəyyən bir çərçivə və ya model olmadan, kollecləri ümumiyyətlə təsadüfi əsaslarla idarə etmək və bunun dəqiq izahını vermək də xeyli çətindir, əks təqdirdə, kolleclər də daxil olmaqla, bütün təhsil müəssisələri, gəlirliliyi və məhsuldarlığı artırmaq və keyfiyyətli təhsil vermək üçün daha rentabelli yolları əldən vermiş ola bilərlər. Deməli, böhranlar əvvəllər imkansız görünən yenilikləri də qəflətən innovativ və qaçılmaz edə bilər. Odur ki, öz növlərinə görə kolleclərin idarəçiliyində tətbiq olunan bütün modellər həm planlı innovativ idarəetmə modelləri və həm də böhranlı vəziyyətdə kollec idarəçiliyi modelləri kimi nəzərə alınmalıdır. Bunlar arasındakı fərq böhranların xarakterindən asılı olaraq təhsilin keyfiyyətinə müxtəlif formalarda təsir etmək imkanları ilə bağlıdır.

Təhsil verənlər, təhsil siyasəti aparanlar, işəgötürənlər və investorlar təcili olaraq böhranlar yaşayan dünyanın necə görünməsi və bu dünyanı reallığa çevirmək üçün təhsil müəssisələrinin hansı rol oynamaları barədə düşünməlidirlər. Məhz ən azı elə bu səbəblərdən, bu gün kolleclərdə yeni dəyişilmiş şəraitə uyğun olaraq kollec həyatının innovasiyalı idarə olunmasını həyata keçirmək üçün daha yeni yolların müəyyən edilməsinə ehtiyac daha çoxdur.

Heç kimə sirr deyildir ki, hazırda həm ölkəmizdə, həm də xaricdə böhranlı vəziyyətdə kolleclərin innovativ idarəetmə praktikası o qədər də yüksək deyildir və burada böhran səbəbinin özü və onun təsir dairəsinin nəzərə alınması da mühüm cəhətləri təşkil edir. Biz hesab edirik ki, təklif olunan bu model birdəfəlik və həmişəlik bir sxem deyildir və zaman keçdikcə, böhranların müxtəlifliyi və tələblərin dəyişməsi ilə daha yeni modellərin meydana gəlməsi istisna deyildir. Göründüyü kimi, böhranlı vəziyyətdə kollec həyatının idarəçiliyi normal vəziyyətdə olan innovativ idarəetmədən xeyli fərqlənir.

Bu modeldə böhranlı vəziyyətin idarəçiliyi xüsusi tədbirlər planını – dəyişilmiş strategiyaların işlənib dərhal dövriyyəyə daxil edilməsini ehtiva edir. Bunlar isə öz növbəsində önləyici, çəkindirici hazırlıqların işlənməsi mexanizmini, nəzarət üçün istifadə edilən metodda daha çox yenilikçilik silsiləsinin yaradılmasını, normal vəziyyətin və ya ona maksimum yaxın olan şəraitin qurulması üçün müxtəlif taktiki gedişlərin həyata keçirilməsini təmin edən metodlar kompleksini özündə birləşdirir. Böhranlı vəziyyətdə innovativ idarəetmədə xarici faktorlar yeni psixologiya və düşüncə tərzi yaradır və bu psixologiyanı biz çox vaxt real təlim keyfiyyətinin kvazi göstəricisi kimi qeyd etməli oluruq.

**Problemin aktuallığı**. Pedaqojiyönlü kolleclərin innovativ idarə edilməsinin, inkişafının əsas komponentləri çevikliyə və dəyişkənliyə malik olan vahid, sinergetik xarakterli (stimullaşdırıcı, məzmunlu, idarə olunan, texnoloji, qiymətləndirilən və effektli)

model işlənib hazırlanmış və sınaqdan keçirilmişdir**.**

**Problemin praktik əhəmiyyəti**. Tədqiqatın praktiki əhəmiyyəti ondan ibarətdir ki, tədqiqatdan alınan nəticələr və tövsiyələr bu tip müəssisələrin innovativ idarə olunması üçün öz işlərini səmərəli qurmaqda pedaqojiyönlü kollec müəllimlərinə, akademik qrupun kuratorlarına, tərbiyə və sosial işlər üzrə direktor müavinlərinə, tələbə şurasına, gənclər təşkilatına və kollec həyatı ilə bağlı olan digər ictimai qurumlara əməli köməklik göstərəcəkdir.

**Problemin elmi yeniliyi**. ondan ibarətdir ki, əsərdə irəli sürülən fikirlər, müddəalar pedaqogika elmini yeni ideyalarla zənginləşdirəcək, bu baxımdan idarəetmənin məzmun, metod və iş sistemini elmi əsaslar üzərində innovativ qurulmasına imkan verəcək, bütövlükdə təhsil sisteminin idarə edilməsi nəzəriyyəsinə müəyyən töhfə verən orta ixtisas təhsili müəssisələrinin idarəetmə nəzəriyyəsini elmi cəhətdən işlənmiş modellə müasirləşdirəcəkdir.

**Ədəbiyyat:**


1. Abbasov, A.N. Pedaqogika. / A.N. Abbasov, H.Ə. Əlizadə. – Bakı: Renessans, – 2000. – 202 s.
2. Axundova, S.H. Pedaqoji innovasiyaların növləri və onların tətbiqi xüsusiyyətləri // Azərbaycan məktəbi jurnalı, - Bakı. – 2019, №1, – s. 57-67. - 199 s.
3. Cəbrayılova, F.A. Pedaqoji təmayüllü orta ixtisas məktəblərində tələbələrin peşə səriştəliliyinin inkişafının sosioloji təhlili. Təlimin sosioloji problemləri / F.A. Cəbrayılova. – Bakı: Mütərcim, – 2011. – səh.245-306.
4. Əliyev, P.B. Ümumtəhsil məktəblərin idarə edilməsinin modernləşdirilməsi / P.B. Əliyev. – Bakı: Şahib-MB MMC, – 2017. – 292 s.
5. Əlizadə, H.Ə. Kəşf yolu ilə öyrənmə və ya qeyri-standart dərs haqqında düşünərkən. Yaradıcı keyfiyyət yaradıcı dərslərdə müəllimin kəşf etdiyi yeni texnologiyalar çərçivəsində formalaşır // Azərbaycan müəllimi, –Bakı: –2021, 25 iyun. – s.11.
6. Əmrahlı, L.Ş. Psixoloji treninq. Psixoqamma praktik psixologiya üzrə resurs mərkəzi. / L.Ş. Əmrahlı, elmi red. M.S. Əliyev. – Bakı: Adiloğlu, – 2020. – 180 s.
7. İbrahimov, F.N. Ümumtəhsilin keyfiyyətinin idarə olunmasının bəzi aspektləri barədə. // Azərbaycan Respublikası Təhsil İnstitutu. Elmi əsərlər, – Bakı: - 2019, cild 86, №1. – s.44-50.
8. İlyasov, N.İ. Müəllim peşəkarlığı və pedaqoji səriştəliliyin müasir problemləri. Monoqrafiya. / N.İ. İlyasov, − Bakı: Elm və təhsil, − 2018. – 208 s.



**E-mail:** axundova.sevda@adpk.edu.az



**Redaksiyaya daxil olub:** 01.05.2024

*UOT 373.2.*

***Şərafət Aram qızı Baxışova***
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin*
*Məktəbəqədər təhsilin pedaqogikası kafedrasının dosenti,*
*pedaqogika elmləri doktoru*
***Orcid**: https://orcid=0000-0002-7848-2068*

## MƏKTƏBƏQƏDƏR PEDAQOGİKANIN AKTUAL PROBLEMLƏRİ

***Шарафат Арам гызы Бахышева***
*доцент кафедры педагогики дошкольного образования Азербайджанского Государственного Педагогического Университета,*
*доктор педагогических наук*

## АКТУАЛЬНЫЕ ПРОБЛЕМЫ ДОШКОЛЬНОЙ ПЕДАГОГИКИ

***Sharafat Aram Bakhishova***
*associate professor of the department of Pedagogy ofpPreschool education at the Azerbaijan State Pedagogical University,*
*doctor of sciences in pedagogy*

## ACTUAL PROBLEMS OF PRESCHOOL PEDAGOGY

**Xülasə.** Məktəbəqədər pedaqogika zəngin inkişaf tarixinə malikdir: 20-ci əsrdə çoxlu fundamental və tətbiqi problemlər öyrənilmiş, tədqiq edilmişdir. Çoxsaylı nəzəri, eksperimental və tətbiqi tədqiqatlar məktəbəqədər pedaqogikanın nəzəri əsaslarını formalaşdırmağa, məktəbəqədər yaşlı uşaqların tərbiyəsi və inkişafının öyrənilməsi metod və texnologiyalarını əsaslandırmağa imkan vermişdir. Bununla belə, hələ də bir sıra aktual problemlər və tədqiqat üçün perspektivli istiqamətlər mövcuddur. Onların yaranmasının əsas səbəbləri əsasən ictimai həyatın siyasi, iqtisadi və digər sahələrində baş verən dəyişikliklərdir. Yeni sosial-iqtisadi şəraitə keçid məktəbəqədər təhsil sisteminə yeni baxışı, uşaqlıq dövrünün xüsusiyyətlərini və uşağın sosial münasibətlər sistemindəki mövqeyini əhəmiyyətli dərəcədə dəyişdirir.

Məktəbəqədər pedaqogikanın inkişafı uşaqların təlim və tərbiyəsi üçün yeni texnologiyaların, müasir həyat şəraiti üçün məqbul olan və məktəbəqədər təhsil təcrübəsini zənginləşdirə bilən konsepsiyaların daha da inkişaf etdirilməsi zərurətini tələb edir.

***Açar sözlər:*** *Məktəbəqədər pedaqogika, perspektiv istiqamətlər, prioritetlər, inkişaf, məktəbəqədər təhsil, səriştəlilik.*

**Резюме.** Дошкольная педагогика имеет богатую историю развития: в XX веке было изучено и исследовано большое количество фундаментальных и прикладных проблем. Многочисленные теоретические, экспериментальные и прикладные исследования позволили сформировать теоретические основы дошкольной педагогики, обосновать методы и технологии исследования обучения и развития детей дошкольного возраста. Однако существует еще ряд актуальных проблем и перспективных направлений исследований. Основными причинами их возникновения являются главным образом изменения в политической, экономической и других сферах общественной жизни. Переход к новым социально-экономическим условиям существенно меняет новый взгляд на

систему дошкольного образования, особенности детства и положение ребенка в системе общественных отношений.

Развитие дошкольной педагогики требует необходимости дальнейшей разработки новых технологий обучения и воспитания детей, концепций, приемлемых для современных условий жизни и способных обогатить опыт дошкольного образования.

***Ключевые слова****: Дошкольная педагогика, приоритеты перспективных направлений, развитие, дошкольное образование, компетентность*

**Summary.** Preschool pedagogy has a rich history of development: in the 20 th century, a large number of fundamental and applied problems were studied and investigated. Numerous theoretical, experimental and applied researches have made it possible to form the theoretical foundations of preschool pedagogy, to justify the methods and technologies of studying the education and development of children in the preschool age. However, there are still a number of current problems and promising directions for research. The main reasons for their emergence are mainly changes in the political, economic and other spheres of social life. The transition to new socio-economic conditions significantly changes the new view of the preschool education system, the characteristics of childhood and the child's position in the system of social relations.

The development of preschool pedagogy requires the need to further develop new technologies for training and education of children, concepts that are acceptable for modern life conditions and can enrich the experience of preschool education.

***Key words:*** *preschool pedagogy, promising directions priorities, the development, preschool education, competency*

Məktəbəqədər pedaqogika – uşaqların doğulduğu andan məktəbə qəbuluna qədər uşaqların inkişaf xüsusiyyətlərini və qanunauyğunluqlarını öyrənən, həmçinin məktəbəqədər təhsil müəssisələrində təlim-tərbiyənin üsullarını, vasitələrini işləyib hazırlayan və həyata keçirən elmdir.

Məktəbəqədər pedaqogikanın əsas vəzifəsi uşağın həyatının bütün sahələrində onun ahəngdar inkişafını təmin etməkdir: fiziki, əqli, emosional, sosial və intellektual. Məktəbəqədər pedaqogika həm də uşaqların müstəqillik, sosiallaşma, yaradıcı təfəkkür və ünsiyyət bacarıqlarının inkişafına yönəlib. Məktəbəqədər pedaqogika sonrakı təhsilin əsasını təşkil edir və uşağın şəxsiyyətinin formalaşmasına təsir göstərir.

Məktəbəqədər pedaqogikanın inkişafı, müasir həyat şəraiti üçün məqbul olan və öz növbəsində məktəbəqədər təhsil təcrübəsini zənginləşdirə biləcək konsepsiyaların, uşaqların təlim və tərbiyəsi üçün yeni texnologiyaların daha da inkişaf etdirilməsi ehtiyacını tələb edir. Məktəbəqədər təhsil sistemində baş verən müasir proseslər müxtəlifdir və mühüm vəzifələrin həllinə yönəldilmişdir.

Məktəbəqədər sahə üzrə aparılan tədqiqatlar məktəbəqədər pedaqogikanın nəzəri əsaslarını formalaşdırmağa, məktəbəqədər yaşlı uşaqların təlim-tərbiyəsi və inkişafının öyrənilməsinin metod və texnologiyalarını əsaslandırmağa imkan vermişdir. Lakin bununla belə, hələ də bir sıra aktual problemlər və tədqiqat üçün perspektivli istiqamətlər mövcuddur. Onların yaranmasının əsas səbəbləri əsasən ictimai həyatın siyasi, iqtisadi və digər sahələrində baş verən dəyişikliklərdir.

Məktəbəqədər pedaqogika məktəbəqədər təhsil müəssisələrində pedaqoji prosesin səmərəli qurulması üçün müxtəlif problemləri araşdırır, tədqiq edir. Araşdırılan bu problemlər məktəbəqədər təhsilin bütün sahələrini – təlim-tərbiyə, pedaqoji ünsiyyət, ailə ilə əməkdaşlıq, məktə-

bəqədər müəssisənin idarəedilməsi, ona rəhbərlik və s. məsələləri əhatə edir. Onun həll etdiyi konkret vəzifələri nəzərdən keçirək:

1. Böyüməkdə olan gələcək nəslin əsil İnsan kimi formalaşdırılması, hərtərəfli inkişaf etdirilməsi və cəmiyyət üçün kreativ düşüncəyə malik vətəndaş hazırlanmasında məktəbəqədər təhsilin məzmununun müasir tələblər səviyyəsində yenidən işlənilməsi və bu əsasda şəxsiyyət hazırlığını modelləşdirmək.

2. Yetişməkdə olan gələcək nəsil üçün zəruri olan bilik, bacarıq və vərdişlərin uşaqlar tərəfindən şüurlu və dərindən dərk edilərək tətbiqinin səmərəli yollarını müəyyənləşdirmək.

3. Məktəbəqədər təhsildə təlimin səmərəli formalarını, onların imkanlarını, təşkili qaydalarını, uşaqların müstəqil qərar qəbul etməsi, fikir söyləməsi, sərbəst düşüncəyə malik olmasının inkişaf etdirilməsi yollarını tədqiq etmək.

4. Uşaqların təlim-tərbiyəsi prosesinin mahiyyətini, məzmun, vasitə, üsul və formalarını müəyyənləşdirmək əsasında məktəbəqədər təhsilin məzmununu təkmilləşdirmək.

5. Səriştəli və peşəkar tərbiyəçi-müəllimin modelini işləyib hazırlamaq.

6. Məktəbəqədər təhsil müəssisələrinə rəhbərlik məsələlərini öyrənmək, idarəetmə strukturlarının optimal forma və metodlarını müəyyənləşdirmək.

7. Məktəbəqədər təhsil ilə bağlı aktual problemlərin həll edilməsi.

Beləliklə, belə nəticə hasil olur ki, məktəbəqədər pedaqogika qarşısında duran problemlərin araşdırılması məktəbəqədər təhsilin keyfiyyətinin yüksəldilməsinə və dünya təhsil sisteminə inteqrasiyasına imkan verəcəkdir.

Məktəbəqədər pedaqogikanın bir elm kimi formalaşması və inkişafı konsepsiyaların, məktəbəqədər və ailə şəraitində uşaqlarla işləmək üçün yeni texnologiyaların və məktəbəqədər təhsil təcrübəsini zənginləşdirən metodik tövsiyələrin işlənib hazırlanması ehtiyacı ilə əlaqələndirilir.

Məktəbəqədər pedaqogikanın kateqoriyalarına pedaqoji proses, tərbiyə, təlim, öyrənmə, şəxsiyyətin inkişafı və s. daxildir. Onların mahiyyətini qısaca nəzərdən keçirək.

Professor N. Kazımova [3] görə, pedaqoji proses cəmiyyətin yaranması və inkişafı ilə birlikdə yaranmış və inkişaf etmişdir. Pedaqoji proses vahiddir və onun tərkib hissələri olan təlim, tərbiyə də vahid qanunlar əsasında həyata keçirilir. İndiyə kimi təlim və tərbiyə üçün ayrı-ayrılıqda təsnif olunan qanunlar heç də parçalanmış halda mövcud deyil, pedaqoji prosesin vahid qanunlarıdır.

Uşaq şəxsiyyətinin formalaşması üçün təhsildə demokratikləşdirmə və humanistləşdirmə əsas şərtlərdən ibarətdir. Bunun əsas mahiyyətini isə təlim-tərbiyə işində qurucu, yaradıcı və dəyişdirici pedaqoji və sosial-mədəni əhəmiyyət daşıyan prinsiplər, başqa sözlə desək, düzgün səviyyəli aparılan pedaqoji proses təşkil edir.

Pedaqoji proses dinamik sistem kimi öz quruluşuna və quruluş elementlərinə (komponentlərə) malikdir. Onlardan məqsəd, məzmun, fəaliyyət və nəticə elementlərini (komponentlərini) göstərmək olar. Məqsəd komponenti pedaqoji prosesin məqsəd və vəzifələrini, məzmun komponenti ümumi məqsəddən, habelə konkret vəzifədən tələb olunan mənanı, fəaliyyət komponenti müəllim və şagirdlərin əməkdaşlığını və qarşılıqlı təsiri, prosesin təşkili və idarə olunmasını, nəhayət, nəticə komponenti qarşıya qoyulan məqsəd və vəzifələrin

nəticələrini və onların səmərəliliyini əks etdirir”[2].

İnsanın sosiallaşdırılmasında tərbiyə mühüm yer tutur. Tərbiyə pedaqogikanın əsas amillərindən biridir. Tərbiyə şüurlu insan cəmiyyəti yarandığı gündən mövcud olmuşdur. Professor Əliheydər Həşimov yazır ki, tərbiyənin tarixi insan cəmiyyətinin tarixi qədər qədimdir. İnsan cəmiyyətinin inkişafı tarixində elə bir dövr olmamışdır ki, orada yaşlı nəslin nümayəndələri gənc nəslin tərbiyəsi qayğısına qalmamış olsun. Lakin müxtəlif zamanlarda, müxtəlif inkişaf mərhələlərində tərbiyənin mahiyyəti, xarakteri və uşaqlara aşılanması yolları eyni səviyyədə olmamışdır. Ən qədim zamanlarda tərbiyə işi sadə, tərbiyə məsələləri üzrə bilik, bacarıq və baxışlar məhdud olmuşdur… Zaman keçdikcə insanların biliyi və həyat təcrübəsi artır, dünyagörüşü genişlənirdi. Tərbiyə sahəsindəki təcrübə və biliklər də artır, zənginləşirdi. Onu sələflərdən xələflərə vermək işi xüsusi ustalıq, qayda-qanun, adət və ənənə tələb edirdi.

Təhsilin və tərbiyənin milli zəmində yeniləşdirilməsi üçün gənc nəslin mənəvi sağlamlığına, milli dəyərlər əsasında tərbiyə olunmasına, daxilən təmizlənməsinə diqqət artırılmalıdır. Müasir mərhələdə təhsilin məzmununu milli psixologiyanın, milli tərbiyənin, milli mədəniyyətin əsasında yaratmaq mümkündür. Uşaqların düzgün tərbiyə edilməsi onlarda dəyərli insani keyfiyyətlərin yaranmasına gətirib çıxarır. Bizim vəzifəmiz imanlı, mənəvi dəyərlərinə bağlı, vətənpərvər bir nəsil yetişdirməkdir. Çünki imanı, namusu, canı və malı mühafizə vətəni mühafizə ilə mümkündür. Ölkəmizdə dövlət müstəqilliyini və demokratiyanı inkişaf etdirmək, daha da möhkəmləndirmək üçün milli və bəşəri dəyərlərə istinad edən ideoloji konsepsiya yaranır və gənc nəslin tərbiyəsi bu zəmində təşkil edilir.

Respublikamızın hər bir vətəndaşının keyfiyyətli təhsil almasının təmin edilməsi və keyfiyyətin yüksəldilməsi üçün şəraitin yaradılması dövlətin təhsil siyasətinin prioritet istiqamətlərindən biridir. Hazırda təhsilin məzmununun və təlimin təşkilinə dair tələblərin yenilənməsi və müasirləşdirilməsi istiqamətində ciddi işlər həyata keçirilir.

Prioritet yanaşmalar – sistemli, mədəni, aksioloji və s. tələblər nəzərə alınmaqla innovativ məktəbəqədər təhsilin müxtəlif modellərinin tətbiqinə yanaşmaları genişləndirməyə imkan verir və uşaqlarla təlim-tərbiyə işinin təşkilində yeniliklərin tətbiqini daha da genişləndirir.

Cəmiyyətimizdə baş verən müasir proseslər (siyasi, iqtisadi, hüquqi və s.), yeni sosial-iqtisadi həyat şəraitinə keçid məktəbəqədər təhsil sisteminə baxışı, insan münasibətləri sistemində uşaqlıq dövrünün vəziyyətini əhəmiyyətli dərəcədə dəyişmişdir.

Azərbaycan Respublikası Prezidentinin 2013-cü il 24 oktyabr tarixli sərəncamı ilə təsdiq edilmiş “Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası”nda birinci strateji istiqamət səriştəyə əsaslanan şəxsiyyətyönlü təhsil məzmununun yaradılmasına yönəlmişdir. Sərəncamın başlıca məqsədi müasir və innovativ təhsil sisteminin təkmilləşdirilməsi üçün geniş imkanlar açmaqla, onun iqtisadi inkişafın mühüm amilinə çevrilməsini təmin etməkdir [1].

Azərbaycan təhsil sistemi dünya təhsil sisteminə intensiv surətdə inteqrasiya edir və bu, hər şeydən əvvəl, təhsilin məzmununun dünya standartlarına uyğunlaşdırılmasında, təhsilin məzmununun elm və texnikanın tərəqqisinə müvafiq

qurulmasında, pedaqoji prosesdə müasir informasiya-kommunikasiya texnologiyalarından istifadə olunmasında özünü göstərir. Təhsil prosesinə yaradıcı münasibət, yeni pedaqoji təfəkkürün formalaşmasına, müasir tələblərə cavab verən mütərəqqi metodların yaradılmasına şərait yaradır. Təhsil sistemi açıq bloklar sisteminə daxil olduğundan Azərbaycan Respublikası öz təhsil sisteminin inkişaf prioritetlərini dünyada gedən proseslərə inteqrasiya olunmaqla müəyyənləşdirir. İnteqrasiya prosesi – respublikamızda aparılan təhsil islahatlarının ana xəttini təşkil edir.

Təhsildə yeni yanaşmanın mahiyyəti ondan ibarətdir ki, təlim uşaqların yaddaşının təkcə yeni elmi biliklərlə zənginləşdirilməsinə deyil, təfəkkürün, şəxsi keyfiyyət və qabiliyyətlərin inkişaf etdirilməsinə, həyat üçün zəruri olan bacarıqların qazanılmasına yönəldilməlidir. Uşaqyönlüyə, nəticəyönlüyə, şəxsiyyətyönlüyə, tələbyönlüyə əsaslanmalıdır. Ənənəvi təhsil biliyə yönəlmişdisə, indi səriştəlilik əsas məqsəd kimi qarşıda durur. Yüksək intellektual hazırlığa malik olan, qazandığı biliklərdən istifadə etməyi bacaran, milli-mənəvi və ümumbəşəri dəyərlərə yiyələnmiş, fəal, şüurlu, məsuliyyətli, rəqabətədözümlü, konstruktiv şəxsiyyətin yetişdirilməsi müasir təhsilimizin əsas mahiyyət və məqsədini təşkil edir.

Məktəbəqədər təhsilə yeni yanaşmaları üzə çıxaran konsepsiyaların yaradılması məktəbəqədər pedaqogikanın elm kimi formalaşması və inkişafını əhəmiyyətli dərəcədə daha da zənginləşdirir, məktəbəqədər yaş dövründə uşaqların inkişaf imkanları haqqında fikirləri genişləndirir, həmçinin pedaqoji işin səmərəli tərəfi, yalnız təlim və tərbiyəni deyil, həm də məktəbəqədər yaşlı uşaqların təhsilini əhatə edir.

Hazırda məktəbəqədər təhsilin müasir sistemi dinamizm prinsipləri üzərində qurulur, müxtəlif iş formaları, cəmiyyətin və şəxsiyyətin tələblərinin nəzərə alınması, uşaqlar üçün müasir tələblərə uyğun təlim-tərbiyə müəssisələrinin yaradılması ilə səciyyələnir.

Başlıca pedaqoji kateqoriyalardan biri də təlimdir. Əsas pedaqoji anlayışlardan biri olan təlim məlum olduğu kimi iki tərəfli pedaqoji prosesdir. Başqa sözlə desək, təlim öyrədənlə öyrənənin qarşılıqlı fəaliyyətidir. Bu fəaliyyət prosesi məktəbəqədər təhsil müəssisələrində də cərəyan edir.

Biliklərə yiyələnərkən uşaqlar yalnız onun məzmununu mənimsəmir, həm də öz idraki imkanlarını, maraq və meylini inkişaf etdirirlər. Fikirləşməyi, axtarmağı, yaratmağı öyrənirlər. Bu baxımdan tədris fəaliyyəti şəxsiyyətin formalaşmasının ən mühüm mənbəyidir. Hazırda yeni qurulan təhsildə idraki inkişafın parametrlərini nəzərə almaq, ona imkan və şərait yaratmaq əsas amil hesab edilir. Təhsili bilavasitə inkişafyönlü bir proses kimi stimullaşdırmaq əsas vəzifəyə çevrilir.

“Təlim - müəllim və şagirdlərin xüsusi təşkil olunmuş prosesdə məqsədli və idarəolunan qarşılıqlı fəaliyyətidir”[5].

Təlim prosesində uşaqların bilik və bacarıq əldə etmələri nə qədər önəmlidirsə, onların bir şəxsiyyət kimi formalaşdırılması da bir o qədər əhəmiyyətlidir. Təlimin qarşısında duran vəzifənin müvəffəqiyyətlə həll edilməsi üçün birinci növbədə o inkişafetdirici olmalıdır. İnkişafetdirmə uşağın ümumi intellekt səviyyəsinin formalaşması ilə bağlıdır. İnkişafetdirici təlim yalnız o halda produktiv təfəkkürün inkişafını təmin edir ki, öyrənənin bütün idrak

prosesləri aktiv fəaliyyətə cəlb edilsin. İnkişafetdirici təlim yalnız güclü və orta səviyyəli uşaqların deyil, zəiflərin də yaradıcılıq potensialını nəzərə çarpacaq dərəcədə artırır [4].

Məlumdur ki, şəxsi səy və müstəqil axtarıcılıq qabiliyyəti olmadan insanın inkişafı mümkün deyil. İnkişaf müxtəlif fəaliyyət növlərində aktiv surətdə iştirak etməklə, bacarıq və qabiliyyətlərə yiyələnmək prosesində baş verir.

B.B. Zankovski yazırdı: "Uşaq şəxsiyyət olmağa o vaxt başlayır ki, o, öz-özünü dərk edir, yavaş-yavaş inkişaf edir və ətrafdakı hər şeyi özündə toplayır. Elə bir zaman gəlir ki, uşaq özünü digərlərindən ayırmağı öyrənir və nəinki başqaları üçün, eləcə də özü üçün şəxsiyyət olmağa başlayır"[7].

İnkişaf da pedaqogikanın əsas kateqoriyalarından biridir. İnkişaf daxili və xarici ziddiyyətlərin mübarizəsi nəticəsində şəxsiyyətin fiziki, əqli və mənəvi imkanlarının kəmiyyət və keyfiyyət dəyişilməsi (irəliləməsi) prosesidir. Qeyd etmək lazımdır ki, ziddiyyətlər özlüyündə inkişafı ləngidən amillərdəndir. İnkişafda özünü göstərən ziddiyyətlər yalnız dəf edildiyi, aradan qaldırıldığı təqdirdə hərəkətverici qüvvəyə çevrilir.

İnkişafın təbiət və cəmiyyətdə baş verdiyini, tərəqqi ilə səciyyələndiyini göstərən R.N. Mursaqulova, N.M. Rüstəmova qeyd edirlər ki, "İnkişaf dedikdə, fiziki, psixi və sosial inkişaf nəzərdə tutulur. İnkişaf uşaqlarda anadan olduğu gündən əmələ gələn kəmiyyət və keyfiyyət dəyişiklikləridir" [6].

Hazırda təhsil sisteminin qarşısına qoyulmuş əsas vəzifə təhsilin dünyəvilik, sivillik, ümumbəşəri mövqedən yeniləşdirilməsi və uşaq şəxsiyyətinin formalaşdırılmasıdır. Çünki cəmiyyət üçün təkcə savadlı, bilikli insanlar deyil, zəngin mənəvi keyfiyyətlərə malik şəxsiyyətlər yetişdirilməlidir.

Məktəbəqədər dövrdə uşağa biliklərin öyrədilməsi və onlarda bacarıqların formalaşdırılması birdənbirə baş verən proses deyil. Bu, uzun tarixi təcrübənin nəticəsidir. Onun inkişafının hər bir sonrakı mərhələsi keçmişin ideyalarının tənqidi şəkildə mənimsənilməsini nəzərdə tutur. Lakin tarixə nəzər salsaq görərik ki, heç də bütün dövrlər məktəbəqədər pedaqogika nəzəriyyəsi üçün eyni dərəcədə səmərəli olmayıbdır. Məktəbəqədər təhsilin bütün aspektləri, onun məzmunu, forma və metodları hər dövrün tələblərinə uyğun nəzərdən keçirilmişdir. Bütün dövrlərdə uşağın passivliyini və pedaqoji laqeydliyini istisna edən, onun fəallığını və təşəbbüskarlığını stimullaşdıran yeni təhsil sistemləri yaradılmışdır. Bəzi qabaqcıl məktəbəqədər təhsil müəssisələrində çalışan tərbiyəçi-müəllimlər pedaqoji prosesi uşaqların ümumi inkişafı üçün şərait təmin edəcək şəkildə qurmağa cəhd etmişlər. Hər dövrdə pedaqoq və psixoloqlar məktəbəqədər yaşlı uşağın inkişafında, onun şəxsiyyət kimi formalaşmasında tərbiyə və təlimin təsiri ilə bağlı tədqiqatlar aparmış və təkliflər irəli sürmüşlər ki, bunun əsasında məktəbəqədər pedaqogika nəzəriyyəsi inkişaf etmişdir.

**Problemin aktuallığı.** Məktəbəqədər pedaqogikanın inkişafı uşaqların təlim və tərbiyəsi üçün yeni texnologiyaların, müasir həyat şəraiti üçün məqbul olan və məktəbəqədər təhsil təcrübəsini zənginləşdirə bilən konsepsiyaların daha da inkişaf etdirilməsi zərurətini tələb edir.

**Problemin elmi yeniliyi**. Məktəbəqədər təhsilə yeni yanaşmaları üzə çıxaran konsepsiyaların yaradılması məktəbəqədər pedaqogikanın elm kimi formalaşması və inkişafını əhəmiyyətli dərəcədə daha da zənginləşdirir.

**Problemin praktik əhəmiyyəti və tətbiqi.** Məqalədən məktəbəqədər təhsil

müəssisələrində çalışan mütəxəssislər faydalana bilər.

**Ədəbiyyat:**

1. Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası. // "Azərbaycan müəllimi", 2013. 25 oktyabr, № 41
2. Qasımova, L.N. Pedaqogika: Mühazirə kursu. / L.N. Qasımova, R.M. Mahmudova. - Bakı: BDU-nun nəşri, -2003. -535 s.
3. Kazımov, N. Məktəb pedaqogikası. Dərslik. / N. Kazımov. -Bakı:2011, -458 s.
4. Baxışova, Ş.A. Məktəbəqədər təhsil: konseptual problemlər. Monoqrafiya. / Ş.A. Baxışova. -Bakı: Elm və təhsil. -2015. -306 s.
5. Paşayev, Ə. Pedaqogika. / Ə. Paşayev, F. Rüstəmov. -Bakı: Çaşıoğlu, -2002. s. 18.
6. Mursaqulova, R.N. Məktəbəqədər pedaqogika: Dərslik. / R.N. Mursaqulova N.M. Rüstəmova. -Bakı: ADPU nəşriyyatı, -2012. -163 s.
7. Занковский, Б.Б "Психология детства". / Б.Б. Занковский. -М.: Наука, -1996.

**E-mail:** *sharafat_baxishova1960@mail.ru*
**Redaksiyaya daxil olub:** 23.02.2024

*UOT 373.2*

***Yeganə Cahangir qızı Sadıqova***
*Bakı şəhəri Xətai rayonu 207 nömrəli uşaq bağçasının müdiri*
***Orcid:*** *https://orcid.org/0009-0007-3724-7452*

## MƏKTƏBƏQƏDƏR TƏHSİL MÜƏSSİSƏLƏRİNİN İDARƏ OLUNMASININ BƏZİ MƏSƏLƏLƏRİ

***Егяна Джахангир гызы Садыгова***
*заведующая детским садом №207 Хатаинского района гор. Баку*

## НЕКОТОРЫЕ ВОПРОСЫ УПРАВЛЕНИЯ ДОШКОЛЬНЫМИ ОБРАЗОВАТЕЛЬНЫМИ УЧРЕЖДЕНИЯМИ

***Yegane Cahanqir Sadigova***
*head of kindergarten No. 207 of Khatai district of Baku city*

## SOME ISSUES OF MANAGING A PRESCHOOL EDUCATIONAL INSTITUTION

**Xülasə.** Məqalədə məktəbəqədər təhsil müəssisələrinin sistemli dəyişikliklər aparıldığı müasir şəraitdə idarə edilməsi məsələlərinə toxunulur. Məqalədə məktəbəqədər təhsil sistemində dəyişikliklər kontekstində müəssisələrin fəaliyyətinin və inkişafının idarə edilməsinin səmərəliliyinin artırılması məsələsinə toxunulur. Məqalədə göstərilir ki, bir çox pedaqoji kollektivlərin uşaq tərbiyəsində əldə etdiyi uğurun komponentləri arasında həm pedaqoqların yüksək peşəkarlığı, həm də məqsədlərinə çatmaqda hərəkətlərinin ardıcıllığı, həm də tərbiyəçi-müəllim kollektivinə xas olan təhsil imkanlarından istifadə mühüm rol oynayır. Tərbiyəçi-müəllimin peşəkar səriştəsi onun yaxın mühitindən, ilk növbədə uşaq bağçasındakı psixoloji iqlimdən asılı olaraq müxtəlif yollarla təzahür edir və həyata keçirilir.

Həmçinin, fəaliyyət və inkişaf prosesləri arasında əlaqə yalnız fasiləsiz təhsil şəraitində, inkişaf proqramını və təhsil proqramını tərtib edənlərin, eləcə də təhsil proqramının həyata keçirilməsini təmin edən digər pedaqoji heyətin peşəkar səriştəsinin artırılması şəraitində mümkündür. Təklif olunan nəticələr təhsil müəssisəsinin rəhbərləri və məktəbəqədər müəssisənin metodistləri tərəfindən istifadə edilə bilər.

***Açar sözlər:*** *idarəetmə, yenilik, inkişaf, təhsil proqramı, fərdi yanaşma, müasir tələblər, məktəbəqədər yaşlı uşaqlar.*

**Резюме.** В статье рассматриваются вопросы управления дошкольными образовательными учреждениями в современных условиях, когда происходят системные изменения. В статье исследуется вопрос повышения эффективности управления деятельностью и развитием учреждений в условиях изменений в системе дошкольного образования. Среди слагаемых успеха, достигнутого многими педагогическими коллективами в образовании детей, важную роль играют как высокий профессионализм воспитателей и последовательность их действий в достижении поставленных целей, так и использование образовательных возможностей, присущих педагогическому коллективу. Профессиональная компетентность воспитателя-педагога проявляется и реализуется по-разному в зависимости от его непосредственного окружения, прежде всего психологического климата в детском саду. Также связь деятельности и процессов развития возможна только в условиях непрерывного образования, повышения профессиональной компетентности разработчиков программы развития и образовательной программы, а также подготовки педагогических кадров, обеспечивающих реализацию образовательной программы. Предложенные результаты могут быть использованы руководителями образовательных учреждений и методистами дошкольных учреждений.

***Ключевые слова:*** *управление, инновации, развитие, образовательная программа, индивидуальный подход, современные требования, дети дошкольного возраста*

**Summary:** The article addresses the management issues of preschool educational institutions in modern conditions where systematic changes are being made. The article addresses the issue of increasing the efficiency of management of the activity and development of enterprises in the context of changes in the preschool education system. The article shows that Among the components of the success achieved by many pedagogical collectives in child education, both the high professionalism of educators and the consistency of their actions in achieving their goals, as well as the use of educational opportunities specific to the educator-teacher collective, play an important role. The professional competence of the educator-teacher is manifested and implemented in different ways depending on his immediate environment, primarily the psychological climate in the kindergarten. Also, the connection between activity and development processes is possible only in the conditions of continuous education, in the conditions of increasing the professional competence of the developers of the development program and the educational program, as well as other pedagogical staff who ensure the implementation of the educational program. The proposed results can be used by heads of educational institutions and methodologists of preschool institutions.

***Key words:*** *management, innovation, development, educational program, individual approach, modern requirements, preschool children.*

Məktəbəqədər təhsil sistemində şəraitə uyğun olmaqla ölkədə idarəetmənin müasir sosial-iqtisadi təşəkkül tapmış yeni iqtisadi müna-

sibətlər zəminində təkmilləşdirilməsinə, məktəbəqədər təhsil müəssisələrində pedaqoji prosesin mütəmadi yeniləşməsinə ehtiyac var. Bu yeniləşmə pedaqoji prosesin tamlığını təmin edən elmi yolların innovasiya axtarışları ilə və sistem kimi baxılan pedaqoji fəaliyyətlə bağlıdır. Müasir mərhələdə məktəbəqədər müəssisələrdə pedaqoji prosesin bütövlükdə elmi əsaslar üzərində qurulması, onun bütün çətinliyinin dərk edilməsi, uşaq şəxsiyyətinin formalaşması kimi məsələyə diqqətin yönəldilməsi ən vacib vəzifələrdəndir. Məhz buna görə də məktəbəqədər təhsil müəssisələrində pedaqoji prosesin idarəolunması səmərəliliyinin artması məktəbəqədər təhsil sisteminin yenidənqurulmasında əsas məsələ kimi meydana çıxır. (4)

Müasir mərhələdə məktəbəqədər təhsilin əsas vəzifələrindən biri uşaq şəxsiyyətinin inkişafı, onun müstəqilliyinin, qətiyyətinin, təşəbbüskarlığının və məsuliyyətinin formalaşması üçün əlverişli şəraitin yaradılmasıdır. Buna görə də, məktəbəqədər təhsil müəssisəsinin qarşısında duran ən mühüm vəzifə - məktəbəqədər yaşlı uşaqların sosial və kommunikativ səriştəliliyinin inkişafı üçün psixo-pedaqoji, maddi-texniki, yaradıcı və peşəkar kadr şəraitini təşkil etmək ön plana çıxır. Məlumdur ki, respublikamızda təhsilin digər sahələrində olduğu kimi, məktəbəqədər təhsil sahəsində həm məzmun, həm strategiya, həm də idarəetmədə innovasiyalar tətbiq edilir. Rəhbər innovasiya prosesi iştirakçılarının fərdi keyfiyyətlərinin məcmusunu, onların peşəkarlıq səviyyəsinin göstəricilərini, təşkilatçılıq səriştəliliyinin, bacarıqlarının məcmusunu, yeni fəaliyyət növlərinə, əlavə təlim yüklərinə psixoloji hazırlığını nəzərə almalıdır.

İdarəetmədə yeniliklər-müəssisə rəhbərinin planlaşdırma, təşkilatçılıq və bir sıra digər idarəetmə funksiyalarını daha yüksək səviyyəyə qaldırmağa, məktəbəqədər təhsil müəssisələrində özünüidarəetmə orqanlarının inkişafına töhfə verməyə, məktəbəqədər təhsil müəssisələrinin təşkilati strukturunu təkmilləşdirməyə və s., tərbiyəçi-müəllimlərin peşəkar və yaradıcı inkişafına töhfə verən əlverişli şərait yaradan təhsil prosesinin keyfiyyətinə müsbət təsir göstərir və məktəbəqədər təhsil müəssisəsinin rəqabət qabiliyyətini artırır. İdarəetmədə innovasiyaların tətbiqi çərçivəsində məktəbəqədər təhsil müəssisələri ilə ailələr arasında qarşılıqlı əlaqənin səmərəliliyinin qiymətləndirilməsi təhsil prosesinin diqqət mərkəzində olan, onun sistemli, məzmunlu və təşkilati xarakterini, metodların elmi əsaslılığı və təhsilə təsirin müasir texnologiyalarından istifadə, təhsilin əhatə dairəsinin genişliyi, təhsil müəssisəsini əhatə edən ümumiləşdirilmiş qiymətləndirmə göstəricilərindən istifadə etməklə aparılmalıdır.

Məktəbəqədər təhsilin məzmununun əsasları uşaq inkişafının əsas istiqamətlərinə uyğun gələn inkişaf sahələri ilə müəyyən edilir. Uşaq inkişafı və uşaq bağçasının işinin bütün istiqamətləri arasında balansı qorumaq üçün məktəbəqədər təhsilin dövlət standartlarında aşağıdakı inkişaf sahələri tətbiq edilib.

1. Fiziki inkişaf, sağlamlıq və təhlükəsizlik;
2. İdrakın inkişafı;
3. Sosial-emosional inkişaf;
4. Estetik-yaradıcı inkişaf. (3)

Təcrübə göstərir ki, məktəbəqədər təhsil müəssisələrində pedaqoji prosesin təşkilinin keyfiyyəti idarəetmə fəaliyyətindən asılıdır.

Məktəbəqədər təhsil müəssisələrində pedaqoji prosesin idarə olunmasında özünü göstərən bir çox uyğunsuzluqların həll olunması ilə əlaqədar bir sıra çətinliklər mövcuddur:

- pedaqoji prosesin idarə olunması əsaslarının nəzəri-metodiki işləmələrinin kifayət qədər olmaması və məktəbəqədər pedaqoji təcrübənin onun idarəetmə mexanizmində əsaslandırılmasının tələbatı;
- idarəetmə əməyində şablon hərəkətlərin, stereotipləşmiş fəaliyyətin mövcudluğu və məktəbəqədər təhsil müəssisələrində pedaqoji prosesə yaradıcı yanaşma axtarışlarının vacibliyi;
- pedaqoji prosesin məzmununun yeniləşməsinin vacibliyi və idarəetmə fəaliyyətinin qeyri-mütəşəkkil xarakteri;
- rəhbərliyin idarəetmədə səriştəliliyinin çatışmazlığı. (6)

Bu gün məktəbəqədər təhsil müəssisələrinin fəaliyyətinin yenidən formalaşdırılmasına iqtisadi, sosial-mədəni, normativ-hüquqi şərtlər kompleksi imkan yaradır. Bununla əlaqədar olaraq təhsil müəssisələrinin idarəetmə sistemi çərçivəsində cəmiyyətdə baş verənləri özündə əks etdirən yeni sistem vacibdir. Məktəbəqədər təhsildə keyfiyyətin təmin edilməsi dövrümüzün ən aktual məsələsidir. "Keyfiyyət" məktəbəqədər yaşlı uşaqların təhsil prosesinin subyektlərinin tələbləri və standartları, ehtiyacları və gözləntiləri əsasında məktəbəqədər təhsil müəssisələrinin proqnozlaşdırılan məqsədləri üçün təhsil xüsusiyyətləri və nəticələrinin məcmusudur. Hazırda təhsilin keyfiyyəti üç aspektdə nəzərdən keçirilir: *şəraitin keyfiyyəti, təlim prosesinin keyfiyyəti və alınmış nəticələrin keyfiyyəti.* (5)

Məktəbəqədər təhsil sahəsində çalışan mütəxəssislər proqramların, onlar üçün metodik vəsaitlərin, ənənəvi və qeyri-ənənəvi texnologiyaların mövcudluğu haqqında daim yenilənən məlumata ehtiyac duyurlar və onların sayı durmadan artır. Məktəbəqədər təhsil şəraitinin keyfiyyətinin idarə edilməsi problemi məktəbəqədər təhsil müəssisələri rəhbərlərinin aktual məsələlərlə bağlı idarəetmə mədəniyyətinin yüksəldilməsini tələb edir. Belə ki:

- məktəbəqədər təhsil müəssisələrində kadrların inkişafı və təlim prosesinin keyfiyyətinin yüksəldilməsi üçün şəraitin yaradılması;
- metodiki xidmətlərin keyfiyyətinin yüksəldilməsi;
- məqsəd və nəticələr əsasında keyfiyyətin idarə edilməsi texnologiyasının mənimsənilməsi;
- pedaqoji heyətin işin sosial-psixoloji metodlarını mənimsəməsi və idarəetmə səriştəliliyinin artırılması;
- təhsilin keyfiyyətinin kəmiyyətcə qiymətləndirilməsi üsullarına yiyələnmək.

Təlim prosesinin keyfiyyətinin idarə olunmasının ikinci yolu onun komponentlərinə - hədəfə, məzmuna, fəaliyyətə və nəticəliliyə təsir göstərməkdən ibarətdir. Məktəbəqədər təhsilin nəticələrinin keyfiyyəti uşaqların inkişafı, tərbiyə və təhsilinin təkcə cari və yekun deyil, həm də uzunmüddətli nəticələrinin qiymətləndirilməsinə təsir göstərməlidir. Təhsilin keyfiyyətinə tərbiyəçi-müəllimlərin potensial imkanlarını və onların yaradıcılıq qabiliyyətlərini stimullaşdıran innovativ fəaliyyətlər təsir göstərir. Bu gün məktəbəqədər təhsildə təhsilin keyfiyyətinə nəzarət edən müəyyən sistemlər inkişaf etmişdir. Bunlardan biri məktəbəqədər təhsil müəssisələrində çalışan pedaqoji heyətin sertifikasıya imtahanlarından keçməsinin planlaşdırılmasıdır.

Bütün idarəetmə sisteminin son nəticəyə yönəldilməsi təkcə

məktəbəqədər təhsil müəssisəsi rəhbərinin xüsusi motivasiya və məqsədyönlülüyünü deyil, həm də informasiya təminatı, pedaqoji təhlil, planlaşdırma, təşkilatçılıq, nəzarət və bütün fəaliyyətin tənzimlənməsinə yeni yanaşmanı nəzərdə tutur.

Məktəbəqədər təhsil müəssisəsinin təhsil fəaliyyətinin keyfiyyətinin qiymətləndirilməsi obyektləri təhsil proqramının özü və onun həyata keçirilməsi şərtləri ola bilər. Bu quraşdırma ilə əlaqədar olaraq keyfiyyətə nəzarət problemi yaranır. Bağçaya gələn uşaq keyfiyyətli məktəbəqədər təhsil almalıdır. (1)

Məktəbəqədər təhsil müəssisələrinin idarə edilməsində müəssisə rəhbərinin aparıcı istiqaməti öz konsepsiyasının, peşəkar düşüncəsinin və fərdi idarəetmə tərzinin olmasıdır. Rəhbərin iş tərzi, onun işgüzar və şəxsi keyfiyyətləri məktəbəqədər təhsil müəssisəsinin iş rejiminə və qaydasına, fəaliyyətinin səmərəliliyinə və keyfiyyətinə əhəmiyyətli dərəcədə təsir göstərir. Buna görə də, məktəbəqədər təhsil müəssisəsində idarəetmə şəxsi prinsipə əsaslanmalıdır, çünki idarəetmə fəaliyyətinin yekun nəticələrinə rəhbərin özü deyil, kollektivin bütün üzvləri nail olur.

Məktəbəqədər təhsil müəssisəsi rəhbərinin peşəkarlıq dərəcəsi onun idarəetmə fəaliyyəti ilə müəyyən edilir. İdarəetmə fəaliyyətində hər bir müəssisə rəhbəri rəsmi vəzifələri ona xas olan müəyyən üslubda yerinə yetirir. Rəhbərlik üslubu, rəhbərin kollektivi ona tapşırılan vəzifələri fəal və yaradıcı şəkildə yerinə yetirməyə təşviq etdiyi üsullarda və tabeliyində olanların fəaliyyətinin nəticələrinə necə nəzarət etməsində ifadə olunur. Beləliklə, xoşagələn bir üslub rəhbərin və idarəetmə orqanının fəaliyyət keyfiyyətinin, onların səmərəli idarəetmə fəaliyyətini təmin etmək qabiliyyətinin xarakterik bir xüsusiyyəti ola bilər. Həmçinin müəyyən münasibətlər normalarının yaranmasına səbəb olan kollektivdə xüsusi bir atmosfer yaratmaq və bərpa etmək olar. Buna görə idarəetmə üslubunda iki komponent fərqlənir - bunlar tabeliyində olanlara və onlarla münasibətlərə, habelə rəhbərlərə və həmkarlara təsir göstərmə üsullarıdır.

Kollektivi idarə etmədən ab-hava yaratmaq mümkün deyil. Bu idarəetməyə aşağıdakılar: münasibətlərin tənzimlənməsi və səmərəli özünüidarənin yaradılması yolu ilə müəyyən dəyər oriyentasiyaların dəstəklənməsi, xoş emosional mühitin formalaşdırılması və kollektivdə hər bir fərdə fərdi yanaşma daxildir. Bir çox pedaqoji kollektivlərin məktəbəqədər yaşlı uşaqların təlim-tərbiyəsində əldə etdiyi uğurun komponentləri arasında həm tərbiyəçi-müəllimlərin yüksək peşəkarlığı, həm də məqsədlərinə çatmaqda fəaliyyətlərinin ardıcıllığı, həm də pedaqoji kollektivə xas olan təhsil imkanlarından istifadə mühüm rol oynayır.

Kollektivdə şəxsiyyətlərarası münasibətlərin xüsusi növü formalaşır. Bu münasibətlər dəyəryönlü birlik, öz müqəddəratını təyinetmə, kollektiv üzvlərinin bir-birinə münasibətdə yüksək özünəməxsusluğu, şəxsiyyətlərarası seçimlər üçün motivasiyanın sosial cəhətdən dəyərli xarakteri, təyinatda obyektivlik və s. birgə fəaliyyətin nəticələrinə görə məsuliyyəti qəbul etməkdir. Pedaqoji heyətin idarə edilməsindəki çətinlik müəyyən bir problemi həll edərkən fəaliyyət subyektlərinin yaşadığı gərginlikdir. Sosial və psixoloji problemlərin həlli isə ən çətindir. Məktəbəqədər təhsil müəssisəsinin rəhbəri üçün ən çətin məsələ tərbiyəçi-müəllimlərin işində:

- nizam-intizamın və mütəşəkkilliyin təmin edilməsi;

-pedaqoji kollektivdə ictimai rəyin formalaşdırılması problemlərinin həlli;

-tərbiyəçi-müəllimlərin bir-birinin çatışmazlıqlarına sağlam tənqidi münasibəti;

-onlara yaradıcılıqla işləmək ehtiyacını aşılamaq, öz peşəkarlıqlarını daim təkmilləşdirmək; onların əmək fəaliyyətinin stimullaşdırılması;

-kollektivin birliyi, onun daxilində münasibətlərin tənzimlənməsi; tərbiyəçi-müəllimlərin yaradıcılıq qabiliyyətlərinin monitorinqi və aşkarlanması;

-rəhbərin öz fəaliyyətinin təşkili, vaxtın özünütəhsilə və istirahətə vaxt ayıracaq şəkildə bölüşdürülməsi. Buna görə də rəhbərlik üslubu idarəetmə metodu ilə sıx bağlıdır və qarşılıqlı əlaqədədir.

Düzgün rəhbərlik edilən kollektivdə əmək fəaliyyətinin səmərəliliyi artır, tərbiyəçi-müəllimləri ümumi məqsəd, hər şeydən əvvəl kollektivə həvalə edilmiş vəzifəyə görə məsuliyyət hissi birləşdirir. Əmək payına görə şəxsi borcun dərk edilməsi kollektiv məsuliyyət borcundan irəli gəlir. İdarəetmədə yeni yanaşmalara ehtiyac var, onlar məktəbəqədər təhsil müəssisəsini fəaliyyət göstərən müəssisədən inkişaf etməkdə olan müəssisəyə keçirə biləcək hərəkətverici qüvvəyə çevrilirlər. Adaptiv təhsil mühitinin və müvafiq idarəetmə texnologiyasının form-alaşdırılması işin təşkilinə aydın metodoloji yanaşmalar tələb edir.

**Problemin aktuallığı.** Məktəbəqədər təhsil müəssisələrinin idarə olunmasında yeni yanaşmaların - tətbiqi məktəbəqədər təhsilin keyfiyyətinin yüksəlməsi üçün ən mühüm meyarlardan biridir. Pedaqoji cəhətdən düzgün qurulmuş idarəetmə məktəbəqədər yaşlı uşaqlarla təlim-tərbiyə işinin səmərəliliyini optimallaşdırmaq mümkündür.

**Problemin yeniliyi.** Düzgün rəhbərlik edilən kollektivdə əmək fəaliyyətinin səmərəliliyi artır, tərbiyəçi-müəllimləri ümumi məqsəd, hər şeydən əvvəl kollektivə həvalə edilmiş vəzifəyə görə məsuliyyət hissi birləşdirir. İdarəetmədə yeniliklərin tətbiqi şəxsiyyətin sistemli keyfiyyəti, sərbəstlik, müstəqillik, yaradıcılıq, ətraf mühitlə konstruktiv qarşılıqlı əlaqə, motivasiya və aktivləşdirməni mənimsəməklə özünü tənzimləmək istəyi kimi atributiv xüsusiyyətləri və subyektivliyin istiqamətləndirici funksiyalarını özündə cəmləşdirir.

**Problemin praktik əhəmiyyəti.** Məktəbəqədər təhsil müəssisələrində innovativ idarəetmə tərbiyəçi-müəllimlərin səmərəli fəaliyyət imkanlarının reallaşdırılmasını müəyyən edir.

**Ədəbiyyat:**

1. "Məktəbəqədər təhsil haqqında" Azərbaycan Respublikasının Qanunu // Bakı şəhəri, 14 aprel, 2017.
2. "Azərbaycan Respublikasında məktəbəqədər təhsilin dövlət standartı". Azərbaycan Respublikasının Nazirlər Kabinetinin qərarı // 08 avqust, -2019.
3. Məktəbəqədər təhsil proqramı (kurikulumu) // Bakı şəhəri, 11 aprel, -2022.
4. Cəfərova L. Məktəbəqədər təhsil müəssisəsinin idarəedilməsi və pedaqoji prosesin təşkili. // Kurikulum jurn, cild 15, № 3, -2022. -s. 24-28
5. Cəfərova L. Məktəbəqədər təhsil: Tərbiyəçi-müəllimlər və metodistlər üçün stolüstü kitab. / L. Cəfərova. -Bakı, Letterpress nəşriyyat evi, -2019. -316 s.
6. Cəfərova L.K. Məktəbəqədər müəssisə rəhbərinin stolüstü kitabı. / L. Cəfərova. -Bakı: ARTİ, -2015, -351 səh.
7. Белая, К. Ю. Заведующий детским садом / К. Ю. Белая. — М., 1997.

*UOT 373.2*


***Arzu Əli qızı Əhmədova***
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin*
*Məktəbəqədər təhsilin pedaqogikası kafedrasının müəllimi*
***Orcid**: https://orcid.org/0009-0005-2408-7600*


## MƏKTƏBƏQƏDƏR YAŞLI UŞAQLARLA MƏŞĞƏLƏLƏRDƏ YENİ İNTERAKTİV TEXNOLOGİYALARDAN İSTİFADƏ İMKANLARI


***Арзу Али гызы Ахмедова***
*преподаватель кафедры Педагогики дошкольного образования*
*Азербайджанского Государственного Педагогического Университета*


## ВОЗМОЖНОСТИ ИСПОЛЬЗОВАНИЯ НОВЫХ ИНТЕРАКТИВНЫХ ТЕХНОЛОГИЙ НА ЗАНЯТИЯХ С ДЕТЬМИ ДОШКОЛЬНОГО ВОЗРАСТА


***Arzu Ali Ahmedova***
*teacher of the department of Pedagogy of the preschool education at*
*Azerbaijan State Pedagogical University*


## POSSIBILITIES OF USING NEW INTERACTIVE TECHNOLOGIES IN CLASSES WİTH PRESCHOOL CHİLDREN


**Xülasə.** Elmi məqalədə məktəbəqədər yaşlı uşaqlarla aparılan təlim prosesində interaktiv metod və texnologiyalardan istifadə imkanları üzə çıxarılmışdır. İnnovativliyi və tamlığı qorunmaqla istifadə olunan iş formaları və üsulları göstərilmişdir.


***Açar sözlər:*** *təlim, interaktiv, metod, texnologiya, tərbiyəçi, məktəbəqədər*



**Резюме.** В научной статье раскрыты возможности использования интерактивных методов и технологий в процессе обучения с детьми дошкольного возраста. Показаны используемые формы и методы работы при сохранении их инновационности и завершенности.


***Ключевые слова:*** *обучение, интерактивный, метод, технология, воспитатель, дошкольное учреждение*



**Summary.** The scientific article revealed the possibilities of using interactive methods and technologies in the learning process with preschool children. The work forms and methods used are shown while preserving their innovativeness and completeness.


***Keywords:*** *training, interactive, method, technology, educator, preschool*


Şəxsiyyətyönlü təhsil sistemində pedaqoji prosesin mərkəzində dayanan tərbiyəçi-müəllim və uşaqların funksiyaları dəyişir. Onların fəaliyyəti əvvəlcədən müəyyən olunmuş nəticələrə əsasən qurulur. Tərbiyəçi-müəllim təlim prosesində yeni texnologiyaların içərisindən ən münasibini seçir. Bu texnologiyaların müəyyən olunmasında tərbiyəçi-müəllim və uşaq şəx-siyyəti təlimin aparıcı subyekti kimi çıxış edir. Müna-

sibətlər “subyekt – subyekt” formuluna uyğun qurulur. Bu zaman uşaqlar öz təfəkkürünün, düşüncəsinin, tərbiyəçi-müəllimlər isə uşağın inkişafı üçün şəraitin təşkilatçısı olur. Tərbiyəçi-müəllimlərin rəhbərlik funksiyası dəyişir, informasiya vermək sahəsindəki fəaliyyəti məhdudlaşır. O daha çox qrup şəraitində təlim fəaliyyətini əlaqələndirən, istiqamətləndirən məsləhətçi kimi uşaqların müstəqil idraki fəaliyyətini, yaradıcılığını təşkil edən subyektə çevrilir, uşaqlar isə müstəqil axtarışlar aparmağa, yaradıcı fəaliyyət göstərməyə sövq edilir.

Təlim mühiti planlaşdırılmış və plansız şəkildə fəaliyyət göstərə bilər. Planlaşdırılmış fəaliyyət günün əsas hissəsini təşkil edir. Rejim anlarında təlimdən kənar fəaliyyətlərə məktəbəqədər yaşlı uşaqlar üçün zəruri olan stabillik və tanışlıq, öyrənmə fəaliyyətləri məzmun sahələrinə və böyüklər tərəfindən planlaşdırılan xüsusi məqsədlərə malikdir. Planlaşdırılmış və plansız fəaliyyətlər üçün xoş, təhlükəsiz mühit, sağlam, təmiz, isti və stimullaşdırıcı sahələr yaradılır ki, bu sahələrdə tənqidi düşüncə bacarıqları, müxtəliflik, çoxmədəniyyətlilik kimi məsələlər formalaşdırılır və öyrənmə bacarıqlarının genişləndirilməsi və formalaşdırılması üçün şərait yaradılır. Mühit “üçüncü tərbiyəçi” hesab edilir.

-Açıq havada və qrup otağında inkişaf və təlim mühiti bütün yaşlar üçün eyni dərəcədə əhəmiyyətlidir;

-Açıq havada uşaqlar üçün tədqiqat aparmaq, kəşflər etmək və öyrənmək üçün mühüm imkanlar mövcuddur;

- Açıq havada mühitin “canlılığı’ və “bənzərsizliyi” hər gün uşaqların təcrübədən keçirə biləcəkləri yeni kəşflərlə zəngin olur;

-Uşaqların hərəkət etmələri (qaçmaları, tullanmaları, dırmanmaları, oynamaları) üçün yerlər; çevik və uşaqların asanlıqla idarə edə bildikləri materiallarla təminat; estetik cəhətdən gözəl olan yerlər, heyvanlar üçün yerlər, uşaqların asanlıqla ünsiyyət yarada bilmələri üçün şərait, təsviri fəaliyyət üçün yerlər nəzərdə tutulmalıdır. Erkən dövrdə mühit inkişafetdirici xarakter daşımalıdır. “İnkişafetdirici və dəstəkləyici mühitin yaradılması üçün məktəbəqədər təhsil müəssisələrində müxtəlif guşələr (fəaliyyət mərkəzləri) təşkil olunur. Bu guşələr inkişaf sahələri üzrə qurulur və uşağın inkişafını təmin edir.”(1, s.35)

Müəllifin dediyi fəaliyyət mərkəzləri (guşələr) dedikdə, əsasən, aşağıdakılar nəzərdə tutulur:

1.riyaziyyat guşəsi;

2.kitab guşəsi;

3.stolüstü oyunlar guşəsi;

4.elm guşəsi;

5.təsviri fəaliyyət guşəsi;

6.qum və su guşəsi və s.

1-3 yaşlı uşaqlarla öyrənmə prosesində onun innovativliyi və tamlığı qorunmaqla aşağıdakı iş formalarından istifadə edilir:

-fərdi

-yarimqruplarla

-kollektiv

3-6 yaşa qədər uşaqlarla iş formaları fərdi, cütlərlə, qruplarla və kollektiv iş nəzərdə tutulur. Pedaqoji proses ətraf mühitin və əşya aləminin fəal tədqiqi prosesində uşağın bütün inkişaf sahələri üzrə fəaliyyət növlərinin kompleks inkişafı üzərində qurulmalıdır. Müxtəlif fəaliyyət növlərinin qarşılıqlı əlaqəsi şəraitində təşkil olunmalıdır. Pedaqoji proses şəxsiyyətyönümlülük prinsipi əsasında təşkil olunmalıdır. 3-6 yaşa qədər uşaqlarla iş zamanı təhsildə yaradıcı düşünən, müstəqil mühakimə yürüdə bilən demokratik dünyagörüşünə malik şəxsiyyət formalaşdırmaqda geniş imkanları olan əqli hücum, tap-tap-

maca, nağıletmə, müzakirə, şaxələndirmə (klaster), problemli vəziyyət, oyunlar, suallar, söz assosiasiyası kimi təlim üsullarından istifadə edildikdə müsbət nəticələr əldə etmək mümkündür.

İnteraktiv təlim metodları uşaqlarda inam hissi tərbiyə etməklə yanaşı, yaradılan mühit onlarda tədqiqatçılığa, təşəbbüskarlığa maraq oyadır. Bundan başqa interaktiv təlim metodları uşaqlarda əməkdaşlıq etməyi, başqalarını dinləməyi, təhlil etmək qabiliyyətini inkişaf etdirir. Məşğələ zamanı interaktiv təlim metodlarının tətbiqi uşaqlarda müstəqil düşünmək, sərbəst rəy söyləmək, hər hansı problem barədə başqalarının fikrinə münasibət bildirmək, çoxluğun qərarını qəbul etmək kimi keyfiyyətlər yaradır. İnteraktiv təlim zamanı daha çox istifadə olunan qruplarla iş formasıdır. Bu iş forması uşaqlarda problemin birgə həll ediməsini, müstəqil işləməyi, əməkdaşlıq etməyi və sərbəst fikir söyləmək kimi keyfiyyətləri tərbiyə edir. Tərbiyəçi uşaqları onların bilik səviyyəsini, xarakterini nəzərə alaraq 4-5 nəfərdən ibarət kiçik qruplara ayırır. Qabiliyyətli uşaqlar rəqib kimi deyil, qrupun lideri kimi qəbul olunurlar.

Qruplarda iş aşağıdakı qaydada aparılır:

1.Hər bir qrup bir masanın arxasında əyləşir;

2.Uşaqlar gördükləri işi təqdim etmək üçün öz aralarında 1 nəfəri lider seçirlər. Həmin uşaq qrupun işinin nəticəsini təqdim edir.

3. Tərbiyəçi mövzu ilə əlaqədar tapşırıq verir, işin görülməsi müddətini müəyyən edir.

4. Tərbiyəçi qruplar arasında gəzib, işləri müşahidə edir, suallara cavab verir, ehtiyac olduqda əlavə məlumat verir.

5. Müəyyən edilmiş müddət başa çatdıqdan sonra tərbiyəçi işi dayandırır və nəticələri bildirməyi xahiş edir.

6. Tərbiyəçi qrup liderlərinin təqdimatını dinləyib ümumiləşdirir.

Qruplarla iş formasını müxtəlif variantlara ayırmaq olar:

1.Bütün qruplar ümumi mövzu ətrafında müxtəlif materiallarla işləyirlər;

2.Bütün qruplar eyni vaxtda bir tədris materialı üzərində işləyirlər;

3.Eyni material üzərində qruplar növbə ilə işləyirlər.

Müasir təlim texnologiyalarının, interaktiv təlim metodlarının tətbiqi təcrübəsi göstərir ki, bu metodlar uşaqların idrak fəallığının və məntiqi təfəkkürünün inkişafına zəmin yaradır. Bu gün məktəbəqədər təhsil müəssisələrində istifadə olunan interaktiv təlim uşaqlardan çox tərbiyəçidən böyük məharət tələb edir. Tərbiyəçi elə fəal olmalıdır ki, uşaqları istiqamətləndirə bilsin. İnteraktiv təlim metodları bütün məşğələlərdə tətbiq olunduğu kimi sadə riyazi təsəvvürlərin inkişafı məşğələlərində də geniş tətbiq olunur. İnteraktiv təlimin əsas xüsusiyyəti olan problem situasiyanın yaranması riyaziyyat məşğələlərində müxtəlif məsələlərin həllində, əyləncəli, düşündürücü testlərin, inkişafetdirici təlim tapşırıqlarının, hesablamaların aparılmasında məntiqi əyləncəli tapşırıqların yerinə yetirilməsində həyata keçirilir. Sadə riyazi təsəvvürlərin inkişafı məşğələlərində daim problemli suallar olur, uşaqların diqqəti bu sualların həllinə yönəldilir. İnteraktiv təlim məntiqi təfəkkürə əsaslanan təlim metodudur. Riyaziyyat məşğələlərində uşaqların məntiqi təfəkkürü daha yaxşı inkişaf edir. Əşyaları uzunluğuna, eninə görə ölçmək, müqayisə etmək, oxşar olanları qruplaşdırmaq, əşyaları rənginə, formasına, ölçüsünə görə fərqləndirmək kimi verilən

inkişafetdirici tapşırıqlar məntiqi təfəkkürün inkişafına müsbət təsir edir. Kompleks məşğələlərdə verilən idrakı inkişaf etdirən çalışmalar uşaqların fəallığını xeyli artırır. Motivasiyanın yaranması uşaqlara təqdim olunmuş məsələnin həlli yolunu müəyyən etməyə imkan verir. Müqayisə metodu ilə uşaqlar "azdır, çoxdur, bərabərdir, uzundur, qısadır, ucadır, alçaqdır, hündürdür, enlidir, ensizdir, tamdır hissədir" kimi anlayışları öyrənirlər. Uşaqlar əşyaları, həndəsi fiqurları rənginə, ölçüsünə, formasına görə qruplaşdıra bilirlər. İstifadə olunan əqli hücum, beyin həmləsi, yeni mövzunun izahından əlavə çalışmaların yerinə yetirilməsi zamanı tətbiq olunur.

Sadə riyazi təsəvvürlərin inkişafı məşğələlərində əsasən aşağıdakı interaktiv təlim metodlarından istifadə olunur:

Rollu oyunlar. Məktəbəqədər yaşlı uşaqlarda məşğələlərdə istifadə olunan ən fəal təlim metodudur. Rollu oyunlardan, demək olar ki, bütün məşğələlərdə istifadə etmək olar. Rolları ifa edən uşaqlar yaşlıları təqlid edirlər . Məs. "Gəlinciyə məktəb forması alaq" oyununda uşaqların bəziləri satıcı, bəziləri isə alıcı rolunda oynayırlar və s. Əqli hücum. Bu metoddan məşğələlərdə uşaqların fəallığının artırılması, konkret problemin həlli və qoyulan suala cavabın axtarılması zamanı tez-tez istifadə edilir. Əqli hücum daha çox yeni mövzunun öyrənilməsinə başlanarkən giriş müsahibəsində motivasiya yaradılarkən və ümumiləşdirmə aparılarkən təşkil olunur. Söz assosiasiyaları. Bu metodu tətbiq edərkən məşğələnin əvvəlində tərbiyəçi öyrəniləcək mövzu ilə əlaqədar bir söz deyir, sonra uşaqlara tapşırır ki, sözü eşitdikdə ağıllarına gələn sözləri dərhal desinlər. Məs. Hündür-uşaqların cavabı: bina, ağac, ev, hasar və s. Klaster (şaxələndirmə). Hər hansı bir mövzu və ya fikrin müəyyən qədər açılmasına, uşaqların bu mövzu ətrafında geniş, sərbəst düşünmələrinə şərait yaradan metoddur. Məs. Həndəsi fiqurlar.

Beləliklə, sadə riyazi təsəvvürlərin inkişafı məşğələlərində tətbiq olunan interaktiv təlim metodları 5 yaşlıların keyfiyyətli məktəb təlimində müvəffəqiyyət qazanmalarına imkan verir.

**Problemin aktuallığı.** Bütün məktəbəqədər yaşlı uşaqların məktəbəqədər təhsillə əhatə edilməsi, onların hərtərəfli inkişafı, uşaqların idraki fəallığı, inteqrativ və interaktiv təlimi, tərbiyəçi-müəllimin səriştəliliyi, təhsilin demokratik prinsiplərlə idarə edilməsi qanunauyğunluqları şəxsiyyətyönlü təhsil sistemində pedaqoji prosesin mərkəzində dayanan tərbiyəçi-müəllim və uşaqların funksiyalarını dəyişir. Bu baxımdan elmi məqalə aktualdır.

**Problemin elmi yeniliyi** ondan ibarətdir ki, burada məktəbəqədər yaşlı uşaqların hərtərəfli inkişafına, bütün həyatı boyu ona lazım olacaq sosial kompetensiyaların formalaşmasına təsir edən yeni texnologiyalar, bu texnologiyaları həyata keçirməkdən ötrü bizə lazım olan üsul və metodlar üzə çıxarılmışdır.

**Problemin praktik əhəmiyyəti** ondan ibarətdir ki, irəli sürülən ideya və təkliflərdən məktəbəqədər təhsil işçiləri, pedaqoq-müəllimlər və məktəbəqədər tərbiyə sahəsində təhsil alan bakalavrlar bəhrələnə bilərlər.

**Ədəbiyyat:**

1. Ağayev, Ş.O. Məktəbəqədər kurikulum: nəzəriyyə və təcrübə./ Ş.Q. Ağayev, S.S. Rzayeva. - Bakı: MM-S, -2017. -304 s
2. Həsənova, P. Məktəbəqədər təhsildə pedaqoji ünsiyyət və onun müasir problemləri // -Bakı: Məktəbəqədər və ibtidai təhsil, -2022. № 2, -s. 48-56.

3. Məktəbəqədər təhsilin kurikulumu ( Layihə). / -Bakı: Azərbaycan Respublikası Təhsil İnstitutu,- 2017. - 117s.
4. Nəzərov, A. Müasir təlim texnologiyaları (Mühazirə xülasələri). Dərs vəsaiti. / A. Nəzərov. -Bakı: ADPU, -2012, -103 s.
5. Uşağınızın dünyasına bələdsinizmi? / tərt. Ed. B. Mikayıllı. -Bakı: -2008.- 46 s.

**E-mail:** arzu.ahmadova880@gmail.com
**Redaksiyaya daxil olub:** 23.04.2024

***Nurlana Anəs qızı Maqsudova***
*Şamaxı Avropa liseyinin ibtidai sinif müəllimi*
***Orcid**: 0009-0009-9880-7171*


# KİÇİK YAŞLI MƏKTƏBLİLƏRDƏ FƏAL ÖYRƏNMƏ ZAMANI ÖZÜNƏİNAM HİSSİNİN FORMALAŞDIRILMASI


***Нурлана Анас гызы Магсудова***
*учитель начальных классов*
*Шемахинского Европейского лицея*


# ФОРМИРОВАНИЕ ЧУВСТВА УВЕРЕННОСТИ В СЕБЕ В ПРОЦЕССЕ АКТИВНОГО ОБУЧЕНИЯ У ШКОЛЬНИКОВ МЛАДШЕГО ВОЗРАСТА


***Nurlana Anas Magsudova,***
*primary school teacher of Shamakhi European Lyceum*


# FORMING A SENSE OF SELF-CONFIDENCE DURING ACTIVE LEARNING IN YOUNG SCHOOLCHILDREN


**Xülasə.** Bu məqalədə kiçik yaşlı məktəblilərdə təlim prosesi zamanı özünəinam hissinin formalaşmasına mane ola biləcək amillərdən, onların aradan qaldırılması yollarından bəhs olunur. Bu problemin aradan qaldırılması üçün praktik müəllim olaraq hansı məqamlara diqqət edilməli və şagirdlərə necə dəstək olunmasından söz açılır.



***Açar sözlər:** fəal təlim, özünəinam hissi, təfəkkür məktəbi.*



**Резюме.** В данной статье говорится о факторах, которые могут препятствовать формированию уверенности в себе у младших школьников в процессе обучения, и путях их преодоления. Автором отмечается, с целью устранения проблемы, на какие моменты следует обратить внимание педагогу-практику и как поддержать учащихся.



***Ключевые слова**: активное обучение, чувство уверенности, школа мышления*



**Summary.** This article talks about the factors that can prevent the formation of self-confidence in young schoolchildren during the training process, And ways to overcome them. İn order to overcome this problem, what points should be paid attention to as a practical teacher and how to support students.



***Keywords**: active training, self-sufficent, thinking school*


Bu gün dünyada baş verən proseslər – informasiya axını və qloballaşma həyatın bütün sahələrinə nüfuz etməkdədir. Qlobal informasiya sistemi bir tərəfdən dünyada vahid mədəni mühit yaradır, digər tərəfdən isə cəmiyyəti hər tərəfli inkişafa sövq edir.

Qədim yunan filosofu Heraklit demişdir: “Her şey axır, hər şey

dəyişir”. Bu sözlər bu gün də öz aktuallığını qoruyub saxlayır. Günbəgün bizim həyatımız, insanlarla qarşılıqlı münasibətlərimiz dəyişir. Məktəb də gələcəyimizin bir təcəssümü kimi bu dəyişikliklərdən kənarda qalmır.

Cəmiyyətdə yeni keyfiyyətlərin formalaşmasında təhsilin əvəzsiz bir rola malik olduğunu tez-tez eşidirik. Məlumdur ki, Azərbaycan təhsili dünya təhsil sisteminə uyğunlaşdırılır və bu iş uğurla yerinə yetirilməkdədir. Azərbaycan təhsili Azərbaycanın dövlət müstəqilliyinə xidmət edərək savadlı, bilikli, humanist, vətənpərvər, bir sözlə, əsl vətəndaşın yetişdirilməsi işini yerinə yetirir ki, bu işin də mərkəzində biz müəllimlər dayanırıq. Bəli biz müəllimlərin üzərinə bir çox vəzifələr düşür. Mən deyərdim ki, bu vəzifələrdən ən başlıcası müstəqil fikirli , öz şəxsi bacarıqlarını nümayiş etdirə biləcək, inkişaf etmiş, azad vətəndaşlar yetişdirməkdir.

Lakin həqiqəti etiraf etmək lazımdır ki, bəzən biz şagirdləri müəyyən qədər çərçivədə saxlayır, sərbəst fikirlərini ifadə etməsi üçün şərait yaratmırıq. Əgər biz şagirdləri bizim istəklərimizi yerinə yetirməyə məcbur ediriksə, özləri bildiyi kimi hərəkət etməyə və fikirləşməyə imkan vermiriksə, demək, həqiqi demokratik ideyalara çatmaqda özümüz maneələr yaradırıq. Bu gün biz çox böyük qürur və fəxr hissi ilə deyə bilərik ki, dövlətimiz demokratik dəyərlər üzərində qurulmuşdur. Amma belə bir məhdud fəaliyyətlə biz demokratik dövlətin layiqli vətəndaşlarını yetişdirə bilmərik.

Məktəbdə, məktəbdənkənar və sinifdənxaric tədbirlərdə, ən nəhayət, dərs prosesində şagirdlərə elə bir azadlıq və sərbəstlik verilməlidir ki, onlar sabahın qurucuları, idarəedicilərі kimi yetişə bilsinlər. Qeyd olunan keyfiyyətlərə malik olan şəxsiyyətləri yetişdirmək üçün biz müəllimlər şagirdlərdə özünəinam hissi tərbiyə etməliyik. Şagirdlərdə bu xüsusiyyət o zaman formalaşır ki, onlara sinfin təşkilində, öyrənmədə sərbəstlik verilir və onların fikirləri nəzərə alınır. Əlbəttə ki, bu da müəllimlə şagird arasında müsbət mənada mövcud olan əməkdaşlıqdan başlayır.

Dərs prosesində verilən sualları cavablandırarkən, hər hansı bir hadisəyə münasibət bildirərkən və ya mülahizə yürüdərkən “Sən düz demirsən”, “Sən səhv edirsən”, “Bu doğru deyil” və s. kimi ifadələrdən istifadə etməklə müəllim özü də fərqinə varmadan şagirdlərin fəaliyyətini məhdudlaşdırmış olur. Nəticədə şagirdlər özünəinam hissini itirərək növbəti dərslərdə passiv iştirak edirlər. Bu zaman isə şagird fəal öyrənmədən kənarda qalır.

Öyrənmə şagirdin öyrənmə mühitinə aktiv daxil olması ilə başlayır. Öyrənmə prosesi şagirdlərə düşüncələrini və öyrəndiklərini tətbiq etmək, yaradıcı təfəkkürdən istifadə etmək imkanı yaradan bir prosesdir. Öyrənmənin müvəffəqiyyətlə başa çatması üçün əlverişli mühitin və psixoloji təsirin rolu əvəzsizdir. Bu baxımdan yuxarıda qeyd edilən ifadələrin əvəzində müəllim “Başqa cür necə edərdin?”, “Fikrini daha dolğun ifadə et”, “Sən olsaydın, necə hərəkət edərdin?” və s. kimi dəstəkləyici ifadələrdən istifadə etməsi daha düzgün olardı.

Müasir dövrdə aktivlik yeni təhsil metodlarının tələb etdiyi əsas şərtlərdən biridir. Belə ki, öyrənmə prosesi təsirli olduqda işin çox hissəsini şagirdlər yerinə yetirir. Bu prosesdə onlar idraki fəaliyyətə qoşulur, mövzuya uyğun yeni ideyalar düşünür, problemləri həll edir və ən əsası, öyrəndiklərini tətbiq etməyə çalışırlar. Aktiv öyrənmə sürətli olmaqla yanaşı, həm də maraqlı və

səmərəlidir. Bu zaman şagirdlərdə məntiqi təfəkkürlə yanaşı yaradıcı təfəkkür də inkişaf edir.

Müasir dərslərdə fəal öyrənmənin rolu əvəzsizdir. Çünki şəxsiyyət kimi formalaşdırmaq, dünyagörüşünü, həyata baxışlarını daha da zənginləşdirmək və dərinləşdirmək üçün şagird sərbəst düşünməli, fikrini həyatdan, oxuduğu mətnlərdən, nağıllardan, baxdığı filmlərdən nümunələr göstərməklə qarşısındakına çatdırmalıdır. Əlbəttə ki, bütün bu bacarıqların formalaşmasında da biz müəllimlər şagirdlərin qarşısında böyük imkanlar açmalıyıq. Bunun üçün şagirdlərin imkanlarından, onların fəal zehni inkişaflarından bacarıqla istifadə etməliyik. Fəal öyrənmə zamanı şagirdlərin şəxsi təcrübəsinə əsaslanaraq təlim fəaliyyətinə maraq oyatmalı, əməkdaşlıq şəraitində onlarla dialoqa girməli, fikirlərini anlayışla qarşılamalı, lazım gəldikdə istiqamət verməliyik. Əməkdaşlıq təlim mühitini şagird üçün daha əlverişli, fəallaşdırıcı və ruhlandırıcı edir.

Bununla yanaşı təlim prosesində tələbatların ödənilməsi də vacib şərtlərdəndir. Belə ki, hər şeydən əvvəl uşağın fəaliyyəti üçün zəruri olan məzmun düzgün seçilməlidir. Xüsusi təsir vasitəsi xarakteri daşıyan məzmun elə seçilməlidir ki, təlim prosesini həyata keçirən müəllim uşaqdan istədiyi, lazımi cavabı ala bilsin. Bunun üçün təlimdə motivasiyanı inkişaf etdirən və kiçik məktəb yaşlı uşaqların yaş və fərdi-psixoloji xüsusiyyətlərinə uyğun olan vasitələr seçilməlidir. Belə ki, bu cür təsirli vasitələrin seçimi, yerində və düzgün istifadəsi uşaqlarda nəinki təlim bacarıqlarını inkişaf etdirir, həmçinin onların xarakterini və iradəsini də tərbiyələndirir.

Kurikulum islahatının əsasında təlimin təkcə məzmunun deyil, metod və vasitələrinin də əsaslı şəkildə yeniləşdirilməsi dayanır. Təcrübə göstərir ki, pedaqoji dəstəyin müəllimin şagirdə, şagirdin özü-özünə inamı və etibarı zəminində təşkili təhsilalanlarda fəallığın yaranmasına, özünətəhrikə və motivlərə yol açır. Buna görə də müəllimin vaxtında və məzmunlu şəkildə belə metoddan istifadəsi olduqca faydalıdır. Peşəkarlıq və səriştəlilik müəllimin peşə fəaliyyətinin əsasını təşkil edir. Nəzərə alınması vacib olan şərtlərdən biri də cəzaların tətbiqi ilə bağlıdır. Unutmaq olmaz ki, şagirdləri sinif yoldaşlarının yanında və ya digər kənar şəxslərin yanında cəzalandırmaq, tənbeh etmək olmaz. Bu onların təlim motivasiyalarına mənfi təsir göstərməklə yanaşı, həm də özünəinamın zəifləməsinə, utanclıq hissinin formalaşmasına və digər ciddi xarakterli psixoloji gərginliyə səbəb ola bilər.

Özünəinam isə ona görə vacibdir ki, o, təhsilalanlarda cəsarət, özünəhörmət və təşəbbüskarlıq xüsusiyyətlərinin güclənməsinə xidmət edir. Özünəinam hissi güclü olan öyrənənlər riskə getməkdən və oxuduqları haqqında tənqidi və təhlil xarakterli fikirlər söyləməkdən çəkinmirlər. Bu amillər öyrənilən biliklərin bacarığa, vərdişə çevrilməsinə imkan yaradan ən güclü təsir vasitələrindəndir.

Bəzi tədqiqatçılar araşdırmalar apararkən belə bir qənaətə gəlmişlər ki, şagirdlərdə özünəinam hissinin formalaşdırılmasına aşağıdakı amillər mane ola bilər:

-şagirdin dərsə zəif hazırlıqlı olması;

-dərsdə müəllim-şagird münasibətinin lazımi səviyyədə olmaması;

-söylənilən fikirlərə tənqidi münasibət;

-şagirddə mövcud müsbət keyfiyyətlərin qabardılmaması;

Məktəblinin kiçik yaş dövründən başlayaraq özünəinam hissinin bütün aspektlərini inkişaf etdirmək lazımdır ki, gələcəkdə bu keyfiyyətlər şagirdin şəxsiyyət kimi uğurlar qazanmasını təmin etsin. Ozünəinam hissi şəxsiyyətin özünütərbiyəsinin əsas amillərindən biri olaraq onun ətrafdakı insanlarla qarşılıqlı münasibətini müəyyənləşdirir.

Məsələ burasındadır ki, məktəbəqədər dövrdə uşaq dünyanı bir tədqiqatçı kimi dərk edir: o, suallar verir, bu suallara cavab tapmaq üçün öz imkanı dairəsində müxtəlif məlumat mənbələrindən istifadə edir və ilk növbədə öz təcrübəsinə əsaslanır. Onu əhatə edən dünyanı müstəqil dərk edərək uşaq öz maraqlarına görə fəaliyyət göstərir.

Birinci sinfə qəbul olarkən uşaq elə bir təlim mühitinə düşür ki, burada onun adət etdiyi, təbii olan öyrənmə metodundan əl çəkmək tələb olunur. Müəllim tələb edir ki, uşaq ona diqqətlə qulaq asıb dediklərini yadda saxlasın, təlimatlarını dəqiq yerinə yetirsin və bu təlimata aid olmayan sualları az versin. Bununla şagirdə, demək olar ki, passiv mövqe tutmaq , tədqiqatçı rolundan imtina etmək və müəllim tərəfindən verilən məlumatla kifayətlənmək təklif olunur. Bu cür təlim prosesinin mərkəzində şagird yox, müəllim dayanır. Məhz müəllim təlim prosesinin fəal iştirakçısı olur və şagirdə nəyi və necə dərk edilməsini diktə edir. Bunun nəticəsində şagirdin dərketmə imkanları məhdudlaşır, onun ehtiyacları, maraq və qabiliyyətləri nəzərə alınmır. Deməli şagirdin fəallaşması üçün ilk növbədə, onun bir şəxsiyyət kimi təlim prosesinin mərkəzi obyekti kimi çıxış etməsi vacibdir. Təlim uşağın maraq və tələbatlarına, onun bilik səviyyəsinə, imkan və qabiliyyətlərinə yönəlməlidir.

Əgər şagird təlimdə müəllimlə bərabərhüquqlu şəxs kimi çıxış edirsə, bu onun fəaliyyətində yeni bir keyfiyyət yaradır: şagirdin özünəinamı artır, o öz fikrini çatdırmağa qorxmur, öz potensial imkanlarını gerçəkləşdirir. Əməkdaşlıq prinsipi müəllimdən tələb edir ki, o şagirdin qiymətləndirilməsində daha çox dəstəkləyici qiymətlərdən istifadə etsin. Əlbəttə ki, kiçikyaşlı məktəblilərdə özünəinam hissinin bu yaş dövründə formalaşmasına qiymətləndirmənin də təsiri böyükdür. Ona görə də təhsil sistemində pedaqoji qiymətləndirmənin səmərəli forma və yolları məsələsi hər zaman aktual olmuşdur. Pedaqoji qiymətləndirmə vasitəsi ilə kiçikyaşlı məktəblinin şəxsiyyətinə təsir etmək və onda özünəinam hissini tərbiyə etmək mümkündür. Tədris prosesi elə təşkil olunmalıdır ki, o, idrak fəallığı, təbii öyrənmə fəaliyyəti doğursun, şagirdə öz potensialına inam sevincini yaşamağa imkan versin. İdrak fəallığı ilk növbədə təfəkkürün fəallaşdırılması əsasında yaranır. Buna nail olmaq üçün birinci növbədə təlim prosesində idrak fəallığını stimullaşdıran problemli situasiyalar yaradılmalıdır. Uşaqda bu problemin həlli tələbatının yaranması nəticəsində bütün idrak prosesləri də fəallaşır, o, yeni bilikləri kəşf etməyə yönəlir.

Görkəmli rus psixoloqu, müasir pedaqoji psixologiyanın banilərindən biri olan L.S. Vıqotskinin nəzəriyyəsinə görə təlim inkişafı qabaqlamalı, uşağın “qarşıdakı (yaxın) inkişaf zonasına” yönəlməlidir. Bu inkişaf zonasında uşağın potensial imkanları mərkəzləşib, onları aktuallaşdırmaq üçün xüsusi təlim şəraiti yaradılmalıdır. Buna nail olmaq üçün şagirdlərə imkanlarına uyğun, lakin bir qədər mürəkkəb tapşırıqları müstəqil həll etmək təklif edilməlidir. Eyni zamanda, müəllim və digər böyüklər suallar verməklə onları

problemin həllinə istiqamətləndirməlidirlər.

Ümumi təhsilin məzmununda təhsilalanların idrak fəallığının təmin olunması, “hafizə məktəbi”ndən “təfəkkür məktəbi”nə keçid, şagirdin biliyi hazır şəkildə alması yox, özünün “kəşf etməsi”, onu fəal surətdə ifadə etməsi təlimdə böyük səmərələr verə bilər.

**Problemin aktuallığı**. Fəal təlim prosesində şagirdin müstəqil öyrənmə prosesini təmin etməkdə bir tərəfdən müəllimlərin şagirdlərə lazım olan sərbəstliyi verməməsi, digər tərəfdən şagird müəllim münasibətlərinin düzgün qurulmaması gözlənilən nəticəyə gətirib çıxarmır. Nəticədə dərs prosesində şagird passiv tərəf kimi kölgədə qalmış olur. Lazım olan biliyi özü araşdırma apararaq qazanmadığı üçün tez bir zamanda da şagirdin yaddaşından silinmiş olur. Bu baxımdan təlim prosesində şagirdlərə sərbəst fikir ifadə etmək imkanı yaratmaq zərurəti böyükdür.

**Problemin elmi yeniliyi.** Bu məqalədə təlim prosesində şagird fəallığının təmin edilməsinə dair bir sıra nümunələr, məsləhətlər öz əksini tapmışdır. Burada dərs zamanı şagirdlərdə özünəinam hissinin vacibliyi araşdırılaraq onun formalaşdırılmasına dair fikirlər eləcə də bu gün də mövcud problemi aradan qaldırmağa maneələr qeyd olunmuşdur.

**Problemin praktik əhəmiyyəti** ondan ibarətdir ki, şagirdlərə şəxsiyyətyönlülük və şagirdyönümlülük prinsipi ilə yanaşılması müasir dövrdə şagirdlərə verilən söz azadlığı, sərbəst düşünmə bacarığı, biz müəllimlərin məqsədinə çatmaq üçün bir vasitəyə çevriləcəkdir. Sözün əsl mənasında bizim yetişdirmək istədiyimiz yüksək təfəkkürə, tədqiqatçı və düşüncələrini ifadə edərkən tənqid olunmayacağına inamı olan bir şəxsiyyət yetişdirmiş olacağıq.

**Ədəbiyyat:**


1. Mərdanov M. Azərbaycan təhsili yeni inkişaf mərhələsində. −Bakı: 2009.
2. Ağayev Ə. Azərbaycan ictimai-pedaqoji fikrində şəxsiyyətin formalaşması problemi. −Bakı: Avropa, −2005.
3. Eminov A, Mədədov P. Pedaqogika, I cild. −Bakı: 2011.
4. Mehrabov A. Müasir təhsilin konseptual problemləri. −Bakı: Mütərcim, −2010.


**E-mail**: maqsudova.nurlana@mail.ru
**Redaksiyaya daxil olub:** 22.04.2024

*UOT 372.3/.4*

***Fidan Əlövsət qızı Nəsirova***
*Bakı şəhəri, Nərimanov rayonu, Evrika özəl*
*tam orta ümumtəhsil məktəbinin Azərbaycan dili müəllimi*
***Orcid***: *https://orcid.org/0009-0001-1091-0687*

## İBTİDAİ SİNİFLƏRDƏ OYUNA ƏSASLANAN TƏLİMİN ƏHƏMİYYƏTİ VƏ FORMALARI

***Фидан Аловсат гызы Насирова***
*учитель азербайджанского языка полной*
*средней общеобразовательной частной школы Эврика Наримановского района*
*гор. Баку*

## ЗНАЧЕНИЕ И ФОРМЫ ИГРОВОГО ОБУЧЕНИЯ В НАЧАЛЬНЫХ КЛАССАХ

***Fidan Alovsat Nasirova***
*Azerbaijani language teacher of a private secondary school Eureka of Narimanov district*
*of Baku city*

## PLAY-BASED LEARNING IN PRIMARY CLASSES SIGNIFICANCE AND FORMS

**Xülasə**. İnkişaf etmiş dünyada, sürətli həyat, texnologiya təhsildə də yeniliyi vacib edir. Bəzən öyrənmə prosesi şagirdlər üçün yorucu və maraqsız görünür. Bu problem ibtidai siniflərdə xüsusilə mövcuddur. Müasir təhsil kurikulumu ilə bağlı müzakirələrə şagirdlərin fəaliyyətləri, şagirdin tənqidi, yaradıcı düşüncəsinin inkişafı, inamlı olması, gələcək iş sahələrində uğur qazanması və necə öyrəndiyinə əmin olmaq üçün həll yolları daxil edilməlidir. Rəqəmsal tədris proqramına keçidi araşdıran bir çox məktəblər qeyd olunan məsələləri əsas götürərək müxtəlif həll yolları müəyyənləşdirirlər. Öyrənmə prosesini oyunlarla dəstəkləmək belə həll yollarındandır. Artıq müasir təlimdə oyunlarla öyrənmə çox önəmlidir.

***Açar sözlər:*** *ibtidai sinif, şagird, oyun əsaslı təlim, müasir təlim, motivasiya, təlim prosesi, intellektual səviyyə.*

**Резюме:** В развитом мире интенсивная жизнь и технологии делают инновации важными в образовании. Порой процесс обучения кажется учащимся утомительным и неинтересным, особенно эта проблема присутствует в начальных классах. Обсуждения касательно курикулума должны включать решения, обеспечивающие участие учащихся в школьной деятельности, развитие критического и творческого мышления, формирование уверенности, достижение успехов в будущей профессии и обучение тому, чему они учатся. Многие школы, рассматривающие возможность перехода на цифровую учебную программу, определяют различные решения, основанные на упомянутых проблемах, одним из которых является поддержка учебного процесса с помощью игр. Обучение через игры очень важно в современном образовании.

***Ключевые слова:*** *начальные классы, ученик, обучение на основе игр, интерактивное обучение, мотивация, учебный процесс, интеллектуальный уровень*

**Summary.** In the developed world, fast life, technology makes innovation important in education. Sometimes the learning process seems tiring and uninteresting for students. This problem is especially present in primary classes. Discussions about the modern education curriculum should include solutions to ensure that students engage in student activities, develop critical and creative thinking, develop confidence, succeed in future careers, and learn how they learn. Many schools investigating the transition to a digital curriculum are determining various solutions based on the mentioned issues. Supporting the learning process with games is one of such solutions. Learning through games is very important in modern education.

***Key words:*** *elementary school, student, game-based learning, interactive learning, motivation, learning process, intellectual level.*

Oyun əsaslı öyrənmə tarixən, əsrlər boyunca öyrənmə vasitəsi kimi istifadə edilmişdir. Hələ orta əsrlərdə strateji təfəkkürü öyrənmək üçün şahmat oyunundan istifadə olunurdu və Prussiyalı zabitlərin strategiyasını öyrətmək üçün 1812-ci ildə “Kreigsspiel” oyunu ixtira olunmuşdu. Hərbi strategiya xaricində artıq 1800-ci illərin ortalarında Fredrix Fröbel ən məşhur “Uşaq Bağçası” (Kindergarden) konseptində oyun vasitəsi ilə önəmli fikirləri var idi.

Oyun əsaslı öyrənmənin əsas konsepsiyası təkrarlama, çətinlikləri dəf etmə, uğursuzluq və məqsədinə çatmaq üçün vacib olan tədrisdir. Müasir dövrdə İKT imkanlarından istifadə edərək video oyunlarının nümayişi də oyun vasitəsi ilə öyrənmənin ən vacib yollarından biridir. Oyun zamanı proses öyrənilən mövzuya əsaslanır və şagird ən çətin səviyyələri keçə bilənə qədər ustalıq qazanır. Bu konsepsiya tədris prosesində də çox effektlidir. Öyrənmə prosesi fəaliyyətə uyğunlaşdırılır. Nəticədə passiv öyrənmə öz yerini aktiv öyrənməyə verir.

Oyun əsaslı öyrənmənin əhəmiyyəti çoxdur. İbtidai siniflərdə oyunlarla öyrənmə maraqlı və əyləncəli olur. Bu öyrənmə prosesini yaddaqalan və motivasiyalı edir. Oyunlar qazanılacaq təcrübəni təhlil edə bilir və təcrübə əldə etməyə kömək edir. Oyunlar səhv etmə imkanını təmin edir və səhv etməklə şagirdlərə problemi hansı şəkildə başqa yollarla öyrənməyə istiqamətləndirir. Bir çox oyunlar I-IV siniflər üçün strategiya və problemin həll bacarığının inkişafına nail olmaq üçün təşkil edilir. Oyunlar şagirdlərə problemlərə fərqli perspektivlərdə yanaşmağı öyrədir və strategiya tərtib etməyə kömək edir. Oyunlar şagirdlərin birgə işləmələrini və bir-biri ilə ünsiyyət qurmağını təşviq edir. Qrup oyunları və onlayn oyunlar şagirdlərin bir araya gəlməsinə səbəb ola bilir. Oyunlar şagirdlərin özünü inkişaf etdirmələrinə, öz bacarıqlarını və məlumatlarını artırmağa kömək edir. Oyunlar səviyyə, təsdiqləmə və mükafatlandırma sistemi təklif edir. Bu isə şagirdləri daha çox işləməyə və öz bacarıqlarını inkişaf etdirməyə sürətləndirir. Bir çox oyun ibtidai sinif şagirdlərində sosial bacarıqların inkişafına yardım edir. Oyunlar onlara bir-biri ilə yardımlaşmağı, birlikdə çalışmağı və komanda üzvləri ilə birgə hərəkət etməyi öyrədir. Oyunlar ibtidai sinifdə tədris olunan ayrı-ayrı mövzularda böhranlı məqamlarda praktik tədqiqat aparmaq üçün şagirdlərə çox kömək edir. Bu şəkildə öyrənilən biliklərin onlara gələcəkdə öz təcrübələrinin tətbiq edilməsini daha da asanlaşdırır.

Oyun əsaslı öyrənmənin motivasiyalı, keyfiyyətli olması üçün təbii ki, öyrədənlərin də peşəkar olması vacib şərtlərdən biridir. Dərs zamanı oyun əsaslı öyrənmə təlimi ilə bağlı modern təhsil prinsiplərini ilk dəfə tətbiq edən şəxs John Amos

Comenius (Jan Amos komenski) adlı bir Cəcovalı tərbiyəçi filosof idi. O, XVII əsrin əvvəllərində öyrənmə prosesini oyun və maraqlı təcrübələr əsasında aparmışdır. Comenius 1658-ci ildə yazdığı "Orbis Pictus" adlı kitabında bu fikirləri ətraflı şəkildə təqdim edərək öyrənmənin təşkilində bəzi üsullar tövsiyə etmişdir. Kitabın "Oyunla əlaqəli hissəsi" ən çox müstəqil oyun və təlim metodologiyalarına həsr edilib. Orbis Pictus təhsilin maraqlı və oyun əsaslı olması fikrini təşkil edən bu kitabda şagirdləri öyrənməni əyləncəli və təsirli etmək üçün oyunların necə tətbiq olunması üçün praktik təlimatlar vermişdir.

İbtidai siniflərdə dərs deyən müəllimlərin təlim prosesində tətbiq edəcəyi əsas oyun məqamları: rəngli şəkillər və diaqramlardan istifadə: öyrənilən mövzuların tətbiqi tərəfinin gücləndirilməsi üçün şəkil və diaqramalar çox önəmlidir, əyləncəli hekayə və nağıllar: öyrənməni hekayə və müxtəlif növlü nağıllarla əlaqələndirmək, hər bir mövzuda praktik təcrübə: nəzəriyyəni praktik təcrübələrlə birləşdirmək və təlimi maraqlı və əyləncəli hala gətirmək, müstəqil öyrənmə oyunları: Şagirdlərin müstəqil öyrənmələrinə imkan vermək və öz fikirlərini inkişaf etdirmələrinə nail olmaq üçün onlayn oyunlardan istifadə.

Oyunlarla öyrənmə ibtidai sinif şagirdlərində uğursuzluq üçün təhlükəsiz bir mühit təmin edir. Əzbərləməyə əsaslanan təhsil əvəzinə onlar sınaqlar və səhvlər ilə öyrənirlər. İbtidai siniflərdə aşağıdakı oyun formalarını, vasitə və texnologiyalarını tətbiq etmək olar:

**"Minecraft Education Edition"-** Belə oyunlardan biri elm, texnologiya, mühəndislik və riyazi biliklərə əsaslanan " Microsoft" şirkətinin əməkdaşlığı ilə şagirdlərin pulsuz faydalanacağı "Minecraft Education Edition", qısacası "Minecraft" oyunudur. Bu oyunu oynayarkən şagirdlərdə kodlaşdırma bacarıqları, alqoritmik düşüncə və proqramlaşdırma bacarıqları formalaşır. Şagirdlər bu platforma vasitəsi ilə müxtəlif fənlər üzrə öz oyunlarını yarada bilir, sinif yoldaşları ilə əməkdaşlıq edə bilirlər. Bu proqramı pulsuz olaraq əldə etmək üçün müəllim və şagirdlər www.video.edu.az portalında "Minecraft" keçidindən istifadə edərək qeydiyyatdan keçə bilərlər. "Minecraft" oyununu özəlliyi odur ki, o həm tək, həm də qrup halında oynanıla bilən bir oyundur. Bu oyun həm də uşaqların yaradıcılığını, problem həll etmə bacarığını və təşəbbüs qazanmaq üçün yaxşı bir əsas təşkil edir. Oyun onlara blok və resurslar idarə etməyi, inşa etməyi, əməliyyat etməyi öyrədir. Həm də təhlükəsizlik və planlaşdırma qabiliyyətini inkişaf etdirməyə kömək edir. Bu oyunun əsasən III-IV sinif şagirdləri ilə aparılması məqsədəuyğundur. Ona görə ki, uşaqlar oyun zamanı səyahət etməyi, qrupla əməkdaşlıq etməyi öyrənirlər.

**Öyrənməni əyləncəyə çevir –** Kahoot. Kahoot sinifdə bilik yarışı təşkil etmək üçün istifadə edə biləcəyiniz maraqlı saytlardan biridir. Xüsusi ilə formativ qiymətləndirmə zamanı istifadə oluna biləcək bu sayt uşaqlarda dərsə qarşı böyük maraq yaradır. Müəllim əvvəlcə kahoot saytında oyunu hazırlayır və oyunu proyektor və ya elektron lövhə vasitəsi ilə nümayiş etdirir. Şagirdlər telefon və ya kompüter ilə lövhədəki kodu yazıb, oyuna qoşulur və bir – birlərinə qarşı yarışırlar. Suallar lövhədə, cavablar isə uşaqların qurğularında görünür. Ən tez və ən çox düzgün cavab verən şagird (komanda ) daha çox xal toplayır və qalib olur.

**Rəqəmsal vətəndaşlıq –** Rəqəmsal vətəndaşlıq texnologiyanın və internetin düzgün, məqsədyönlü və təhlükəsiz şəkildə istifadə etmək üçün tələb olunan anlayışların və bacarıqların məcmusudur. Başqa sözlə rəqəmsal vətəndaşlıq texnologiyadan düzgün istifadəni müəyyən edən normalar və standartlardır. Günümüzdə bir çox məktəblər öz "Rəqəmsal vətəndaşlıq" strategiyasını hazırlayır və şagirdləri erkən yaşlarda tələb olunan bilik və bacarıqlarla təmin etməyə çalışır.

**"Qarışıq" öyrənmə və elektron öyrənmə –** Texnologiyanın inkişafı və təhsildə tətbiq edilməsi ilə ortaya çıxmış bu anlayışlar müxtəlif formada izah olunur. Elektron öyrənmə tədris proqramının rəqəmsal resurslardan istifadə etməklə çatdırılmasıdır. Bu zaman öyrənən istənilən yerdən rəqəmsal qurğu – kompüter, planşet vasitəsi və internet əlaqəsi ilə bütün təhsil resurslarına çıxış əldə edir və təhsil alır.Qarışıq öyrənmə zamanı isə ənənəvi formada baş verir.

**Proqramlaşdırma və robototexnika –** Robototexnika və proqramlaşdırma hər gün daha çox populyarlıq qazanan təhsil trendlərindən biridir. Şagirdlərin problem həlletmə, yaradıcı və tənqidi təfəkkürlərini, komanda şəklində işləmək bacarıqlarını inkişaf etdirmək üçün tədris olunan bu dərslərdə müxtəlif oyun tipli, uşaqlar üçün maraqlı resurslardan, uşaqların yaş səviyyəsinə uyğun robot qurğulardan istifadə edilir.

**Öz qurğunu gətir! –** Texnologiyanın çox sürətlə dəyişdiyi və "köhnəldiyi" üçün təhsil müəssisələri böyük məbləğdə vəsaitlər xərcləmək məcburiyyətində qalırlar. Şagirdlərin öz qurğularından məktəbdə öyrənmə üçün istifadəsinə icazə verməklə bəzi müəssisələr bu xərclərdən azad olurlar. Eyni zamanda şagirdlər istər evdən istərsə də məktəbdən kompüterdə işlərinə davam etmək imkanı əldə edirlər.

**Kibrit çöpləri ilə riyaziyyat –** kibrit çöpləri ilə təqdim olunmuş riyazi – məntiq məsələlərini həll edilməsi ibtidai siniflərdə ən çox tətbiq olunan oyun formasıdır. Bu təqdimatda müəllif tərəfindən hazırlanmış 40 müxtəlif nümunəni şagirdlər nəzərdən keçirir və özləri sərbəst olaraq istifadə edə bilirlər. Tapşırıqları yerinə yetirmək üçün şagirdlərdən bəzən kibrit çöpünü götürmək, bəzən döndərmək, bəzən isə yerini dəyişmək tələb olunur. File-Download – PPT əmri ilə kibrit çöpləri ilə bütöv təqdimatı kompüterə yükləyərək daim istifadə etmək olar.

Edu-Gaming **platformaları –** məktəb şagirdləri üçün təhsil oyunları təklif edən platformadır. Mütəxəssislərə interaktiv təlimatlar hazırlamaq üçün imkan yarardır.

**Artırılmış reallıq** – AR texnologiyası şagirdlərə 3D təlimat və göstəricilər təqdim edərək əlaqəni artırmağa kömək edir.

**Virtuallıq** – VR təcrübəsi 3D mühitində öyrənmə və tətbiq etmə imkanları yaradır. Məsələn, tarixi hadisələri yaşamaq və ya simuliyasiya oyunları.

**Oyun bazlı təlimat –** Oyunları təhsil prosesinə əlavə etmək, tələbələr və şagirdlərin maraqlı və interaktiv şəkildə öyrənməsini təmin etmək.

**Mobil tətbiqlər** – təhsilə xüsusi tətbiqlər təklif edən mobil platformalar. Tələbələrin öyrənməsini hər yerdə və hər zaman davam etdirmələrinə kömək edir.

**Simulyasiya alətləri** – təhsil mühitində simulyasiya alətləri istifadə edərək şagirdlər müxtəlif mövzularda praktiki bacarıqlarını inkişaf etdirə bilərlər.

Bu vasitələr təhsil mühitində oyunlaşdırma prinsiplərini tətbiq etmək üçün səmərəli və maraqlı bir yol təşkil edir.

Qeyd olunan oyuntexnika formalarının tətbiqi üçün ilk növbədə peşəkar öyrədənlər və mühit şəraiti olmalıdır. Əks halda bu oyunların effekti olmaya bilər. Təhsil sistemində dəyişiklik həmişə ləng gedir. Bir tərəfdən, dəyişikliyin yavaş olması yaxşıdır, çünki bu, tam sınaqdan keçməmişdən təhsildə yarana biləcək fəsadların qarşısını almağa kömək edir. Əks tərəfində sürətlə dəyişən texnologiya dünyaya cavab vermək üçün ləng bir sistem meydana gətirir. Bu nisbəti artırmağın əsas yolu kurikuluma sistemli yanaşmanı dəyişməkdir. Hətta rəqəmsal alətlər tətbiq edən ən inkişaf etmiş məktəblərin belə keçməli olduğu uzun bir yol var.

Oyun əsaslı təlim əvvəldən uyğunlaşmaq üçün qurulmuşdur. Bütün dərs ili ərzində oyun daha effektiv bir öyrənmə vasitəsi olaraq sınanır və tənzimlənir. Yeni məlumatlar ortaya çıxdıqda və ya təhsil yanaşmaları dəyişildikdə, oyun onlara uyğun olaraq dəyişdirilə bilər. Oyunlara hətta müəllimlərin şagirdlərə nəzarət etməsinə imkan verən monitorinq təhlili vasitələri də daxildir. Beləliklə oyun gələcək yeniləmələrə uyğun dəyişdirilə bilər.

Fərqli yanaşmaların və məqsədyönlü təlimlərin birləşməsi eyni zamanda bütün təlim üslublarına uyğundur. Şagird təhsil aldığı sinifdən asılı olmayaraq, müxtəlif oyuna müraciət edə bilər. Oyunlar hətta geniş mövzunu tək oyunda da birləşdirə bilər.

Öyrənmə oyunları mühitində şagirdlər uğursuz olsalar da, onda yenidən cəhd edib səhvlərindən öyrənə bilərlər. Əzbərləməyə əsaslanan təhsil əvəzinə şagirdlər sınaqlar və səhvlər ilə öyrənirlər. Oyunlar onlara yenilikləri sınamaq şansını verir.

Öyrənmə yolu ilə təlim prosesi zamanı "Yüz dəfə eşitməkdənsə bir dəfə görmək yaxşıdır" ifadəsi gerçəkliyə çevrilir. Oyun prosesi mövzunun və izah edilən anlayışların şagirdlər tərəfindən vizuallaşdırılması, daha yaxşı dərk edilib və uzun müddət yaddaşlarda qalmasına kömək edir.

Təlim prosesində oyunların tətbiqi üçün lazımi onlayn resursların olması da vacib şərtlərdən biridir. Müasir təlim tələb edir ki, tədris prosesi sinifdə yekunlaşmasın. Müəllim şagirdlərin istənilən yerdən və istənilən zaman öyrənə bilmələrini təmin etməlidir. Ona görə ki, şagirdlərin texnologiyaya, internetə daha böyük marağı var. Onlayn resursdan istifadə zamanı şagird evdən və yaxud məktəbdən bu resurslara daxil olub müəyyən tapşırıqları həll edir, dərsləri izləyir. Onlayn resursların digər bir üstünlüyü isə oyunlaşdırma üsullarına üstünlük vermələri və güclü motivasiya vasitələri olmalarıdır.

Onlayn resurslardan istifadə həmçinin şagirdin uğurlarının və nəticələrinin izlənməsi üçün, onun güclü və zəif tərəflərini aşkarlamaq üçün gözəl vasitədir. Müəllim şagirdin nəticələrini izləyərək, güclü və zəif məqamları öyrənərək şagirdə fərdi yanaşma imkanı qazana bilər. Onlayn resurslardan istifadə etmək şagirdin bu prosesdə tək qalmaması kimi başa düşülməməlidir. Şagird daima müəllim və valideyn nəzarətində olmalı, dəstəklənməlidir. Müəllim ilk növbədə oyun bacarıqlarına uyğun resurslardan istifadə edilməlidir. Valideyn isə şagirdə evdə bu resurslardan istifadəyə köməklik göstərməli, şagirdə evdə nəzarət etməlidir. Bu prosesdə valideyn və müəllim əməkdaşlığı mühüm rol oynayır.

Ölkəmizdə bu resurslardan istifadə zamanı yaranan problemlərdən biri dil problemidir. Çünki belə resurslar əksər hallarda rus, ingilis və ya digər dillərdə olur. Lakin digər tərəfdən şagirdin başqa dildə bu resurslardan istifadə etməsi onun xarici dil biliklərinin inkişafına da öz köməyini göstərəcək. Müəllim və şagirdlər fəaliyyətin səmərəli olması üçün aşağıdakı linklərdən istifadə edə bilərlər.

**Problemin aktuallığı**. Oyunlardan istifadənin üstünlükləri: şagirdlərin dərsə motivasiyasını artırır, müxtəlif qurğular (kompüter, telefon, planşet) vasitəsi ilə qoşulmaq və oynamaq bacarıqlarını inkişaf etdirir, sadə dizaynı qurub, rahat və asan öyrənə bilirlər. Müxtəlif növ suallardan istifadə etmək mümkün olur, sualları cavablandırmaq üçün şəkillərdən, videolardan istifadə etmək mümkündür, oyun bitdikdən sonra proqram müəllimə detallı şəkildə nəticə-ləri təqdim edir.

**Problemin elmi yeniliyi.** İbtidai siniflərdə informatika fənninin tədrisi şagirdlərin digər fənlərdə oyun vasitəsi ilə öyrənmə prosesini daha da asanlaş-dırır. Kompüter üzərindən oyunlar zamanı tezlik, effektivlik, rahatlıq, proqram, komandalar və əməliyyatın daxili şərtləri üçün klaviaturadan istifadə bacarığı çox əhəmiyyətlidir. Şagirdlərə klaviaturadan istifadəni öyrətmək üçün müxtəlif oyunlardan istifadə olunur. Belə oyunlardan istifadə uşaqlarda erkən yaşlardan surətli və düzgün yazmaq bacarığının formalaşmasında əhəmiyyətlidir.

**Problemin praktik əhəmiyyəti.** İbtidai sinif şagirdlərinin asudə vaxtlarını səmərəli təşkil etmək, əylənərək öyrənmələri üçün istifadə edə biləcəkləri bir sıra saytlarda riyaziyyat, təbiət elmləri və ingilis dilinə aid maraqlı oyunlar və videolar yerləşdirilmişdir. İbtidai sinif müəllimləri bu saytları şagirdlərə və onların valideynlərinə yönləndirməklə oyunlarla təlim prosesini daha da səmərəli edə bilərlər.

**Ədəbiyyat:**


1. Ə. Ağayev. Təlim prosesi: ənənə və müasirlik. − Bakı, 2006
2. Veyisova, Z. Fəal (interaktiv) təlim. / Z. Veyisova. −Bakı: UNİSEF, −2007
3. Kərimov, Y. Təlim metodları. / Y. Kərimov. −Bakı, 2009
4. Nəzərov, A. “Müasir təlim texnologiyaları”. / A. Nəzərov. −Bakı: ADPU-nun nəşriyyatı, 2012.
5. Cavadov, İ., Kazımova, Ş. “Öyrənmə fəaliyyəti üçün münbit şəraitin yaradılması”. −Bakı, 2020.



**E-mail:** nəsirova-1983@list.ru


**Redaksiyaya daxil olub:** 22.04.2024

UOT 372.3/.4

***Günel Məhəmməd qızı Məmmədova***
*fəlsəfə doktoru proqramı üzrə doktorant*
*Azərbaycan Dövlət Pedaqoji Universiteti*
***Orcid**: https://orcid.org/0000-0002-6248-9265*

# GƏLƏCƏK İBTİDAİ SİNİF MÜƏLLİMLƏRİNİN TƏDQİQATÇILIQ BACARIQLARININ FORMALAŞDIRILMASININ ƏHƏMİYYƏTİ

***Гюнель Мухаммед гызы Мамедова***
*докторант по программе доктора философии*
*Азербайджанского Государственного Педагогического Университета*

# ВАЖНОСТЬ ФОРМИРОВАНИЯ ИССЛЕДОВАТЕЛЬСКИХ НАВЫКОВ У БУДУЩИХ УЧИТЕЛЕЙ НАЧАЛЬНЫХ КЛАССОВ

***Gunel Muhammad Mamedova***
*doctoral student in the doctor of philosophy program*
*at the Azerbaijan State Pedagogical University*

# THE IMPORTANCE OF BUILDING RESEARCH SKILLS OF FUTURE PRIMARY SCHOOL TEACHERS

**Xülasə.** Gələcək ibtidai sinif müəllimlərinin tədqiqat bacarıqlarının formalaşdırılmasının imkan və yollarının araşdırılması, pedaqoji şərtlərin müəyyənləşdirilməsi pedaqoji nəzəriyyə və praktika üçün aktual problem olaraq qalır. Tədqiqatın aktuallığı onunla şərtlənir ki, burada gələcək ibtidai sinif müəllimlərində peşə səriştələrinin formalaşdırılması üçün pedaqoji şərtlər müəyyənləşdirilir. Qeyd olunur ki, müasir müəllimlər təhsil sistemində aparılan pedaqoji təcrübələrin iştirakçısına çevrilir, innovativ proseslərə daxil olur, yeni təhsil proqramları hazırlayır, yeni tədris texnologiyalarını tətbiq edirlər ki, bu da tədqiqatçılıq bacarığı tələb edir. Tələbələrin elmi-tədqiqat işlərinin təhlilinin nəticələri təqdim olunur, burada bakalavr tələbələrinin öyrənilən problemləri sistemli şəkildə nəzərdən keçirmək bacarığı qeyd olunur, tələbələr eksperimental iş bacarıqlarına malikdir, diaqnostik üsullardan istifadə etməyi, cədvəllərdən, diaqramlardan, diaqramlardan istifadə etməyi bacarır. "İbtidai təhsil" profili tələbələrinin elmi-tədqiqat işləri sisteminin təşkilinə bəzi yanaşmalar göstərilir, tədqiqat işlərinin həcminin və mürəkkəbliyinin getdikcə artdığı bütün təhsil müddəti ərzində tələbələrin universitetin elmi fəaliyyətində davamlı iştirakına əsaslanır.

***Açar sözlər:*** *tədqiqat, pedaqoji eksperiment, ibtidai sinif müəllimləri*

**Резюме.** Изучение возможностей и путей развития исследовательских умений будущих учителей начальных классов, определение педагогических условий остается актуальным вопросом педагогической теории и практики. Отмечается, что современные педагоги становятся участниками педагогических экспериментов в системе образования, включаются в инновационные процессы, разрабатывают новые образовательные программы, применяют новые технологии обучения, что требует исследовательских навыков. Представлены результаты анализа научно-исследовательской работы студентов, в которых подчеркивается умение студентов бакалавриата системно рассматривать изучаемые проблемы, студенты обладают экспериментальными навыками,

умеют пользоваться методами диагностики, таблицами, схемами, диаграммами. В статье также показаны организация системы научных исследований, основанная на постоянном участии студентов в научной деятельности вуза в течение всего периода обучения, когда увеличивается объем и сложность научно-исследовательской работы.

***Ключевые слова:*** *исследование, педагогический эксперимент, учителя начальных классов*

**Summary.** The study of opportunities and ways to develop the research skills of future primary school teachers, the definition of pedagogical conditions remains a topical issue for pedagogical theory and practice. is determined. It is noted that modern teachers become participants in pedagogical experiments in the education system, enter into innovative processes, develop new educational programs, apply new teaching technologies, which requires research skills. The results of the analysis of students' research work are presented, which emphasizes the ability of undergraduate students to systematically review the problems studied, students have experimental skills, are able to use diagnostic methods, tables, charts, diagrams. -Some approaches to the organization of the research system are shown, based on the continuous participation of students in the scientific activities of the university during the entire period of study, when the volume and complexity of research work is increasing.

***Keywords:*** *research, pedagogical experiment, primary school teachers*

Müasir şəraitdə təhsilin davamlı inkişafının əsas resurslarından biri peşəkar fəaliyyətin subyekti olmağı bacaran müəllimə çevrilməkdir. Müəllim tədqiqat fəaliyyəti bacarıqlarına əsaslanan yeni təcrübə-transformativ səriştəyə yiyələnir. Müasir müəllimlər pedaqoji paradiqmanın seçilməsi, öz dəyər-semantik sferasının, fərdi peşə fəaliyyəti sisteminin yenidən qurulması kimi mürəkkəb vəzifələri həll edirlər. Məktəb müəllimləri, təhsil müəssisələrinin rəhbərləri eksperimental tədqiqat fəaliyyətinə, pedaqoji təcrübənin keyfiyyətcə yeni modellərinin yaradılması proseslərinə və onların elmi dərkinə cəlb olunurlar. Onlar təhsil sistemində aparılan müxtəlif, o cümlədən irimiqyaslı təcrübələrin iştirakçısına çevrilir, innovativ proseslərə daxil edilir.

Müəllimin elmi-tədqiqat fəaliyyətinin inkişafı pedaqoji elm və pedaqoji təcrübənin görüşü üçün bir məkan kimi açılır, onun daxilində müəllimin pedaqoji fəaliyyətinin dəyişdirilməsi təcrübəsinin əks olunması və təcrübənin dəyişdirilməsi üçün əsas kimi tədqiqat səriştəsinin inkişafını təmin edir. Tədqiqat etikasının normaları mənimsənilir, peşəkar ünsiyyətin yeni təcrübəsi və peşəkar mühitlərin tədqiqat fəaliyyətinə yönəlmiş yeni peşəkar icmaların qurulması əldə edilir.

Bu işin məqsədi gələcək müəllimlərin elmi-tədqiqat fəaliyyəti bacarıqlarına yiyələnmə yollarının işlənib hazırlanması və yeni kompetensiyaların mənimsənilməsinə yaradıcı yanaşmanın zəruriliyini dərk etməkdir.

Mövcud təcrübənin təhlili göstərir ki, tədqiqat fəaliyyətinə hazırlanması sistemi aşağıdakı prinsiplər əsasında həyata keçirilir: [6, s. 102]

- idarəetməyə məqsədyönlü yanaşma, o cümlədən tədqiqat fəaliyyətinə hazırlığın monitorinqi;
- universitetdə tədqiqat təhsili mühitinin yaradılması, tələbə və müəllimlərin motivasiyasını, qarşılıqlı əlaqəsini və birgə fəaliyyətini təmin

etmək. Tədqiqat təhsil mühiti ümumi məqsədin birləşməsini və əsas istiqamətlərin işinin əlaqələndirilməsini təmin edir: kafedranın elmi-tədqiqat işi, tədqiqat işi, təcrübənin təşkili, tədris prosesi, tələbələrin kurs işlərinin və tezislərinin idarə edilməsi, və ayrı-ayrı müəllimlərin elmi tədqiqatları.

- 1-ci kursdan başlayaraq tələbələrin tədris prosesi ilə elmi-tədqiqat fəaliyyətinin inteqrasiyası;
- nəzəri kursun praktiki işlə uzlaşdırılması;
- müasir təhsil təcrübəsinin tələblərini, peşəkar standartın və Ali Təhsilin Dövlət Təhsil Standartının müddəalarını nəzərə alaraq;
- nəticələrin meyarlılığı və diaqnostikası.

Pedaqoji universitet tələbələrinin tədqiqat fəaliyyətinə hazırlanması sistemində aşağıdakı komponentlər fərqləndirilir: hədəf, motivasiya, məzmun, fəaliyyət, nəzarət və qiymətləndirmə, bunlar:

- tələbələrin tədqiqat fəaliyyətinə həvəsinin formalaşdırılması, onların subyektivliyinin inkişafı, məhsuldar fəaliyyət mühitinin yaradılması;
- təhsilin təcrübə yönümlü məzmunu, fənlərarası inteqrasiyanın həyata keçirilməsi, təcrübə müddətində tələbələrin məqsədyönlü işi (təsdiqedici eksperimentin aparılması, diaqnostik üsullardan istifadə və s.) [4]
- tələbələrin əks etdirmə və özünü idarə etmə qabiliyyətinin inkişafı (pedaqoji tədqiqatın effektivliyi meyarları, nəzarət və özünə nəzarət üsulları ilə tanışlıq; öz hərəkətlərini təhlil etmək və qiymətləndirmək bacarıqlarının formalaşdırılması, qarşılıqlı qiymətləndirmə, reytinq göstəricilərinə çıxış müəllimin şəxsi hesabı).

Nəzarət və qiymətləndirmə aparatı tələbələrin tədqiqat fəaliyyətinə hazırlığının meyarlarını və göstəricilərini ehtiva edir və idrak, şəxsi və fəaliyyət komponentlərini birləşdirir. İdrak konseptual aparatın mənimsənilmə dərəcəsini, formalaşmış nəzəri bazadan tədqiqat fəaliyyəti prosesində istifadə etmək bacarığını müəyyən edir. Şəxsiyyət fərdin motivlərini və dəyər münasibətlərini, habelə tələbənin tədqiqat fəaliyyəti prosesində əksini əhatə edir. Fəaliyyət komponenti tədqiqat bacarıqlarına malik olma dərəcəsini, onların praktikada tətbiqi imkanlarını müəyyən edir.

Tələbələrin elmi-tədqiqat işi bütün təhsil müddəti ərzində onların universitetin elmi fəaliyyətində davamlı iştirak sisteminə çevrilir. Belə bir sistemin əsasını onun metod və formalarının bir akademik fənndən digərinə, aşağı kurslardan yuxarı kurslara, o cümlədən məzunun yekun ixtisas işi üzrə davamlılığı təşkil edir. Bu yanaşma tələbələrin öyrənmə prosesində formalaşdırdıqları tədqiqat tapşırıqlarının, bacarıq və bacarıqlarının həcmini və mürəkkəbliyini tədricən artırmağa imkan verir.

Universitetdə tələbələrin elmi işə, o cümlədən tələbələrin tədris və elmi-tədqiqat işlərinə cəlb edilməsinin davamlı sisteminin tətbiqi bir sıra vəzifələrin həllinə kömək edən tələbələrin tədqiqat işinə çevrilir:

- tələbələrin müstəqil iş bacarıqlarının və yaradıcılıq qabiliyyətlərinin inkişafı;
- tədris prosesinin intensivləşdirilməsi (fundamental və ümumi peşə fənlərinin dərinləşdirilməsi, xüsusi biliklərə yiyələnmə, peşəyönlülük, fənlərarası əlaqələrin gücləndirilməsi);
- elmi tədqiqatların nəticələrindən tədris prosesində istifadə.

-nəzəri və eksperimental tədqiqatın elmi üsullarından istifadə etməklə konkret mövzu üzrə müstəqil

aşкarlanması zamanı da qəbul edilməsi.

İntellektual mülkiyyət ağıl, zəka, zehin mülkiyyəti deməkdir. Yeniliklər bazarının normal fəaliyyəti, hər şeydən öncə, intellektual mülkiyyətdən düzgün istifadə olunmasını tələb edir. Milli sərvət sayılan intellektual mülkiyyət əsasən dörd növə ayrılır: patent, ticarət markası, müəlliflik hüququ və sənaye sirləri. Bunların özünəməxsus xüsusiyyətləri vardır. Məsələn, patent cəmiyyətdə ixtiraçılar, yaradıcı adamlar arasında müqavilə kimi səciyyələnir; ticarət markası (nişanı) firmanın, şirkətin keyfiyyət rəmzidir, malın (xidmətlərin) mənbəyini və onun başqa əmtəələrdən fərqli cəhətləridir; müəlliflik hüququ isə orijinal müəlliflik işlərinə aiddir. İntellektual mülkiyyətin qorunması şərtləri və müddətləri "İntellektual mülkiyyət haqqında" Azərbaycan Respublikasının Qanunu ilə müəyyən edilir. Təsadüfi deyil ki, intellektual mülkiyyət haqqında mükəmməl qanunu olmayan ölkələrin iqtisadiyyatına kifayət qədər xarici investisiya, yeni texnika və texnologiyalar cəlb edilmir [1].

Biznes proses kimi müəyyən funksiyaları: maliyyə və uçot, kadr və maddi-texniki təminat, istehsal, marketinq, elmi-tədqiqat və layihə işlərini nəzərdə tutur. Digər iqtisadçılar biznesə müəyyən struktur çərçivəsində təşkil edilən, məqsədi və nəticəsi gəlir götürmək olan konkret iqtisadi fəaliyyət növü kimi baxırlar. Onda belə bir sual ortalığa çıxır? Pedaqoji biznes dedikdə biz nəyi başa düşürük?-Ümumiyyətlə biznesin bir çox növləri vardır: kommersiya biznesi, maliyyə biznesi, konsultativ biznes və s. Pedaqoji biznes isə pedaqoji istiqamətdə təhsil müəssisələrinin həyata keçirdikləri biznes fəaliyyətidir.

Təhsil müəssisələrində pedaqoji biznes dedikdə müəssisənin xüsusi və cəlb olunmuş kapitalının pedaqoji istiqamətdə səmərəli istifadə olunması və maliyyə axınlarının idarə olunması başa düşülür. P.B. Əliyev, M.S. Kazımov, Ş.H. Qəribov, İ. M. Əsədova, V. Y. Kərimov belə hesab edirlər ki, "Maliyyə münasibətləri istənilən idarəetmə sistemi kimi maliyyə menecmenti də iki alt sistemdən ibarətdir: idarəetmə obyekti və idarəetmə subyektləri" [2].

Hər gün hansısa məlumat və ya bacarığa sahib olmağın verdiyi üstünlük, və ya məhrum olmağın bizi geriyə salması ilə qarşılaşırıq. Bu məlumat və ya bacarığı əldə etməyin isə 2 yolu var – tədris, təhsil. Əslində ərəb dilindən aldığımız bu iki sözün mənası hazırda qarışdırılıb. Tədrisdə informasiyanı qəbul etməyin yolu dərs prosesindən keçirsə, təhsildə fərd öz iradəsi və istəyi ilə məlumatı mənbələrdən şəxsən əldə edə bilər. Sadəcə tədris qlobal perspektivdir, təhsil isə məlumatı alanın perspektividir. İstənilən halda məlumat və bacarığa yiyələnmək üçün hər kəs özü hazırlığını görə bildiyi kimi, bunu müxtəlif müəllim və ya təhsil müəssisəsinə müraciətlə də həll etmək olar. Qədim dövrlərdə tədris müəssisəsi deyə biləcəyimiz yer çeşidi çox məhdud olub. Əsasən mədrəsələrdə ilahi və təbii elmlər tədris olunub, müəyyən çevrələrdə də fəlsəfi və ictimai mövzular müzakirə olunub. 15-ci əsrdən sonra isə universitet və məktəb tipli qurumlar fəaliyyətə başlayıb. Xüsusən qərbin elmi metodu kəşf etməsi və onun üstünlüyünü qavramasından sonra 20-ci əsrin elə ilk günlərindən universitetlər və çeşidli təlim verən qurumlar aktivləşib.

Hazırda dünyada aparıcı mövqedə duran "tədrisçilər"in əksəriyyəti qədim ənənəyə sahibdir. Amma beşikdən məzara elmlənmək tövsiyə olunduğu kimi, təhsil işi sadəcə bağça-məktəb-universitet

prosesindən ibarət deyil. Rəqabət dünyasında insanların həm təhsildə dəstək investisiyasına (abituriyentlərin xüsusi hazırlaşması, özəl məktəblər, repetitorla xüsusi hazırlıq vs.), həm də əlavə bacarıqların yiyələnməsinə (musiqi, idman, sənət vərdişləri, dil hazırlıqları, biznes bacarıqları, kompüter vərdişləri və s.) ehtiyacı olur [5].

Təhsili bir məhsul kimi götürsək gündəlikdə qarşılaşdığımız problemlərin öhdəsindən necə gələcəyimizi bir paket şəklində qəbul etmək kimi demək olar. Sanki önümüzdə bir baryer var və onu ötməyin mərhələləri, üsulları, qarşılaşa biləcəyimiz maneələr haqda məlumatlar bir kapsula yüklənir və biz onu uduruq. Bu dəfə kapsul mədəyə yox, birbaşa beyinə gedir və orada hifz olunur. Bu misal daha səmərəli təhsil prosesinin meyarlarını da üzə çıxarır: müəllimin tələbəni tanımaq bacarığı, müəllimin həmin təlim paketini tələbəyə yeritmək bacarığı, paketin sistemliliyi və effektivliyi, tələbənin məlumatları alıb süzmək və sistemləşdirmək bacarığı, tələbənin beynindəki həcm və qaydalılıq [3].

Təhsil prosesinin vizuallaşdıran iki insan ünsürü – müəllim və tələbə. Müəllimin keyfiyyəti qədər tələbənin də keyfiyyəti müəyyənedicidir. Türk liseylərində və Çağın qurumlarında bu məqam həmişə önə çıxır. Amma keyfiyyətli tələbəni cəlb etmək əsas sual mövzusudur. Müasir təhsil biznesində bu iki insan profilinə bir də işçi heyət əlavə olunub. O insanların 1 – nə iş gördüklərini, 2 – hansı müəssisəni təmsil etdiklərini yaxşı qavramaları işin səhhəti baxımında çox vacibdir.

Təhsil prosesdir, insanlar onun vizuallaşmasının əsas ünsürləri və daşıyıcılarıdırlar, fiziki göstəricilər isə konkret qurum haqda beyinlərdəki rəsmi formalaşdıran əsas vasitələrdir – sertifikatlar, məlumatlandırıcı lövhələr, dizayn, texniki vasitələr və s. Real olaraq baxdıqda istənilən təhsil biznesinin mövqeləndirməsini 3 şey müəyyən edir: prosesin nəticəsində müştəridə formalaşan rəy və onu ətrafındakılar ilə bölüşməsi, fiziki göstəricilər və marketinq kommunikasiyası.

Azərbaycanda bütün sahələrdə olduğu kimi, təhsil biznesində də sovetin qalıqları özünü göstərir – proqramlarda, təhsil müəssisələrinə yanaşmada, müəllim heyətlərində. Amma bütün sahələrdə olduğu kimi burada da meyl dəyişikliyə doğrudur. Xüsusən hədəfləri olan özəl təhsil şirkətləri artıq gənclərlə işləyir – dünya təcrübəsindən xəbərdar, öz üzərində işləyən və öyrətməyə həvəsli gənclər. Heyf ki, hədəfləri olan təhsil müəssisələrini saymağa çalışsaq Çağ Öyrətim İşlətmələrindən geriyə çox az qurum qalacaq. Onlar arasında da, bir neçə universitet, təhsil mərkəzi, hazırlıq kursu və məktəbəqədər hazırlıq müəssisəsi olacaq [5].

Bizneslə əlaqələr genişləndikcə yeni istiqamətlərin meydana gəlməsi, yeni təşkilati strukturların yaranması və s. universitetlərin idarə edilməsində çətinliklər yaradır. Beynəlxalq təcrübədə belə çətinlikləri aradan qaldırmaq üçün biznes nümayəndələri universitetin idarəçiliyində müxtəlif formalarda iştirak edir və hətta bir çox hallarda marketinq strukturunun rəhbəri təyin olunur. Eyni qayda ilə universitetlərin də nümayəndələri biznes strukturlarının rəhbərliyində iştirak edirlər. Bundan başqa, universitetlərin biznes strukturları ilə birbaşa və ya mövcud şəbəkə (sənaye-ticarət palatası, agentliklər, assosiasiyalar və s.) vasitəsilə əlaqələrinin qurulması təcrübəsi də mövcuddur və getdikcə ikinci forma daha geniş yayılmağa başlayıb. Bu,

əsasən onunla bağlıdır ki, mövcud şəbəkə daxilində təhsilin səviyyəsinin monitorinqi və marketinqi birgə səylər nəticəsində daha keyfiyyətli və miqyaslı aparıla bilir. Burada diqqət göstərilməli ən vacib amil intellektual mülkiyyətin qorunması məsələsidir.

Nəzəri olaraq təhsil və elmi-tədqiqat fəaliyyəti bütövlükdə intellektual mülkiyyət obyektidir və bir çox hallarda elmi-tədqiqatların nəticələri kommersiya əhəmiyyətli olsa da, mövcud patentləşdirmə mexanizminin və nəşr imkanlarının məhdudluğu səbəbindən onlar potensial tələbatçıya çatdırıla bilmir. Ona görə də ali məktəblərin birgə tədqiqat və kommersiya fəaliyyəti genişləndikcə tədqiqatların nəticələrinin qorunması zərurəti artır. Amma bu zaman nəzərə almaq lazımdır ki, müvafiq qoruma mexanizmi yaradılmadıqda bizneslə əlaqə zəifləyər və ali məktəbin intellektual mülkiyyəti qeyri-rentabelli olar.

Dünya təcrübəsi sübut edir ki, son vaxtlar təhsil sahəsində dövlət-biznes tərəfdaşlığı aktiv surətdə genişlənməkdədir. Bu onun göstəricisidir ki, dövlət və biznes bu gün təhsil sistemi qarşısında duran irimiqyaslı hədəflərə çatmaq üçün qarşılıqlı surətdə fəal əməkdaşlıqda maraqlıdır. Dövlət və biznes arasında pedaqoji istiqamətdə tərəfdaşlıq münasibətlərinin səmərəli inkişafı hər iki tərəfin maraqlarının razılaşdırılması prinsipinə əsaslanır. Lakin hər iki tərəfi birləşdirən ümumi vəzifə rəqabətqabiliyyətli, yüksək peşəkarlığa malik mütəxəssislərin yetişdirilməsi və təhsili idarəetmə kadrlarının effektiv hazırlığını təmin etməkdir [3].

Bizə məlumdur ki, Azərbaycan Respublikası Prezidentinin 24 oktyabr 2004-cü ildə imzaladığı “Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası”adlı sərəncamın Strateji hədəflər və tədbirlər hissəsinin “Təhsilin nəticələrə görə cavabdeh, şəffaf və səmərəli tənzimləmə mexanizmlərinə malik, dövlət–ictimai xarakterli və dövlət–biznes partnyorluğuna əsaslanan idarəetmə sisteminin formalaşdırılması” adlı istiqamətin 3.1.4. bəndində “təhsil sahəsində dövlət-biznes partnyorluğu sisteminin yaradılması” əsas tələblərdən biri kimi qarşıya qoyulur[5].

Bu faktora çox ciddi əhəmiyyətin verildiyi ölkələrdə (ABŞ, Böyük Britaniya, Almaniya, Çin, Yaponiya, Cənubi Koreya) biznes qurumları universitetlərdə tədris prosesinə, pedaqoji prosesə fəal müdaxilə edirlər. Onlar tələbələr qarşısında konkret pedaqoji prosesdə layihələrlə çıxış edir, hər bir tələbənin imkan və bacarıqlarını üzə çıxara biləcək tədqiqat layihələrinin hazırlanmasını onların öz ixtiyarına buraxırlar. Çox zaman tədqiqatlarda uğurlu nəticə əldə etmiş tələbə şirkət tərəfindən işlə təmin olunur.

**Problemin aktuallığı.** Bu məqalənin aktuallığı ondan ibarətdir ki, qloballaşan dünyada iri şirkətlər, biznes dairələri təhsil müəssisələri, xüsusən də universitetlərə ciddi maraq göstərirlər. Ölkə iqtisadiyyatının davamlı inkişafının təmin olunması üçün daha səriştəli, innovativ təfəkkürlü işçilərə tələbatın artması nəticəsində biznes dairələri təhsil müəssisələri ilə əməkdaşlıq münasibətlərinin qurulmasında maraqlıdır.

**Problemin elmi yeniliyi.** Bu mövzuda geniş araşdırmalar aparılmış və bu tədqiqatlar məqalədə öz əksini tapmışdır.

**Problemin tətbiqi əhəmiyyəti.** Bir çox pedaqoqlar elm sahəsində çalışan elm xadimləri bu mövzu ilə bağlı tədqiqatlarında bu materialdan istifadə edə bilərlər.

**Ədəbiyyat:**


1. Qərb ölkələrində idarəetmə elmi haqqında.URL: /https:// azkurs. Org /azerbaycan-respublikasinin-prezidenti-yaninda-dovlet idarecili. html? Page =7
2. Qurbanova, M. Təhsil meneceri proqramlarının mövcud dünya modelləri. URL: /https://www.academia.edu
3. Müasir menecmentin xarakterik xüsusiyyətləri. Müasir menecmentin inkişaf mərhələləriURL: /https: // remontantenn. ru/az/ repair/harakternye-cherty
4. sovremennogo-menedzhmenta-etapy-razvitiya-sovremennogo-menedzhmenta/
5. Müstəqil Azərbaycanda ali təhsilin inkişafı və perspektivləri.URL: / https: //tehsil. Biz /news /az/24154/Mstqil-Azrbaycanda-ali-thsilin-inkiaf-v-perspektivlri
6. Nəsrullayev, M. Təhsil menecmentinin metodoloji məsələləri URL: /http: //www. tehsilproblemleri.com/ ? p=7254.



**E-mail:** xfarida09@mail.ru



**Redaksiyaya daxil olub:** 25.04.2024

*UOT 371*

***Khayala Farhad Ahmadzada***
*master of Istanbul Aydın University in Education management faculty,*
*employee at Education Department of Baku City*
***Orcid**: https://orcid.org/0009-0001-7508-1285*

## THE EFFECT OF INSTRUCTIONAL LEADERSHIP CHARACTERISTICS OF SCHOOL ADMINISTRATORS ON TEACHERS' MOTIVATION

***Xəyalə Fərhad qızı Əhmədzadə***
*İstanbul Aydın Universitetinin*
*Təhsilin idarəedilməsi ixtisası üzrə magistrantı,*
*Bakı Şəhəri üzrə Təhsil İdarəsinin işçisi*

## MƏKTƏB İDARƏÇİLƏRİNİN TƏLİMATLANDIRICI LİDER KİMİ MÜƏLLİMLƏRİN MOTİVASİYASINDA ROLU

***Хайала Фархад кызы Ахмедзаде***
*магистрант Стамбульского университета Айдын*
*по специальности «Менеджмент образования»,*
*сотрудник Управлении Образования города Баку*

## РОЛЬ ШКОЛЬНЫХ АДМИНИСТРАТОРОВ КАК ЛИДЕРОВ-ИНСТРУКТОРОВ В МОТИВАЦИИ УЧИТЕЛЕЙ

**Summary.** In this research, the instructional leadership characteristics of school administrators were examined based on teachers' opinions, and the effects of teachers' perceptions of their principals' instructional leadership characteristics on their professional motivation were investigated. Quantitative methods and relational screening model were used. The sample consisted of 725 teachers working at different schools. Findings showed that the instructional leadership characteristics of school administrators are an important determinant of teachers' motivation. However, among the instructional leadership characteristics, only the feature of *creating an orderly teaching and learning environment and climate* affects teachers' motivation significantly and positively. This finding was interpreted as if school administrators succeed in creating a regular teaching and learning environment and climate in schools, teachers' motivation will be higher.

***Keywords:*** *education, school administrator, teacher, instructional leadership, motivation.*

**Xülasə.** Bu araşdırmada müəllimlərin rəyləri əsasında məktəb rəhbərlərinin təlim liderliyi xüsusiyyətləri araşdırılmış və müəllimlərin öz direktorlarının təlim liderliyi xüsusiyyətlərinə dair təsəvvürlərinin onların peşəkar motivasiyasına təsiri araşdırılmışdır. Tədqiqatda kəmiyyət üsulları və əlaqəli seçim modelindən istifadə edilmişdir. Məktəblərdə çalışan 725 müəllim sorğuda iştirak edib. Nəticələr göstərdi ki, məktəb rəhbərlərinin təlimatçı liderlik xüsusiyyətləri müəllimlərin motivasiyasının mühüm müəyyənedici amilidir. Belə ki, təlim liderliyi xüsusiyyətləri arasında yalnız nizamlı tədris və təlim mühitinin və iqliminin yaradılması xüsusiyyəti müəllimlərin motivasiyasına əhəmiyyətli və müsbət təsir göstərir. Nəticələrə əsasən demək olar ki,

məktəb rəhbərləri məktəblərdə müntəzəm tədris və təlim mühiti və iqlim yaratmağa nail olsalar, müəllimlərin motivasiyası daha yüksək olacaqdır.
***Açar sözlər:*** *təhsil, məktəb administratoru, müəllim, təlimat rəhbərliyi, motivasiya.*

**Резюме.** В данном исследовании на основе мнений учителей были изучены образовательные лидерские особенности директоров школ, а также изучено влияние восприятия учителями образовательных лидерских качеств своих директоров на их профессиональную мотивацию. В исследовании использовались количественные методы и связанная с ними модель отбора. В опросе приняли участие 725 учителей, работающих в школах. Результаты показали, что учебные лидерские характеристики директоров школ являются важным фактором, определяющим мотивацию учителей. Таким образом, среди характеристик образовательного лидерства только характеристика создания регулярной среды и климата преподавания и обучения оказывает существенное и положительное влияние на мотивацию учителей. По результатам можно сказать, что, если руководителям школ удастся создать в школах регулярную среду и климат преподавания и обучения, мотивация учителей будет выше.
***Ключевые слова:*** *образование, администратор школы, учитель, учебное руководство, мотивация.*

Education, which is the pillar of society, plays a very important role in the progress and development of a nation. Increasing economic and technological developments have led to increased competition. In this competitive environment, societies that lack applied learning opportunities will also lack diversity, so applied education is of great importance (1).

Managers' expectations, desires, feelings and excitement have a significant impact on the efficiency of educational organizations. To ensure effectiveness, organizations need to increase employee motivation and change employees' behavior to achieve desired results (2). This can be possible with the effective management of schools.

Changes and developments in society have required frequent review of information, a proactive role for school management and protection of reputation. To achieve this, the educational institution must always evaluate schools' goals and ensure that the goals are up to date. Because it is extremely difficult for a school that cannot meet expectations to be successful (2). In order for a school to be successful and have effective employees, it must have qualities such as desire, dedication and motivation (1).

Motivation is very important for the education system because educational institutions educate people about the goals of the future life. Teachers, administrators and schools are the ones who determine the direction of people's expectations, dreams and success through education (3). It is the responsibility of the manager to motivate and encourage employees in organizations. The level of success a teacher achieves is highly affected by his/her motivation, and this is strongly related to the leadership role of the school administrator (2). Teachers who do not have the necessary needs and do not expect this will have lower motivation and work efficiency (4).

Instructional leadership features are among the characteristics that school administrators must have in order to increase the motivation of teachers, school staff and students.

The concept of instructional leadership, which first gained popularity in the late 70s with the emergence of research on successful or effective schools in western countries, is the process of making the school environment more efficient and beneficial (5). The instructional leadership behavior exhibited by school administrators plays an important role in the education system and constitutes a vital dimension in increasing the quality of education and training in schools and the effective management of human resources (2).

Although instructional leadership characteristics are critically important for school administrators, the level at which school administrators have these characteristics and how these characteristics affect teacher motivation have not been adequately examined. In order to make a contribution to filling this gap in the literature, this study aims to determine the instructional leadership behavior levels of school principals based on teachers' opinions and to reveal the relationship between the instructional leadership behavior levels of school principals and teachers' professional motivations.

**Method.** Quantitative methods and relational screening model were used in the research. The sample of the research consisted of 725 teachers working at different educational levels. The data of the research was collected using a survey form consisting of three parts. The first part included a personal information form targeting demographic information. The second part included the Instructional Leadership Behavior Scale, which was developed by Şişman (2016) and consists of 50 items and 5 sub-dimensions in a 5-point Likert type. The reliability coefficient of the scale was reported as 0.92 (6). The third part included the Teacher Professional Motivation Scale, which was developed by Karabağ et al. (2020) and consists of 25 items and 4 sub-dimensions in the 5-point Likert type. Reliability coefficients of the scale have been reported as 0.76 and above (7). The data of the study were analyzed using descriptive statistics and multiple linear regression analysis on the IBM SPSS 25 program. Statistical significance was sought at the 0.05 level.

**Results.** According to the findings showing the demographic characteristics of the participants in Table 1, it is seen that 94.2% of the participating are women and 5.8% are men. While 5.2% of the participants are under the age of 25, 20.8% are between the ages of 25-35, 44.6% are between the ages of 35-50 and 29.4% are over 50 years old. While 54.6% of the participants have a bachelor's degree, 45.4% have a master's or doctorate degree. While 18.9% of the participants have been teaching for less than 5 years, 11.4% have been teaching for 6-10 years, 26.2% for 11-20 years, and 43.4% for more than 21 years. While 31.4% of the participants stated that they had been working in their institution for less than 5 years, 9.5% stated that they had been working for 6-10 years, and 59% stated that they had been working for more than 11 years.

***Table 1. Demographic Characteristics of Participants***

| Variables | Groups | f | % |
|---|---|---|---|
| Gender | Female | 683 | 94.2 |

| | | | |
|---|---|---|---|
| | Male | 42 | 5.8 |
| Age | 25 and below | 38 | 5.2 |
| | 25-35 | 151 | 20.8 |
| | 35-50 | 323 | 44.6 |
| | 50 and above | 213 | 29.4 |
| Levels of Education | Bachelor's degree | 396 | 54.6 |
| | Master's degree or doctorate degree | 329 | 45.4 |
| Work Experience | 1-5 years | 137 | 18.9 |
| | 6-10 years | 83 | 11.4 |
| | 11-20 years | 190 | 26.2 |
| | 21 years and above | 315 | 43.4 |
| Experience in the Institution | 1-5 years | 228 | 31.4 |
| | 6-10 years | 69 | 9.5 |
| | 11 years and above | 428 | 59.0 |

Table 2 shows teachers' instructional leadership perceptions of school administrators and the average professional motivation score of teachers. It is understood that teachers perceive the instructional leadership characteristics of school administrators at a similar level and relatively high (between 3.81 and 3.98). However, it is seen that the highest level of instructional leadership characteristic of school administrators perceived by teachers is "management of the curriculum and teaching process", and the lowest level of instructional leadership characteristic is "support and development of teachers". The average professional motivation score of teachers was found to be 3.86, slightly above the average.

***Table 2. Teachers' Perceptions of Instructional Leadership and Professional Motivations Regarding School Administrators***

| **Scales** | **Mean** | **Sd.** |
|---|---|---|
| Determining and Sharing School Goals | 3.92 | 1.13 |
| Management of Curriculum and Teaching Process | 3.98 | 1.13 |
| Teaching Process and Evaluation of Students | 3.96 | 1.13 |
| Support and Development of Teachers | 3.81 | 1.18 |
| Creating a Regular Teaching and Learning Environment and Climate | 3.95 | 1.17 |
| Teachers' Professional Motivation Score | 3.86 | 1.06 |

The results of the regression analysis conducted to determine how the instructional leadership behaviors of school administrators affect teachers' motivation are shown in Table 3. The findings showed that the model created was statistically significant and that the instructional leadership behaviors of school administrators explained 42% of the variance in teachers' motivation. According to the results, the characteristics of school administrators "determining and sharing school goals", "management of the education program and teaching process", "evaluation of the teaching process and students" and

"supporting and developing teachers" do not have a statistically significant effect on teachers' professional motivation. On the other hand, school administrators' ability to "create a regular teaching and learning environment and climate" affects teachers' professional motivation significantly and positively ($\beta$=0.273, $p$<0.01).

***Table 3. The Effect of Instructional Leadership Characteristics on Motivation***

| **Variables** | **B** | **S.E.** | $\beta$ | $t$ | $p$ |
|---|---|---|---|---|---|
| Constant | 1.427 | 0.112 | | 12.755 | 0.000 |
| Determining and Sharing School Goals | 0.119 | 0.075 | 0.128 | 1.588 | 0.113 |
| Management of Curriculum and Teaching Process | 0.100 | 0.119 | 0.106 | 0.837 | 0.403 |
| Teaching Process and Evaluation of Students | 0.151 | 0.108 | 0.162 | 1.399 | 0.162 |
| Support and Development of Teachers | -0.003 | 0.086 | -0.003 | -0.031 | 0.975 |
| Creating a Regular Teaching and Learning Environment and Climate | 0.246 | 0.094 | 0.273 | 2.634 | **0,009** |
| $F_{(5, 719)} = 104.316$, $p < 0.01$, $R^2 = 0.420$ | | | | | |

**Conclusion.** In this research, the instructional leadership characteristics of school administrators were examined based on the opinions of the teachers, and the effects of teachers' perceptions of the instructional leadership characteristics of their administrators on their professional motivation were investigated. The findings of the research showed that teachers evaluated school administrators as slightly above average in terms of instructional leadership qualities. Teachers think that administrators show the instructional leadership feature of managing the curriculum and teaching process at a higher level, but that administrators show the instructional leadership feature of supporting and developing teachers at a lower level. Findings showed that the instructional leadership characteristics of school administrators are an important determinant of teachers' motivation. However, it has been concluded that among the instructional leadership characteristics, only the feature of *creating an orderly teaching and learning environment and climate* affects teachers' motivation significantly and positively. This finding was interpreted as if school administrators succeed in creating a regular teaching and learning environment and climate in schools, teachers' motivation will be higher. The findings obtained from this research are largely compatible with the findings of previous studies in the literature (2,8,9,10,11).

Based on the results obtained from the research, some suggestions can be made for practitioners and future research. Since it has been determined that the instructional leadership characteristics of school administrators are a positive determinant of teachers' motivation,

the development of the instructional leadership characteristics of school administrators should be planned. School administrators should be inspired, encouraged and guided to create a regular teaching and learning environment and climate in their schools. Future studies should examine the relationship between school administrators' instructional leadership and teacher motivation in different regions and sample groups. In addition to teachers, students, parents and school employees should also be considered as samples in research.

**Scientific innovation:** A study of leadership behaviors affecting teachers' professional motivation.

**Practical importance and relevance:** It is important to instruct school principals on leadership behaviors that will influence teacher motivation.

**References:**


1. Kurt, B., İlkokul ve ortaokul yöneticilerinin öğretim liderliği davranışlarının öğretmen motivasyonuna etkisi, Yüksek Lisans Tezi, Marmara Üniversitesi Eğitim Bilimleri Enstitüsü, İstanbul, 2013.
2. Sucu, A., Öğretmenlerin motivasyonu ile okul yöneticilerinin öğretimsel liderlik davranışları arasındaki ilişkinin analizi, Yüksek Lisans Tezi, İnönü Üniversitesi, Malatya, 2016.
3. Çalış, H., Öğretmen motivasyonunda yönetici yaklaşımlarının incelenmesi (Kocaeli İli Gölcük İlçesi Örneği), Yüksek Lisans Tez, Yeditepe Üniversitesi, İstanbul, 2012.
4. Ergen, Y., İlköğretim okulu müdürlerinin öğretim liderlik davranışlarının öğretmenlerin motivasyonu üzerindeki etkisi, Yüksek Lisans Tezi, Celal Bayar Üniversitesi Sosyal Bilimler Enstitüsü, Manisa, 2009.
5. Çelik, V., Türk Eğitim Sisteminde Yeni Paradigma Arayışları. Eğitim-Bir Sen, Ankara, 2006 – 126 c.
6. Şişman, M., Şişman Öğretim Liderliği Davranışları Ölçeği: Geçerlik, güvenirlik ve norm çalışması, Kuram ve Uygulamada Eğitim Yönetimi, 22(3), 2016, 375-400 c.
7. Karabağ Köse, E., Karataş, E., Küçükçene, M. and Taş, A., Öğretmen mesleki motivasyonu ölçeği geçerlik ve güvenirlik çalışması: çevrimiçi ve kâğıt kalem uygulamalarının karşılaştırılması. Pamukkale Üniversitesi Eğitim Fakültesi Dergisi, 51, 2021, 479-498 c.
8. Bingöl, E. İlk ve ortaokul yöneticilerinin öğretimsel liderlik özelliklerinin öğretmenlerin motivasyon düzeyi ve problem çözme becerilerine olan etkisi, Yüksek Lisans Tezi, Hasan Kalyoncu Üniversitesi, Gaziantep, 2014.
9. Çilesiz, A. Okul müdürlerinin öğretimsel liderlik özelliklerine ilişkin ortaokul öğretmenlerinin görüşleri (Samsun İli Örneği), Yüksek Lisans Tezi, On dokuz Mayıs Üniversitesi Eğitim Bilimleri Enstitüsü, Samsun, 2019.
10. Cengiz, F., Okul müdürlerinin öğretim liderliği davranışlarının öğretmenlerin iş doyumuna etkisi, Yüksek Lisans Tezi, Yıldız Teknik Üniversitesi, İstanbul, 2015.
11. Sağır, M., İlköğretim okulu yöneticilerinin öğretimsel liderlik rolleri ve karşılaştıkları sorunlar, Doktora Tezi, Abant İzzet Baysal Üniversitesi, Sosyal Bilimler Enstitüsü, Bolu, 2011.



**E-mail:** xeyale.ehmedzade@baku.edu.gov.az



**Redaksiyaya daxil olub:** 05.02.2024.

*UOT 37*

***Adilə Həsən qızı Nəzərova***
*Azərbaycan Respublikası Təhsil İnstitutunun aparıcı elmi işçisi*
*filologiya üzrə fəlsəfə doktoru,*
***Orcid**: 0000-0002-4340-6882*

## NƏSİMİNİN FƏLSƏFİ GÖRÜŞLƏRİNİN ŞƏXSİYYƏTİN FORMALAŞMASINA TƏSİRİ

***Адиля Гасан гызы Назарова***
*ведущий научный сотрудник Института*
*Образования Азербайджанской Республики,*
*доктор философии по филологии*

## ВЛИЯНИЕ ФИЛОСОФСКИХ ВОЗЗРЕНИЙ НАСИМИ НА ФОРМИРОВАНИЕ ЛИЧНОСТИ

***Adilya Hasan Nazarova***
*leading researcher of the Institute*
*Education of the Republic of Azerbaijan,*
*doctor of philosophy in philology*

## INFLUENCE OF THE PHILOSOPHICAL VIEWS OF NASIMI ON THE FORMATION OF PERSONALITY

**Xülasə.** Nəsiminin şeirlərində sözlərin təsir gücü yüksəkdir, inandırıcıdır. Bu cür ifadə forması şairin yaradıcılığının bədii zirvəsi, həm də ədəbi şəxsiyyətinin mahiyyətidir. Nəsimi bütün şeirlərində cəsarətlidir, bütövlükdə yaradıcılığını əhatə edən əxlaq, mərdlik, şərəf, ləyaqət, həqiqət, ədalət, özünəinam anlayışları Nəsimi şəxsiyyətinin mahiyyətini ifadə edir. Əsarətə, mütiliyə, yalana qarşı gələn şair şagirdlərə öz əqidəsi yolunda şərəf və ləyaqətini qorumağı öyrədir. Ümumtəhsil məktəblərində Nəsimi poeziyasının tədrisi müasir gəncliyin şəxsiyyətinin formalaşmasında olduqca böyük rol oynayır.
***Açar sözlər:*** *şəxsiyyətin formalaşması, özünü tərbiyə, inam, anlayış, təhsil, qəzəl*

**Резюме.** Воздействие слов в стихах Насими сильное и убедительное. Данная форма выражения является художественной вершиной творчества поэта, а также сущностью его литературной личности. Насими во всех своих стихах отличается нравственностью, храбростью, честью, достоинством, правдой, справедливостью и уверенностью в себе, охватывающим его творчество в целом, выражающим сущность личности Насими. Выступая против рабства, унижения и лжи, поэт наставляет учащихся защищать свою честь и достоинство на пути достижения своих убеждений. Преподавание поэзии Насими в общеобразовательных школах играет важную роль в формировании личности современной молодежи.

***Ключевые слова:*** *формирование личности, самовоспитание, вера, понятие, образование, газель*

**Summary.** The impact of words in Nasimi's poetry is high and convincing. This form of expression is the artistic peak of the poet's creativity, as well as the essence of his literary personality. Nasimi is brave in all his poems, and the concepts of morality, bravery, honor, dignity, truth, justice, and self-confidence, which cover his creativity express the essence of Nasimi's personality. Opposing slavery, obstinacy, and lies, the poet teaches students to protect their honor and dignity in the path of their beliefs. Teaching of Nasimi's poetry in secondary schools plays very important role in the formation of the personality of modern youth.

***Keywords:*** *formation of personality, self-discipline, confidence, understanding, education, ghazal*

Nəsimi yaradıcılığında insanın özünüdərk problemi Azərbaycan ədəbiyyatında psixoloji fikrin inkişaf etməsinə də təsirini göstərmişdir. Şair şəxsiyyətin mənəvi-psixoloji azadlığını tələb edərək, insanı yaradıcı düha olaraq təqdim və tərənnüm edir. Nəsiminin fikrinə görə, insanın olduqca mürəkkəb quruluşu var. O, genetik cəhətdən şərtlənmiş varlıq olduğu kimi, sosial cəhətdən də fərdi xüsusiyyətlərə malik şüurlu varlıqdır. İnsanın davranışlarını tənzimləyən bu amillər şəxsiyyətin formalaşmasında da rol oynayır, onun həyatda tutduğu mövqe həmin keyfiyyətlərə əsaslanır. Genetik cəhətdən fərqli olaraq, sosial cəhətdən qazandığı müsbət xüsusiyyətləri təşəkkül etdirməklə insan həm də özünü tərbiyə edir. Şairə görə insan şəhvətə, qəzəbə, kinə, həsədə və s. insanı nüfuzdan salan hisslərə o zaman meyl edir ki, özündəki müsbət keyfiyyətləri inkişaf etdirə bilmir, özünütərbiyədən uzaqlaşır. Bu da şəxsiyyəti özünüdərkdən uzaqlaşdırır.

İ. Nəsiminin həyat və yaradıcılığı əsasən, ümumtəhsil məktəblərinin VIII və X siniflərində tədris edilir. Şagirdlərdə tərbiyəvi ideyaların öyrənilməsi və inkişafı prosesində Nəsimi şeirinin əvəzsiz rolu vardır. Şairin bədii irsinin ideya dəyəri tam dolğun təsəvvür yaratdığı üçün şagirdlərə VI sinifdən başlayaraq yuxarı siniflərdə tədris olunması daha məqsədəuyğun olar. Təbiidir ki, şairin şeirlərinin məzmunu və məna dəyəri şagirdlərə öyrədilərkən dini-fəlsəfi şeirləri qədər də tərbiyəvi-didaktik şeirləri nümunə gətirilir. Çünki, pedaqoji ədəbiyyatda didaktik nümunələrin mövzusu həm təhsil, həm də təlim nəzəriyyəsi kimi, bəzən də hər ikisinin vəhdəti kimi nəzərdən keçirilir ki, bu daha düzgündür.

Nəsimi malik olduğu genetik və sosial keyfiyyətləri müsbətə doğru inkişaf etdirərək öz ideyaları uğrunda inadla mübarizə aparmış, bu yolda misilsiz səbr, dəyanət göstərmişdir. Ona Allahsız deyənləri tənqid etmiş, onlara "mən"lərini tanıması üçün yollar göstərmiş, özünüdərkə çağırmışdır. İnsanın qüvvəsini, qüdrətini öz "mən"i üzərində göstərmişdir:

Mən mülki-cəhan, cəhan mənəm, mən,
Mən həqqə məkan, məkan mənəm, mən.
Mən ərşilə fərşü kaf-u nünəm,
Mən şərhi bəyan, bəyan mənəm, mən.
...Mən cümlə cahani-kainatəm,
Mən dəhri-zəman, zəman mənəm, mən.

Nəsimi bu misraları ilə hər şeyin "mən"də - insanda olduğunu deyirdi. Yer, göy, "kaf-u nün" (Tanrının "Ol!" əmrinə işarədir), bütün varlıq, dünya insandadır. İnsan surətdə və mənada

həqiqətdir, buna görə də həqiqəti – yəni özünü bəyan etməlidir.

Şair hesab edir ki, insanın öz üzərində qələbə çalması, mənəvi qəhrəmanlığı nəfsini öldürməsidir. İlahi eşqin yolunu tutan insan öz ruhunu qidalandırır, həqiqətə yaxınlaşan insan artıq o nuru özündə gəzdirir, "mən"ini tapır - "mən" zərrədir:

Bir ovuc tozdur küləklər qarşısında bu bədən.
Ömrümüz qor tək ərir hər bir Günəşdən, şölədən.

İnsan üçün mərifətdən
özgə yoxdur bir bəzək,
Aqil insan zər üçün öz ömrünü vermə
z hədər.

Nəsiminin şeirləri insanı qəlbi ilə, mənəvi dünyası ilə, ümumilikdə dünya ilə münasibətləri özündə cəmləşdirir və bu münasibətlərın müsbət fonunla kamilləşir. Nəsimi özü kamil insan nümunəsidir. O özünü təqdim etməklə insanları da özünü tanımağa, onların öz dəyərlərinin fərqində olmağa çağırır. Əslində bu təqdimatla da kamil insan modelinin sirləri açılır.

Orta məktəblərdə ədəbiyyat dərslərində aparılan müzakirələrdə şagirdlər Nəsiminin ədəbi irsinin müasir dövrümüzdə daha əhəmiyyət kəsb edən tərbiyəvi əhəmiyyətli şeirləri ətrafında fikir mübadiləsi aparırlar. Bu, onlara həm yeniyetmə, həm də gənclik yaşlarında qərar verib nəticə çıxarmağa kömək edir.

*"...Tərbiyə işinin tarixi insanlığın tarixi qədər qədimdir. Öyrətmək, yol göstərmək, istiqamət vermək işi yer üzündə ilk insanların yaşadığı dövrdən başlamışdır. Tədriclə həyat inkişaf edib ictimai-iqtisadi formasiyalar dəyişdikcə, xalqlar formalaşdıqca pedaqoji fikirlər toplumu yaranmışdır: bu, xalq pedaqogikasıdır. Hər xalqın öz pedaqoji baxışları, şəxsiyyətin doğru-dürüst böyüyüb boya-başa çatması ilə bağlı fikirləri var, və o, əsrlərin sınağından çıxdığı üçün etibarlıdır." (1,s.14)*

Nəsiminin insan obrazı Haqq insan münasibətləri müstəvisindədir. Şairin poeziyası bütün mayasını, məzmun, ideya və bədii-fəlsəfi gücünü məhz bu münasibətlərin – hürufi etiqadından, ona inanclarının enerjisindən alır. Onun Nəsiminin yaradıcılığının panteizm fəlsəfəsinin müddəaları əsasında işlənməsi şərh edilir. Panteizmə görə bütün kainat Tanrıdan ibarətdir, qalan şeylər, həmçinin canlılar, o cümlədən insan da vahid Tanrının hissəcikləridir. Bir zaman Tanrı ilə vəhdətdə olan hissəciklər öz əsillərindən ayrı düşdükləri üçün dərin kədər hissi keçirir, odur ki, bu arzuya çatmaq üçün insan kamilləşməlidir. Nəsimiyə görə insanın kamilləşməsi üçün insanlığın kamilləşməsi gərəkdir. Şəxsiyyətin formalaşması və inkişafı, yəni kamil insanın yetişməsi tərbiyədən başlayır. Tərbiyə isə məktəb yaşlarından mənəvi, fiziki, əqli, estetik, etik, dini, hüquqi və s. tərbiyə ilə yetişdirilməkdən asılıdır. Şairin fəlsəfi görüşləri həyata yeni atılan yeniyetmə və gənclərin bir şəxsiyyət kimi formalaşmasına təsir edir, onları öz soy köklərinə bağlı yetişməyə, böyüklərinə hörmət etməyə, ənənələrinə bağlı olmaya sövq edir.

*Müasir ədəbiyyat dərslərində İmadəddin Nəsiminin həyat və yaradıcılığının öyrənilməsi şagirdlərin yüksək mənəvi keyfiyyətlərə, fəal həyat mövqeyinə malik, müstəqil, yaradıcı şəxsiyyət kimi formalaşmasında mühüm rol oynayır.* (2, s.65)

Professor Yaşar Qarayev yazırdı ki, "elm Darvinin şəxsində insanın meymun mənşəyini, ədəbiyyat

(poeziya) isə Nəsiminin şəxsində ilahi mənşəyini kəşf etdi."

Nəsiminin bədii sənəti ümumilikdə insanın gözəlliyinə, ucalığına, aliliyinə səslənən himnİdir. Bu keyfiyyətlər ancaq özünü dərk edən kamil insanlara xas xüsusiyyətlərdir.

Nəsiminin humanistliyi bunda idi ki, nadan insanların məhvinə hökm vermir, əksinə onları islah olmağa, haqq yoluna gəlməyə, özünütərbiyəyə dəvət edirdi. Buna görə də, şairin əsərləri bütün dövrlərdə olduğu kimi, indi də bəşəriyyətin xilası uğrunda bir silahdaş olaraq çıxış edir. Bu tendensiyalar orta məktəb şagirdlərinin bir şəxsiyyət kimi inkişafına, onun təlim-tərbiyəsinin inkişafına, onların gələcək perspektivlərinə təsir göstərən amillərdəndir.

Araşdırmalar göstərir ki, ümumtəhsil məktəblərdə Nəsiminin tədrisinə ayrılan saatlar (2 saat) şairin şəxsiyyətinin, yaradıcılığının və ədəbi irsinin birlikdə təqdim olunması üçün yetərsiz qalır. Halbuki tərbiyə, əxlaq, mərdlik, cəsarət, iradə və s. kimi keyfiyyətlər şəxsiyyətin bütövləşməsi baxımından əsas göstəricidir. Bu qədər öyrədici və yetişdirici olduğu təqdirdə Nəsimi irsinin öyrənilməsinə orta məktəblərdə daha çox yer ayrılması məqsədəuyğundur.

Dahi şairin sənətindəki dərin humanizm ideyaları əxlaq tərbiyəsinin poetik təbliği baxımından mühüm əhəmiyyət kəsb edir. Onun dərin humanizmi qlobal-bəşəri mahiyyət daşıyırsa, yüksək poetik sənətkarlığı, dilinin şirinliyi və axıcılığı, heyrətamiz poetik ritmi xalqının estetik zövqünün kamilləşməsində önəmli rol oynayır.

Bildiyimiz kimi, pedaqogika elminin qarşısında duran başlıca problemlərdən biri təhsilin məzmunca işlənilmə məsələsidir. Xüsusən humanitar fənlərin hansı məzmunda işlənilməsi yetişməkdə olan gənc nəslin gələcək inkişafında mühüm rol oynayır. Tədris edilən hər bir fənn şagirdlərə müəyyən bacarıqlar, keyfiyyətlər aşılamaqla yanaşı, həm də onların həyatda tətbiq edilməsinə kömək edir. Bu baxımdan ədəbiyyat fənninin imkanları xeyli genişdir. Azərbaycan dili və ədəbiyyatının tədrisi strateji əhəmiyyət kəsb edən məsələlərdəndir. Ədəbiyyat dərslərində Nəsiminin şeirlərinin öyrədilməsi şagirdlərin təbiət, cəmiyyət və insan haqqındakı düşüncələrinin inkişafına, onların bir şəxsiyyət kimi kamil yetişməsinə təsir edir. Nəsimi şeirləri orta məktəbin yuxarı siniflərində təhsil alan yeniyetmələrə və gənclərə ictimai hadisələri düzgün qiymətləndirməkdə, baş verən hadisələrdən doğru nəticə və qərar çıxarmaqda, ümumiyyətlə, həyatı dərk etməkdə doğru yol göstərir, onlara milli və yüksək bəşəri ideyalar, yüksək əxlaqi dəyələr, azadlıqsevərlik, humanizm və s. kimi keyfiyyətlər aşılayır. Nəsiminin əsərlərinin bədii təsir gücü şagirdləri istənilən məqsədə istiqamətləndirməyə qadirdir. Şeirlərindəki "mən" gənc oxucunun qəlbində silinməz izlər buraxır. Tədqiqatlardan müəyyən olur ki, Nəsiminin əsərləri şagirdlərin dünyagörüşünün formalaşmasına, onların şəxsiyyətinin inkişafına çox böyük müsbət təsir göstərir.

"Nəsimi ili"ndə Nəsimi irsinin daha çox təbliği məqsədilə fars dilindən Azərbaycan dilinə tərcümə olunan "İmadəddin Nəsimi – 40 qəzəl" kitabında şairin 40 qəzəli Azərbaycan oxucusuna təqdim edildi. Həmin kitabda da əxlaqi, tərbiyəvi əhəmiyyətli fikirlər aşılayan çoxlu qəzəllər vardır. Nəsimi poeziyasında "İnsan kimdir və nəyə qadirdir?" sualının cavabını da məhz hürufi təriqətinə inamda, ondakı hikmətdə tapmaq olar. Çünki bu cavabların dini-fəlsəfi və bədii izahı, məntiqli açıqlaması həmin etiqaddakı İnsan-Allah münasibətlərinə dayanır. İnsan-Allah münasibətlər sisteminin

mahiyyəti ümumilikdə bir neçə müddəada cəmləşir. Bu müddəalar bir neçə qoldan ibarətdir ki, onlardan ən önəmlisi budur: İnsan haqdır; Haqq İnsandadır. Bu tezis Nəsimi yaradıcılığında "İnsan kimdir?" sualına cavab verir və İnsan-Allah münasibətlərinin əsasını təşkil edir. Göründüyü kimi Nəsiminin fəlsəfi poetikasının əsasında Tanrıya olan səmimiyyəti və inamı dayanır, onun dini-fəlsəfi görüşləri Şərq mədəniyyətindən kənara çıxmır.

"İmadəddin Nəsimi – 40 qəzəl" kitabından "Onuncu qəzəl"dən bir neçə beytə nəzər salaq:

Yüksək, aşağı bilməz, Tövhid[1]
məqami, ey can,
Haqq yolçusu seçilməz, tərsadı ya
müsəlman.

"Mən"-"sən" sözün yığışdır, Surətlər*
aləmində,
Məna göyündə ancaq, insan gərəkdi,
insan!

Haqq nuri parlayınca, birdir bütün
boyaqlar,
Göydən seçilməz ulduz, parlaq günəş
doğan an.

Sən Tanrının vücudi, həm Tanrının
nişanı,
Sən Tanrımı ararsan? İlk öncə qəlbini
an. (3, s.38)

Nəsiminin bütün yaradıcılığını izləyərkən, görünür ki, şairin öz mövqeyini, xüsusilə insan haqqındakı yüksək düşüncələrini oxucuya təlqin etmə gücü var. Bu güc İnsanı təqdim epiteti kimi Nəsiminin şair, filosof və İnsan "mən"inin başlıca qayəsidir.

Şəxsiyyət problemi həmişə ümumilikdə Şərq fəlsəfəsinin, klassik ədəbiyyatın, pedaqoji və psixoloji fikrinin hədəfi olmuşdur. Şəxsiyyətin inkişafında klassik poeziyanın əsasını təşkil edən öyüd-nəsihətin, məsləhətin, insan sevgisinin, haqqa-ədalətə çağırışın rolu danılmazdır. Nəsiminin fəlsəfi şeirləri öz gücü və keyfiyyəti ilə insanı ilahiləşdirən, eyni zamanda onu bəşər səviyyəsindən daha ucalığa qaldıran xüsusiyyətləri ilə seçilir. Hürufi ideyalarına əsaslanan şair insanı müqəddəsləşdirərək ucaldır. Şairi hürufi təliminə sövq edən də insanın şərəfləndirilməsi ideyası idi.

Həmid Araslı İ. Nəsimi haqqında yazır. *"Onun yaradıcılığı ədəbiyyatımızın ən maraqlı səhifələrindəndir. Nəsiminin əsərlərində insan, insan ləyaqəti, insan qüdrətinə inam geniş əksini tapmışdır."* (1, s.82)

Nəsimi qəzəllərindəki qərarlılıq, sözünün əri olma, cəsarətli xarakterləri əks etdirən özünüifadə formaları ilə insan şəxsiyyətinin inkişafına təsir edir.

Nəsiminin dünyəvi şeirləri olduqca rəngarəngdir. Həmin əsərlərdə şair həyati hadisələri, insana məhəbbəti və qəlb gözəlliyini tərənnüm etmiş, eyni zamanda ictimai məzmunlu, fəlsəfi mənalarını təbiətlə vəhdətdə təsvir etdiyi mövzulara həsr etmişdir. "Neylərəm?", "Yanaram", "Yar zülfü", "Yaxşı" və s. qəzəlləri şəxsiyyəti formalaşdıran insana məhəbbəti tərənnüm edir. Bu qəzəllərin bəzilərinin müasir ədəbiyyat dərsliklərinə salınması problemin həllinə müəyyən qədər kömək edə bilər.

"İmadəddin Nəsimi-40 qəzəl" kitabındakı yeddinci qəzəldən bir beytə baxaq:

Tən etmə sayqısızca, pərvanə
odda yansa,
Yox çarəsi, nə etsin? Şəmi-
camalə çatdı. (3, s.29)

[1] Tövhid və Surət aləmləri İrfanda Tanrıya və ideyalara (surətlərə) məxsus aləmlərdir. Tövhid həm də Vəhdət-i vücuda işarə edir, yəni insan Tanrıdan ayrı deyil, onun özüdür.

Nümunədə şair tənə etməyi, sayğısızlığı tənqid edir, çarəsiz olana xoşgörü ilə yanaşmağı, ona kömək etməyi məsləhət görür. Bu Nəsiminin milli-mənəvi dəyərlərə, dini dəyərlərə nə qədər həssaslıqla yanaşdığını göstərir. Bu dəyərlərin insan əxlaqının formalaşmasına təsirini bildirir. İnsanda yüksək dərəcəli mənəvi keyfiyyət hesab olunan ünsiyyət, dostluq, yüksək biliyə və dünyagörüşünə sahib olmaq, başqaları üçün nümunə olmaq, ətrafdakıların rəğbət və hörmətinə, sevgisinə sahib olmaq, gələcəkdə tutacağı mövqeni təmin edəcək xüsusiyyətlərdən biri də səbirdir. Səbir insani xüsusiyyətlərdən biri kimi yeniyetməlik yaşlarında yaranır. Bu beytdə şair gənc nəsli şəxsi həyatlarında baş vermiş bir sıra uğursuzluqları, xoşagəlməz halları dözüm və səbirlə qarşılamağa çağırır.

Şairə görə hər insan dünyaya təmiz gəlir, amma pis vərdişlər, ehtiraslar, dünyaya aludə olub, özünü aldatmağa, öz mənşəyini tanımağa ona maneə yaradır. Bu maneələrdən xilas olmaq üçün bu qəribə dünya ilə yaxından tanış olmaq, kainatın və insanların ayrılmaz bir bütöv olduğunu başa düşməyə çalışmaq lazımdır.

Möhkəm mənəvi bütövlük və kamillik İmadəddin Nəsiminin idealıdır. Orta əsrlər Azərbaycan poeziyasında insanı Nəsimi qədər uca və möhtəşəm səviyyədə, qüdrətli təqdim edən sənətkar göstərmək çətindir. O, klassik ədəbiyyatda xüsusi yer tutan humanizm fəlsəfəsini yeni mərtəbəyə qaldırmışdır. Akademik İsa Həbibbəylinin qeyd etdiyi kimi, *"...Nəsiminin həyat və yaradıcılığının ali və orta məktəblərdə tədrisi, dərsliklərdə tutduğu yer məsələlərinə də yenidən qayıtmağa borcluyuq. Bütün dünya bu reallığı bir daha bilməlidir ki, İmadəddin Nəsimi cahana və zamana sığmayan, əbədiyaşar Azərbaycan şairidir. Nəsimi Azərbaycan ədəbiyyatı və ictimai fikri qarşısındakı böyük xidmətləri ilə ölməzlik qazanmış qüdrətli sənətkardır."* (4)

Nəsimi böyük əqidə adamı, öz ideyaları uğrunda dönməz mübarizə aparan əzmkar şəxsiyyətdir. Onun həyatı və yaradıcılığı özündən sonrakı nəsillər üçün həmişə ideal insan nümunəsi olaraq təbliğ edilmişdir. Nəsiminin həm həyat yolu, bənzərsiz bədii əsərləri Azərbaycanda məktəb qurulandan bugünədək tədris olunmağa başlamışdır. Müstəqillik dövründə isə Nəsiminin həyatı və yaradıcılığı yeni aspektdə tədqiq edildi. Tədqiqatlar şairin bədii irsində yer alan yeni şifrələrin açılmasını göstərir.

**Problemin aktuallığı.** Nəsimi şeirlərindəki fikir və ifadə tərzi müasir pedaqoji fikrin əsas ideyaları ilə uyğunlaşır, şagirdlərə özünü tanımağın yollarını göstərir, doğru yolu tapmaqda istiqamət verir.

**Problemin yeniliyi.** Nəsimi yaradıcılığındakı lirizm və sözün təsir gücünün genişliyi ilə seçilir. Sözün təsir gücü insanı uşaqlıq, yeniyetməlik, gənclik çağlarından formalaşdırmağa başlayır. Buna əsasən, hər tədqiqat işi şairin yaradıcılığındakı yeni ideyaları açmağa imkan verir.

**Problemin praktik əhəmiyyəti.** Məqalə gənc tədqiqatçılar və ümumtəhsil məktəblərində dərs deyən ədəbiyyat müəllimləri üçün əhəmiyyətli olacaqdır.

**Ədəbiyyat:**


1. Bədəlova, Ə.S. Təlim-tərbiyə. -Bakı: ADPU-nəşriyyatı, -2015. -291 s.
2. Hüseynoğlu, S., Həsənli B., Nəsimi irsinin məktəbdə öyrədilməsi, Azərbaycan dili və ədəbiyyat tədrisi. -2019. №3-4
3. İmadəddin Nəsimi. 40 qəzəl. -Bakı: Qanun Nəşriyyatı, -2019, -128 s., -s. 38

*UOT 372.882*

***Şəhla İsmayıl qızı Ələkbərova***
*Elçin Qaranzadə adına 270 nömrəli tam orta məktəbin*
*Azərbaycan dili və ədəbiyyat müəllimi*
***Orcid***: *https://orcid.org/0009-0001-8933-0035*

## AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYATI FƏNNİNDƏ ŞAGİRDLƏRDƏ TƏNQİDİ TƏFƏKKÜRÜ FORMALAŞDIRAN TEXNİKALAR

***Шахла Исмаил гызы Алекперова***
*учитель азербайджанского языка и литературы*
*полной средней школы № 270 имени Эльчина Гаранзаде*

## ТЕХНИКИ, ФОРМИРУЮЩИЕ КРИТИЧЕСКОЕ МЫШЛЕНИЕ У УЧАЩИХСЯ ПО ПРЕДМЕТУ АЗЕРБАЙДЖАНСКИЙ ЯЗЫК И ЛИТЕРАТУРА

***Shahla Ismayil Alakbarova***
*Azerbaijani language and literature teacher at*
*secondary school number 270 named after Elchin Garanzade*

## TECHNIQUES THAT FORM CRITICAL THINKING IN STUDENTS IN THE SUBJECT OF AZERBAIJANI LANGUAGE AND LITERATURE

**Xülasə.** Tənqidi təfəkkürü formalaşdıran dərslər ənənəvi tədrisi olan dərslərdən fərqlənir. Şagirdlər müəllimə qulaq asaraq passiv oturmur, dərsin əsas personajına çevrilir, düşünür və xatırlayır, bir-biri ilə fikirlərini bölüşür, oxuyur, yazır, oxuduqlarını müzakirə edirlər. Məqalədə müzakirə olunan üsullar bu sahədə mövcud metodoloji inkişafın yalnız kiçik bir hissəsini əks etdirir. Onlar şagirdlərə daha müstəqil, tənqidi düşünən, məsuliyyətli və yaradıcı öyrənənlər olmağa kömək edir.
***Açar sözlər:*** *tənqidi təfəkkür, şagird, müəllim, İNSERT, Beyin həmləsi, Fasiləli oxu, klaster*

**Резюме.** Уроки критического мышления отличаются от традиционного обучения. Учащиеся не сидят, пассивно слушая учителя, они становятся главными героями урока, думают и запоминают, делятся своими мыслями друг с другом, читают, пишут и обсуждают прочитанное. Обсуждаемые ниже методы представляют собой лишь небольшую часть современных методологических разработок в этой области. Они помогают учащимся стать более независимыми, критически мыслящими, ответственными и творческими учениками.
***Ключевые слова:*** *критическое мышление, ученик, учитель, İNSERT, мозговой штурм, прерывистое чтение, кластер*

sahiblərindən qida mənbəyi kimi istifadə edirlər. Bakteriyalar hazır üzvi maddələrlə qidalanırlar, eyni zamanda qorxulu xəstəlikləri törədirlər.

Bakteriyaların təbiətdə əhəmiyyəti və rolu olduqca böyükdür. Bitkilər atmosferdə və torpaqda olan molekulyar azotdan istifadə edə bilmirlər. Yalnız azot fikse edən bakteriyalar adı şəraitdə atmosfer azotundan istifadə edib, onun üzvi azotlu birləşmələrə çevirirlər.

Bakteriyaların bəziləri oksigenli mühitdə (aerob) digəri isə oksigensiz mühitdə ( anaerob) yaşayırlar, Bakteriyaların yaratdıqları xəstəliklərin çoxu yayılmış infeksion xəstəlikləridir. Bu xəstəliklərə – qrip, angina, faringit, tetanus, vərəm, difteriya, qarın yatalağı, brüsselyoz, veba və s. kimi xəstəliklər aiddir. Göründüyü kimi bakterial xəstəliklər insanda tənəffüs yolları və s. kimi orqanlarda müəyyən problemlər yaradır. Lakın uzun müddətli antisanitariya şəraitində, gigiyena qaydalarına əməl edilməyən zibilli və çirkli suyu olan yerlərdə bakteriyaların inkişafı üçün münbit şərait yaradır. Bəzi bakteriyalar ərzaq məhsullarını yararsız vəziyyətə salmaqla insan sağlamlığı üçün təhlükə yaradır.

**Göbələklərin törətdikləri qüsurların insan sağlamlığına təsiri ilə əlaqədar valeoloji biliklər.** Müəllim biologiya dərslərində şagirdlərdə göbəklər və onun insan orqanizmində törətdiyi qüsurlar haqqında bilikləri formalaşdırdığı zaman valeoloji biliklərdə eyni vaxtda aşılanmalıdır.

Müəllim mövzu ilə əlaqədar göbələklərin həyat tərzi, qidalanma və xəstəlik törətmə yolları ilə əlaqədar şagirdlərdə bioloji bilikləri formalaşdırmalıdır. Göbəklər xlorofilsiz orqanizmlər olduğuna görə hazır üzvi maddələrlə qidalanaraq saprofit və parazit həyat tərzi keçirirlər.

Göbələklər yeməli, zəhərli və xəstəlik törətmə qabiliyyətinə malikdirlər. Ona görə də insanların göbəkləri tanımağı vacibdir. Göbələk insan orqanizminin hər yerində yaşayış. Onun qulaq, burun ,göz , dırnaq və dərinin bəzi yerlərində parazitlik edirlər. İnsan və heyvanların orqanizmində parazit göbəklərinin müxtəlif xəstəlikləri törədirlər. Onlar əsasən yaz aylarında sürətlə çoxları və yayılırlar.

Yoluxucu göbəklər xəstəliyi insanlara xəstənin ayaqqabısından istifadə etdikdə, hovuz, hamam, sauna və idman salonlarına antisanitar vəziyyətdə olduqda keçir. Göbələklərin insanlarda törətdikləri xəstəliklərə keçəllik , göbələk xəstəliyi, dırnaq göbələyi və s. aiddir. Sağlamlığı qorumaq üçün ilk növbədə göbələk xəstəliklərinin yayılmasına səbəb olan amilləri aradan qaldırmaq lazımdır.

İnsanların normal həyat tərzi sürməsi və onların valeoloji sağlamlığını mühafizə etmək məqsədilə hər bir xəstəliyin törəməsinin qarşısının alınmasından ötəri müvafiq valeoloji biliklərin təbliğatı aparılmalıdır. Müəllim şagirdlərə göbələk xəstəliklərinin yayılmasını məhdudlaşdırması üçün sanitar-gigiyenik və profilaktiki tədbirlərlə yanaşı maarifləndirici tədbirlərdə aparmalıdır.

**Parazit qurdlarla yoluxmanın sağlamlığa təsiri ilə əlaqədar valeoloji biliklər.** Biologiya dərslərində müəllim parazit qurdların xəstəliklərin törətməsinin və ya yayılmasının yollarını və bu qüsurların qarşısının alınması üçün aparılacaq tədbirləri şagirdlərə öyrətməlidir. Bağırsaq helmintozlarına yoluxmuş xəstələrin sayına görə dünyada xəstəliklər

arasında üçüncü yer tutur. Helmintlərin insan orqanizminə zərərli təsirlərinin mexanizmi olduqca müxtəlifdir. Onlar allergiyaya səbəb olaraq orqanizmin yoluxucu xəstəliklərə qarşı müqavimət qabiliyyətini aşağı salır. Helmintlər praktiki olaraq insanın bütün orqanlarında yaşaya bilir. Helmintlər qan damarları və toxumalara keçərək digər orqanlara miqrasiya edirlər. Parazit qurdların bəziləri insanda müəyyən xəstəliklər törədirlər, bu cür xəstəliklər helmintoz adlanır. Orqanizmi yoluxduran parazit qurdlar bir sıra əlamətlərlə özlərini göstərirlər - ishal, qəbizlik, köpmə və s. göstərə bilərik. Bizquyruq insanda - enterebioz xəstəliyi törədir. Yaranan xəstəliklərin ağırlıq dərəcəsi orqanizmə düşən parazit sayından asılıdır. Helmintozların insan sağlamlığında yaratdığı problemlərdən qurtulmaq üçün qabaqlayıcı profilaktik tədbirlərin aparılması vacibdir.

Müəllim mövzu ilə əlaqədar valeoloji bilikləri bioloji biliklərlə eyni vaxtda şagirdlərə ötürməli və onlarda profilaktiki tədbirlərin aparılması ilə əlaqədar bacarıqlar formalaşdırmalıdır. Müəllim helmintozların yayılmasının qarşısını almaqdan ötrü valeoloji biliklərə əsaslanmış sanitar-gigiyenik və profilaktiki tədbirlərin aparılması yollarını şagirdlərə öyrətməlidir. Helmintozların profilaktikası üçün insanlar şəxsi gigiyenaya və qidalanma gigiyenasına riayət etməlidir.

İnsan sağlamlığının təmin edilməsi üçün müəllim parazit qurdlardan özünü mühafizə etmək məqsədilə şagirdlərə valeoloji bilikləri öyrətməlidir. Müəllim bu istiqamətdə əvvəl ədəbiyyatlardan və İKT imkanlarından istifadə etməklə şagirdlərin arasında maarifləndirici tədbirləri aparmalıdır.

**Problemin aktuallığı.** Məqalə valeologiyası ilə əlaqədar onuncu siniflərdə bakteriyaların, göbələklərin, parazit qurdların, birhüceyrəli heyvanların və buğumayaqlıların törətdikləri qüsurların insan sağlamlığına təsiri ilə əlaqədar ilk dəfə olaraq valeoloji biliklərin tədrisinin imkanları araşdırlmışdır.

**Problemin elmi yenilikləri.** Məqalədə məktəb valeologiyasının tədrisində göstərilən təşkili formaları və yolları ilə valeoloji biliklərin öyrədilməsi təlimin keyfiyyətini yüksəlməsinə səbəb olur. İlk dəfə olaraq məktəbin onuncu siniflərində valeoloji biliklərin biologiya ilə əlaqəli tədrisinin imkanları müəyyənləşdirilmişdir.

**Problemin aktuallığı.** Aparılmış tədqiqat işinin elmi və praktik nəticələrindən tədris prosesində dərslik, dərs vəsaitlərinin və proqramların tərtibatında istifadə oluna bilər.

**Ədəbiyyat**

1. Sultanov, R.L. Valeoloji təhsilin keyfiyyətinin yüksəldilməsində müəllimin pedaqoji ustalığının rolu // Gəncə Dövlət Universitetinin Elmi əsərləri. −Gəncə, 2021. № 3. −s. 41-46
2. Sultanov, R.L. Təhsilalanların sağlamlığının qorunmasında və mühafizə edilməsində pedaqoji valeologiyanın imkanları // −Bakı: Bakı Qızlar Universitetinin Elmi əsərləri, −2020. № 3. -s. 178-181.
3. Sultanov, R.L. Ətraf mühitdə insan sağlamlığının qorunmasında valeoloji biliklərdən istifadənin imkan və yolları // Humanitar elmlərin öyrənilməsinin aktual problemləri. − Bakı, 2021. № 1. -s. 258-260.

**E-mail:** R.Sultanov@bk.ru
**Redaksiyaya daxil olub:** 30.04.2024

### *KİMYANIN TƏDRİSİ METODİKASI*
### *МЕТОДИКА ПРЕПОДАВАНИЯ ХИМИИ*
### *METHODS OF TEACHING CHEMISTRY*

*UOT 372.854*

***Gülnarə Nizami qızı İsmayılova***
*kimya üzrə fəlsəfə doktoru*
*Azərbaycan Dövlət Pedaqoji Universiteti*
***Orcid**: 0009 – 0001 – 6364 - 2313*

## KİMYA FƏNNİNİN TƏDRİSİNDƏ EKOLOJİ TƏHSİLİN ƏHƏMİYYƏTİ

***Гюльнара Низами гызы Исмайилова***
*доктор философии по химии*
*Азербайджанский Государственный Педагогический Университет*

## ВАЖНОСТЬ ЭКОЛОГИЧЕСКОЕ ОБРАЗОВАНИЕ В ПРЕПОДАВАНИИ ХИМИИ

***Gulnara Nizami Ismayilova***
*Doctorial of a Ph.D*
*Azerbaijan State Pedagogical University*

## THE IMPORTANCE OF ENVIRONMENTAL EDUCATION IN THE TEACHING OF CHEMISTRY

**Xülasə.** Məqalədə kimya dərslərində ekoloji təhsilin əhəmiyyəti və su mövzusunda ekoloji biliklərin aşılanması haqqında məlumat verilir. Şagirdlərə ətraf mühitin mühafizəsi, ekosistem, çirkləndirici maddələrin təbiəti haqqında təsəvvür yaratmağın yolları göstərilir. Hər bir kimya müəllimi mövzuların tədrisi prosesində çalışmalıdır ki, şagirdlərdə ekoloji bilik və mədəniyyət formalaşdırsın. Mövzuların inteqrativ tədrisi şagirdlərdə fənnə olan marağın artmasında xüsusi əhəmiyyət kəsb edir.
***Açar sözlər :*** *kimya eksperimenti, ekoloji təhsil, ətraf mühit, biosfer, su.*

**Резюме.** В статье представлена информация о важности экологического образования на уроках химии и привития экологических знаний о воде. Учащимся показаны способы создания представлений об охране окружающей среды, экосистеме, о природе загрязняющих атмосферу веществ. Каждый учитель химии должен в процессе преподавания предмета работать над формированием экологических знаний и культуры у учащихся. Интегративное преподавание предметов имеет особое значение для повышения интереса учащихся к предмету.
***Ключевые слова:*** *химический эксперимент, экологическое образования, окружающая среда, биосфера, вода.*

**Summary.** The article provides information about the importance of environmental education in chemistry classes and the inculcation of environmental knowledge about water. Student are shown ways to create an idea about environmental protection, ecosystem, nature of pollutants. Each chemistry teacher should work in the process of teaching subjects to form environmental knowledge

and culture in students. Inteqrative teaching of subjects is of particular importance in increasing students, interest in the subject.

***Key word:*** *chemical eksperiments, environmental education, environment, biosphere, water.*

Dünya insanların və digər canlıların rifahını təhdid edən çoxsaylı ekoloji problemlərlə üz-üzədir. Bu problemlərə iqlim dəyişikliyi, ətraf mühitin çirklənməsi, biomüxtəlifliyin itirilməsi, qida təhlükəsizliyi, xəstəlik pandemiyası, nüvə müharibəsi, kibercinayətkarlıq daxildir.

Canlılar üçün təhlükə yaradan problemlərdən biri də ətraf mühitdə biosferi çirkləndirən çürümə proseslərinin baş verməsidir. İnsan fəaliyyəti də ekologiyaya böyük ziyan vurur.

Hər bir sahədə çalışan insanlarda ekololji maarifləndirməni gücləndirmək bir sıra problemlərin qarşısının alınmasına yardım etmiş olar. Ekoloji maarifləndirmə ümumtəhsil məktəblərindən başlamalıdır. Belə qənaətə gəlmək olar ki, bütün yaş dövrü təhsil alanlar arasında ekoloji savadlılığı və məsuliyyəti inkişaf etdirmək ekoloji təhsilin mahiyyətidir. Ekoloji təhsil təkcə mövzu deyil, həm də davamlı inkişafı və qlobal vətəndaşlığı təşviq edən düşüncə və fəaliyyət tərzidir.

Ətraf mühitin çirklənməsi hava, su, torpaq və canlı orqanizmlərə təsir edən ciddi qlobal problemdir. Bəzi mənbələrə görə, ətraf mühitin çirklənməsi, əsasən də havanın çirklənməsi hər il 9 milyon insanın vaxtından əvvəl ölümünə səbəb olur.

Ekoloji təhsil insanların həyatında əlverişli mühit yaratmaq üçün vacibdir. Ekoloji təhsil təkcə təhsil sisteminin bir hissəsi deyil, həm də onun əsas hissəsi olmalıdır. Ədəbiyyat, tarix, təbiətşünaslıq mühüm sahələr olduğu kimi, ekoloji təhsil də ən azı bu sahələr qədər vacibdir. Ekoloji təhsil insanlarda təbiətə düzgün münasibət formalaşdırmaq üçün vacib bir aspektdir. Bununla da demək olar ki, gələcəkdə insan varlığı və inkişafı mümkündür. Ətraf mühitin öyrənilməsi və sağlamlaşdırılması üçün təşkil olunan tədbirlərdə əhalinin iştirakı vacib amillərdən olmalıdır.

Ekoloji təhsil məktəb dövründən başlanılmalıdır. Kimya fənni ekologiya ilə yaxın olan fənlər sırasındadır. Bu səbəbdən ekoloji təhsildə kimya müəllimlərinin üzərinə mühüm vəzifələr düşür.

Kimya və ekologiya arasındakı əlaqə kimyəvi birləşmələrin təbiət aləminə təsirinə və təbiət aləmində baş verən kimyəvi proseslərin başa düşülməsinə yönəlmişdir. Ekologiya canlılarla ətraf mühitin qarşılıqlı əlaqəsi və bu qarşılıqlı təsirlərin yayılması ilə məşğul olduğu halda, kimya canlıların və ətraf mühitdəki kimyəvi komponentlərin qarşılıqlı əlaqəsini və bu qarşılıqlı təsirlərin təbiət aləminə nəticələrini öyrənir. Məsələn, ekoloji bir tədqiqat tropik meşələrdəki bitkilərin növ müxtəlifliyini öyrənə bilər, kimyaçılar isə bu bitkilərdə olan kimyəvi birləşmələri öyrənir və onların dərman və ya sənaye tətbiqlərində istifadəsini araşdırır.

Şagirdlərə ekologiya ilə kimyanın əlaqəsini aşılamaq məqsədilə aşağıdakılardan istifadə etmək lazımdır: 1. Ətraf mühitin çirklənməsinin ekosistemlərin kimyəvi tərkibinə təsirini müzakirə etmək. 2. Kimyəvi proseslərin iqlim dəyişikliyinə və atmosfer tərkibinə necə təsir etdiyini araşdırmaq. 3. Şagirdləri fənlərarası yanaşma vasitəsilə ekoloji problemlərin həlli

yollarını araşdırmağa həvəsləndirmək.

Ekoloji təhsil şagirdləri ətraf mühitin mühafizəsi, davamlılığı və iqlim dəyişikliyi kimi ekoloji problemlər haqqında maarifləndirilməsi və onlara ətraf mühitin mühafizəsi üçün tədbirlər görmək səlahiyyətinin verilməsi prosesidir. Məktəblərdə ekoloji maarifləndirmə çox vacibdir, çünki o, şagirdlərdə ətraf mühitə qarşı məsuliyyət və mühafizəkarlıq hissini, həmçinin ekoloji problemlərin həlli üçün tədbirlər görmək üçün lazım olan bilik və bacarıqları inkişaf etdirməyə kömək edə bilər.

Kimya müəlliminin kimya fənninin tədrisində şagirdlərə ekoloji təhsil və ekoloji tərbiyəni aşılamaq üçün istifadə edə biləcəyi bir mövzuya aydınlıq gətirmək istəyirik. Mövzu olaraq " Su. Təbiətdə yayılması və xassələri."

Su və onun xüsusi xassələri; su obyektlərində gedən kimyəvi reaksiyalar; suyun çirklənməsi və çirkləndiricilərin mənbələri; ağır metal çirklənmələri.

Ekoloji kimyanı bu mövzuda göstərilən şəkildə sistemləşdirmək olar: (sxem 1)




*Sxem 1*

**Suyun kimyası və suyun çirklənməsi.** Su ətraf mühitin bütün hissələrində həyati əhəmiyyətli bir maddədir. Yer səthinin təxminən 70%-ni əhatə edir və ətraf mühitin bütün sahələrində lazımdır. Bütün canlı sistemlərin vacib hissəsidir. Bitki qidalarını bitki kökləri vasitəsilə torpaqdan bitkilərin orqanlarına daşıyır.

Suyun xassələri ən yaxşı su molekulunun quruluşu və kimyəvi rabitəsi nəzərə alınmaqla başa düşülə bilər.




*Şəkil 1. Bipolyar su molekulu*

Tək bir su molekulunda bir oksigen atomuna kovalent şəkildə bağlanmış iki hidrogen atomu var. Üç atom 104,5 $^{0}$ bucaq əmələ gətirməklə V-şəkilli strukturda düzülüb . Bükülmüş quruluşu və oksigen atomunun elektronları hidrogen atomlarından daha güclü cəlb etdiyi üçün su molekulu özünü hər iki ucunda əks elektrik yükləri olan dipol kimi aparır. Su dipolu NaCl-nin həlli zamanı $Na^{+}$ və $Cl^{-}$ kimi müsbət və ya mənfi yüklü ionlara cəlb oluna bilər.

Su hidrogen rabitəsi yaratmaq qabiliyyətinə malikdir. Hidrogen rabitəsi bir su molekulunda qismən müsbət yüklü hidrogen atomları ilə digər su molekulunda qismən mənfi yüklənmiş oksigen atomları arasında yarana bilən xüsusi bir rabitə növüdür. Hidrogen rabitəsi su molekullarını birlikdə saxlayır və həmçinin məhlullarda bəzi həll olunan molekulları və ya ionları saxlamağa kömək edir.




*Şəkil 3. Su molekullarının mənfi və müsbət qütbləri arasında hidrogen rabitəsi*

Suyun çirklənməsini dəqiq başa düşmək üçün şagirdlər böyük su obyektlərində baş verən kimyəvi qarşılıqlı təsirləri təsvir etməyi bacarmalıdırlar. Su obyektlərində kimyəvi reaksiyalar, açıq su hövzələrində atmosfer qazlarının həll olması, suyun turşu-qələvi xüsusiyyətlərinə görə baş verən kimyəvi reaksiyalar, kompleksəmələgəlmə reaksiyaları və onların tarazlığı, tarazlıq sabitlərinin və konsentrasiyalarının hesablanması və tarazlıqda olan növlərin təsvirini verilməlidir.

Şagirdlərdə suyun çirklənməsi mövzusunda ekoloji bilikləri formalaşdırmaq məqsədilə onlara əsas çirkləndiricilərin növləri , xassələri haqqında ilkin biliklər verilməlidir. Su hövzələrinin çirklənməsi problemi kimi antropogen təsirlərin və təbiətdə baş verən qlobal atmosferə atılan kimya sənayesinin tullantıları haqqında təsəvvür yaratmaqla yanaşı turşulu yağışların törətdiyi fəsadları da izah etmək son dərəcə vacibdir. Suya atılan ağır metallar və onların insan orqanizmi üçün yaratdığı təhlükənin ağır nəticələri şagirdlərə izah olunmalıdır.

Müəllim öz izahını davam etdirməli və bəzi maraqlı faktları şagirdlərin diqqətinə çatdırmalıdır: Suyun iştirakı olmadan kimya, metallurgiya, qara metallurgiya, neft kimya, maşınqayırma, əlvan metallurgiya və başqa sənaye sahələrini düşünmək olmaz. Qeyd edilən istehsal sahələri külli miqdarda tullantılarla suyu çirkləndirir. Fiziki halı və təbiətinə əsasən suyu çirkləndirən bir neçə növ maddələr var.

Həllolma qabiliyyətinə görə çirkləndiriciləri aşağıdakı kimi təsnif etmək olar:

1) Asılqan çirkləndiricilər. 2) Həll olan çirkləndiricilər. 3) Həll ola bilməyən çirkləndiricilər.

Çox vaxt xəstəlik törədən bakteriyalar su hövzələrini çirkləndirir. Müəllim izahında bildirir: Dünyanın əlli ölkəsində işlənmiş və daha sonra təmizlənmiş sudan istifadə olunur, dünya əhalisinin 61%-i isə sudan qıtlıq çəkir. Şagirdlər müəllimin köməyindən istifadə edərək təcrübə aparmaqla suyun çirklənmə səviyyəsini müəyyən etməyə çalışırlar. Sudan beş nümunə götürülür və onun şəffaflığını və iyini yoxlayırlar. Şagirdlər daha sonra suyun turşuluğunu indikator kağızı vasitəsilə yoxlayırlar. Suyun çirklənmiş, həmçinin kəskin iyli olduğu müəyyən edilir. Daha sonra müəllim şagirdlərə suda xoşagəlməz iyin hiss edilməsinin başlıca səbəbinin tullantıların çürüməsi olduğunu izah edir.

Kimyəvi maddələr müəyyən məqsədlər üçün istifadə edildikdə və ya sənaye üsulu ilə istehsal edildikdə biosferin müxtəlif təbəqələri müxtəlif səbəblərdən çirklənir. Ona görə də kimya dərslərində ekoloji bilik və bacarıqların formalaşdırılması tədris prosesinin əsas məsələlərindən biridir. Kimyəvi maddələr insan həyatının bütün sahələrində iştirak etdiyi üçün şagirdlər onların müsbət və mənfi tərəflərini bilməli və öz imkanları daxilində zərərin azaldılması istiqamətində görülən tədbirlərə fəal töhfə verməlidirlər.

**Problemin aktuallığı.** Ümumtəhsil məktəblərində kimya fənninin tədrisində şagirdlərə ekoloji təhsilin əhəmiyyətinin vacibliyi və ekoloji anlayışların aşılanması prosesi zamanı faktoloji

biliklər lazımi səviyyədə izah olunmur. Bu səbəbdən onlarda kimyəvi maddələrin istifadəsi nəticəsində təbiətə vurulan ziyanın acınacaqlı nəticələri haqqında təsəvvür yaranmır.

**Problemin elmi yeniliyi.** Kimya təlimi zamanı ekologiya fənni ilə inteqrasiya yaradılması nəticəsində şagirdlərdə mövzuya maraq daha da artmış olur. Onlarda elmi dünyagörüşü formalaşır, bilik, bacarıq və vərdişlər inkişaf etmiş olur.

**Problemin praktik əhəmiyyəti.** Kimya dərslərində ekoloji təhsilin sistemli şəkildə həyata keçirilməsi zamanı göstərilən fikirlərdən, şagirdlərdə motivasiya yaratmaq və idrak fəallığını artırmaq imkanları ilə bağlı məlumatlardan, verilən tövsiyələrdən bu sahədə fəaliyyət göstərən müəllimlər və tədqiqat aparanlar faydalana bilərlər.

**Ədəbiyyat:**


1. Məmmədova, A.Z. Qaçaybəyli, A.Q. Kimyanın tədrisində şagirdlərdə ekoloji bilik və bacarıqların formalaşdırılması imkanları və yolları. // Dedicated to the 90th anniversary of the academician Y.H. Mammadaliyev instute of petrochemical processes. −Baku, october 2-4, 2019, −s. 502-503.
2. Məmmədov, Q.Ş. Ekologiya və ətraf mühitin mühafizəsi. / Q.Ş. Məmmədov, M.Y. Xəlilov. −Bakı: Elm, −2005. −s. 435
3. Арканова , В.Н. Методы формирования экологической культуры школьников. // В.Н. Арканова [и др.] Хим. в школе. −2013, № 2, −с. 69-73.



**E.- mail:** gulnara.ismayilova@yandex.ru



**Redaksiyaya daxil olub:** 18.04.2024

UOT 372.854

**Aidə Rasim qızı Xanbutayeva**
fəlsəfə doktoru proqramı üzrə doktorant
Azərbaycan Dillər Universiteti
**Orcid**: 0000-0002-8872-0023

# HİBRİD TƏDRİSDƏ QRAMMATİK ÇALIŞMALARIN ROLU

**Аида Расим гызы Ханбутаева**
докторант по программе доктора философии
Азербайджанский Университет Языков

# РОЛЬ ГРАММАТИЧЕСКИХ УПРАЖНЕНИЙ В ГИБРИДНОМ ОБУЧЕНИИ

**Aida Rasim Khanbutayeva**
doctorial student in the program of doctor of philosophy
Azerbaijan University of Languages

# THE ROLE OF GRAMMAR EXERCISES IN HYBRID TEACHING

**Xülasə.** Müasir dövrdə nəinki xaricdə, eyni zamanda ölkəmizdə də geniş şəkildə inkişaf etməkdə olan hibrid təhsil tələbələrin müəllimlə həm auditoriya şəraitində, həm də virtual şəbəkələr vasitəsilə əlaqə qurmasını təmin edən tədris növüdür. Məqalədə hibrid təhsil haqqında ümumi məlumat və bu zaman qrammatik çalışmaların xarici dilin öyrənilməsində rolu təhlil edilmiş və qrammatik tapşırıqların eksperimental təhlili aparılmışdır.
***Açar sözlər:*** *onlayn təhsil, hibrid təhsil, kommunikasiya-informasiya texnologiyaları, qrammatik tapşırıqlar, eksperimental təhlil.*

**Резюме.** В наше время гибридное образование, широко развивающееся не только за рубежом, но и в нашей стране, представляет собой вид образования, позволяющий учащимся общаться с учителем как в классе, так и посредством виртуальных сетей. В статье проанализированы общие сведения о гибридном образовании и роли изучения грамматики в изучении иностранного языка, а также проведен экспериментальный анализ грамматических задач.
***Ключевые слова:*** *онлайн-образование, гибридное образование, коммуникативные и информационные технологии, грамматические задачи, экспериментальный анализ.*

**Summary.** In modern times hybrid education which is widely developing not only abroad, but also in our country is a type of education that allows students to communicate with the teacher both in the classroom and through virtual networks. In the article general information about hybrid education and the role of grammar exercises in learning a foreign language were analyzed and an experimental analysis of grammar tasks was carried out.
***Key words:*** *online education, hybrid education, communication and information technologies, grammar tasks, experimental analysis.*

Hibrid təhsil vəziyyətdən asılı texnologiyaların köhnə, sınanılmış olaraq təhsil mühitində yeni, qabaqcıl metodlarla birləşməsindən əmələ

gələn bir təhsil formasıdır. O, onlayn təhsilə əlavə olaraq üz-üzə dərslər təklif edən onlayn əsaslı təhsildir. Bu təhsil sistemində dərslər həm auditoriyada, həm də onlayn formatda təhsil almağa imkan verir. Tələbələrin bir hissəsi auditoriyada ola, qalan hissəsi isə dərsdə iştirak etməyə də bilər.

Hibrid təhsil özündə klassik və yeni texnologiyaları birləşdirdiyindən o, bütün tələbələr üçün yəni həm ənənəvi təhsil alanlar və həm də yenilik tərəfdarları üçün çox uyğundur. Bu təhsil növündə daha öncə mövcud olan texnologiyalar öz işini davam etdirir, belə formatda təhsil daha təhlükəsizdir və bilik səviyyəsinin aşağı düşməsinə səbəb olmur.

Bu təhsil formasında tələbə bilavasitə dərsə hazırlaşmalı, dərsdə iştiraka qədər fəaliyyətini bitirməlidir. Sürətli onlayn ünsiyyət hesabına tələbələrin motivasiyası artır. Rahat dərs qrafikinin olması, müxtəlif üsullar ilə tədrisin keyfiyyətinə nəzarət etmək imkanı yaradır. Mentorların iştirakı, dərslərin yazılması, yoxlama siyahıları və s. olması hibrid tədris prosesini sosial və şəffaf edən komanda fəaliyyətidir. Müəllim və tələbələr məsafədən işləyərək tədris prosesinə xarici mütəxəssislərin cəlb edilməsinə imkan yaradırlar. Hibrid təhsil zamanı maddi rifah səviyyəsi, fiziki məhdudiyyətlər və ya gender ayrıseçkilikləri ilə bağlı problemlər əhəmiyyətli dərəcədə azalmış olur.

Hibrid təhsilin ən böyük üstünlüyü də onun həm ənənəvi, həm də onlayn təhsildən ən yaxşı aspektləri götürüb özündə birləşdirməsidir. İstər ənənəvi, istərsə də onlayn təhsilin ayrı-ayrılıqda çatışmazlıqları olduğundan, bu tədris metodu müəllimin dərsi hər iki təhsil növündən istifadə edərək ən yüksək səviyyədə tədris etməsinə yardımçı olur. Beləliklə, düzgün və doğru şəkildə aparılan hibrid təhsil iki ayrı metodun zəif tərəfləri olmadan tətbiq olunan öyrənmə metodudur. Hibrid təhsilin bəzi üstünlüklərinə: 1. öyrənmə və öyrətməyin çevik yolu, 2. artan əlçatanlıq, 3. tələbənin məsuliyyət və bacarıqlarında dəyişiklik, 4. resurslardan səmərəli istifadə və başqalarını aid etmək mümkündür.

Çevik öyrənməyə imkan verən bu metodun ən yaxşı cəhəti odur ki, hibrid öyrənmə ilə bağlı bütün elementlər auditoriyanın xüsusi ehtiyaclarına uyğunlaşdırıla bilir. Pedaqoqlar tədris üsullarını və tələbələrin sinif üçün təklif olunan təlim materialları ilə necə məşğul olmalarını seçməkdə çevik olurlar. Digər bir çeviklik isə ondan ibarətdir ki, dərslərə evlərindən uzaqda qatılan tələbələr təhsil almaq üçün faktiki auditoriyaya gəlmək məcburiyyətində olmurlar.

Hibrid təhsilin digər bir üstünlüyü ondan ibarətdir ki, bu tədris metodu əlçatanlığı özündə birləşdirir. Sadəcə universitetə gedə bilmədiyi üçün keyfiyyətli təhsil ala bilməyən və ya hər hansı bir səbəbdən öyrənmə çətinliklərinə sahib tələbələr üçün hibrid təhsil daha çox öyrənmə imkanları təklif edən alternativ metoddur. Belə ki, tələbələr öz dərslərində iştirak edərək həmyaşıdlarının üzbəüz öyrəndiklərini öyrənə bilərlər.

Hibrid təhsil ali məktəb müəssisələrini həm akademik, həm də sosial baxımdan daha yaxşı nəticələr əldə etməyə sövq edir.

Pandemiya dövründə COVID-19 səbəbilə dünya onlayn təhsil sisteminə keçərkən bu təhsil növü bəzi məktəb və universitetlərdə tətbiq olunmağa başladı. Bu öyrənmə və ya hibrid təhsil indi uzaqdan təhsil üçün istifadə edilən alternativlərdən biridir.

Hibrid dərslərə bəzi onlayn məşqlər, əvvəlcədən yazılmış videolar

və fərdi dərsləri dəstəkləyəcək digər materiallar daxil ola bilər. Hibrid öyrənmə sinxron öyrənmə elementləri ilə yanaşı, asinxron öyrənmə elementlərini də özündə ehtiva edir.

Hibrid öyrənmə ilə həftədə iki-üç gün dərsə gələn tələbələr digər tələbə dostları ilə sinifdə olmağa və müəllimləri ilə ünsiyyət qurmağa nail olurlar. Bu təhsil modelində bəzi tələbələr evdə, digərləri isə şəxsən dərslərdə iştirak edirlər.

Qarışıq və ya hibrid öyrənmə ilə müəllimlər, təlimatçılar və fasilitatorlar müxtəlif fərdi təlimatları onlayn öyrənmə fəaliyyətləri ilə birləşdirir. Bu öyrənmə metodlarının hər ikisində fərdi öyrənənlərin və onlayn öyrənənlərin qarışığı mövcuddur. Bununla birlikdə, ikisi arasındakı fərq, qarışıq öyrənmə ilə eyni şəxslərin həm şəxsən, həm də onlayn öyrənmələridir.

Hibrid təhsilin innovativ olmasına səbəb bu təhsil növünün tələbələrə daha çevik olmaq şansı təqdim etməsi, eyni zamanda aktiv öyrənməni özündə cəmləşdirməsidir, çünki dərslər yarı ənənəvi, yarı onlayn olduğundan onların sinif və materiallara çatmaq üçün məsuliyyətləri daha yüksəkdir.

Hibrid təhsil insanların dərsə getmədən keyfiyyətli təhsil alma prosesini asanlaşdırır və bununla da dərslər hər millətdən olan insanlar üçün olduqca əlçatan olur. Bu öyrənmə metodu eyni zamanda texnologiya, proqram təminatı və aparatdan istifadəni də nəzərdə tutur, virtual konfrans zəngləri vasitəsilə auditoriyaya qoşulan tələbələr, smart ekranlardan istifadə edən müəllimlər, ağıllı cihazlar üzərindən görülən ev tapşırıqları və s. burada öz əksini tapır.

Hibrid öyrənmə daha çevik bir təhsil modeli olduğundan, o, tələbənin ehtiyaclarına uyğun ola bilər. Hər kəs eyni şəkildə öyrənmir və bu, xüsusi ehtiyacı olan insanlara da aiddir. Bu tələbələrin üzləşdiyi ən çətin şey yeni öyrənmə metoduna uyğunlaşma ola bilər. Çətin görünsə də, xüsusi ehtiyacı olan tələbələr strukturu əldə etdikdən sonra, hibrid öyrənmənin faydalarından yararlana bilirlər. “Bu tədris prosesində hələ də interaktiv təcrübələr və müxtəlif fəaliyyətlər vasitəsilə həmyaşıdları ilə gündəlik ünsiyyətdə olacaqlar. Bu, onların sosial bacarıqlarının artmasına kömək edəcək. Tələbənin xüsusi ehtiyacları və qabiliyyətləri əsasında müəyyən edilən temp xüsusi ehtiyacı olan tələbələr üçün də faydalı olacaqdır” [2].

Hibrid tədris zamanı mühazirəçilər rəqəmsal alətlərlə yanaşı, Teams və ya Zoom kimi vasitələrdən istifadə etməklə, eyni zamanda uzaqdan və üzbəüz tədrisi həyata keçirirlər.

Bəzən hibrid tədris zamanı üzbəüz onlayn məşqdən və əvvəlcədən qeydə alınmış video materiallar da daxil olmaqla asinxron təlim elementlərindən istifadə etmək olar. Panopto və Canvas buna misal ola bilər.

Hibrid tədris vasitəsilə yaxşı tələbə təcrübəsinə nail olmaq asan deyil və bunun üçün adətən aşağıdakılar tələb olunur:

- *Müəllim tərəfindən çox tapşırığın verilməsi.* Qeyd edək ki, hibrid təhsil onlayn təhsilə nisbətən bir qədər stresslidir.
- *Yardım.* Söhbətə nəzarət etmək və uzaqdan tələbələrə kömək etmək məqsədilə dəstəyə ehtiyac olur.
- *Yenidən dizayn.* Hər iki auditoriyanı nəzərə almaq üçün sessiyaları yenidən dizayn etmək lazım olur.
- *KİT.* Sinifdə əlavə İT avadanlığına (kameralar və mikrofonlar) ehtiyac olur.
- *Güvən.* Güclü texniki bacarıqlara malik olmaq lazımdır.

Hibrid təhsil problemləri yerində həll etmək bacarığı tələb edir.

• *Vaxt*. Planlaşdırma və quraşdırma çox vaxt aparır və məsuliyyət tələb edir [3].

Hibrid dərslərdə xarici dilin öyrədilməsində istər leksik, istərsə də qrammatik çalışmalar, testlər mühüm əhəmiyyət kəsb edir. Düzgün danışıq, yazı qaydalarına riayət etmək üçün qrammatik çalışmaların dərslərdə təhlili xüsusi önəm daşıyır. Hibrid dərslərdə də qrammatik tapşırıqların yerinə yetirilməsi tələbələr arasında xüsusi maraq doğurur. Bu tapşırıqlara misal olaraq, aşağıdakıları qeyd edə bilərik.

1. Mətni tamamlamaq üçün sözlər yazın.
2. Düzgün variantı seçin.
3. Boşluqları tamamlayın.
4. Qrammatik cəhətdən düzgün sözü seçin.
5. Cümlənin inversiyası (təsdiqdən inkar cümləyə transformasiya, məlumdan məchula, ismin (şəxsin) tək formasından cəm formasına çevrilmə və s.).

Mətni tamamlamaq üçün düzgün söz yazmaq, bütün mətni oxumaq və mətnin nə haqqında olduğunu başa düşmək, boşluqdan əvvəl və sonra bütün cümləni oxumaq vacibdir. Seçimləri təhlil etməmişdən əvvəl sözün hansı nitq hissəsinə aid (isim, fel, və s.) olduğu müəyyənləşdirilməli, onun cümlədə qrammatik cəhətdən düzgün işləndiyini yoxlamaq lazımdır. Cavabı tapmaq mümkün deyilsə, təxmin etmək, bitirdikdən sonra cavabları diqqətlə yoxlamaq gərəkdir.

Digər tapşırıq növü düzgün variantı seçin tipli qrammatik tapşırıqlarda doğru cavabı seçməzdən əvvəl cümləni mövcud variantlarının oxumasıdır. Bir variant seçildiyi zaman doğruluğuna əmin olmaq, düzgün olmadığı təxmin edilən variantı aradan qaldırmaq, cavabı bilinmirsə təxmin etmək, bitirdikdən sonra isə cavabları diqqətlə yoxlamaq vacibdir.

III tapşırıq növü:

"Boşluqları tamamlayın" başlıqlı qrammatik çalışmalarda cümlə daxilində hər hansı bir söz, söz birləşməsi və ya ifadə verilmir. Məsələn, */My father usually _____ (not like) dancing at the weddings//* tipli tapşırıqlarda ilk öncə sözün hansı nitq hissəsinə aid olduğunu araşdırmaq, daha sonra isə mənaya uyğun olaraq feildirsə hansı zamanda işləndiyini, isimdirsə tək və ya cəmdə olduğunu müəyyən etmək lazımdır.

Digər tapşırıq növü (IV tapşırıq) isə "word formation" yəni yeni söz əmələ gətirmə adlanır. Məsələn*, /The _____ was very charming in the concert hall// (sing)*

İlk öncə cümlə oxunur, anlaşılmağa çalışır və tərcüməyə uyğun olaraq doğru söz istifadə olunur. Yuxarıdakı nümunədən də göründüyü kimi, doğru söz mənaya uyğun olaraq "singer" olmalıdır.

Cümlə transformasiyalarında çox vaxt birbaşa və dolayı nitq, sifət və ya zərfin müqayisə və üstünlük dərəcələri, məlum və məchul növlər, kəmiyyət bildirən şəkilçilər, feilin şəkil kateqoriyaları sınaqdan keçirilir.

Sonuncu (V tapşırıq) növ tapşırıq isə "sentence transformation", yəni cümlə transformasiyası adlanır. Bura, əsasən eyni cümlənin müxtəlif formalarda yazılıb ifadə olunmasını misal göstərmək olar. Cümlə parafrazaları, xüsusilə də məlum növdən məchul növə keçid buna bariz nümunədir. Məsələn, /Nancy opened the door carefully in the hall//. - /The door was opened carefully by Nancy in the hall// [3]. _

10 nəfərlik qrupla eksperiment keçirmək məqsədilə hibrid dərs apardıq. Eksperiment ADU-nun BM və Regionşünaslıq fakültəsinin I kurs (türkşünaslıq ixtisası üzrə) tələbələri arasında aparıldı. Dərs prosesi hibrid

dərsdə qrammatik çalışmaların keçirilməsinə həsr olunmuşdu. Tələbələrə ilk öncə onlayn formada qaydalar izah olundu, daha sonra isə "boşluqları tamamlayın" və "yeni söz əmələ gətirin" tipli iki qrammatik tapşırığın izahı verildi. Onlayn şəkildə qaranlıq qalan sualları cavablandırıldı və möhkəmləndirmək məqsədilə bir neçə çalışma edildi. Verilən tapşırıqlar yoxlandı, suallar isə ətraflı şəkildə izah olunaraq cavablandırıldı və ev tapşırıqları verildi. Növbəti gün üçün baş tutan ənənəvi dərsdə isə tələbələrə verilmiş tapşırıqlar ətraflı şəkildə yoxlandı, qaydalar sual-cavab şəklində soruşuldu və tələbələrin bir qismi qiymətləndirildi.

***I. a) Complete the gaps.***

1. If it…, I won't go to the park (rained/rains/had rained).2. The teacher … a quiz when I got to the class (has given/had given/gives). 3. All the cookies… recently (has been eaten/ eat/have been eaten). 4. The reporter is blamed for … bad stories. (writing/to write/write). 5. She would hurt herself if she …(falls/fell/ had fallen).

***b) Fill in the gaps using these words.***

***Make soup, share, heart surgeon, inherited, bother***

6. Will it… you if I turn the television on? 7. She used up the chicken bones to… .

8. Shirley's brother is now a consultant…in Sweden. 9. She has…her mother's fine features. 10. I used to…a bedroom with my brother.

**Düzgün cavablar:** 1. rains, 2.had given, 3. have been eaten, 4. writing, 5.fell, 6. bother, 7. make soup, 8. heart surgeon, 9. inherited, 10. share

Yuxarıdakı tapşırıqlar tələbələrə ev tapşırığı kimi verilən çalışmalara misaldır.

**Tapşırıq 2.**

***Write the correct version of the words.***

1. Jane doesn't get a lot of … (enjoy) from football like her brother. 2. Rauf thinks that money always brings … (happy). 3. It is … (polite) to talk to someone too loudly in the bus. 4. My uncle is very … (patient) while writing for a train to come. 5. My younger sister wants to be a … (science) when she is older. 6. Roads are very slippery. He needs to ride his car … (careful). 7. To tell the … (true), I didn't like the movie. 8. My cousin … (obsess) with fashion. She buys all the fashion magazines every month. 9. I don't like … (chemist) at all. It is too difficult. 10. While … (go) to the forest, he suddenly saw a long and dangerous snake.

**Düzgün cavablar:** 1. enjoy, 2. happiness, 3. impolite, 4. impatient, 5. scientist, 6. Carefully, 7. truth, 8. is obsessed, 9. chemistry, 10. going.

Qarışıq öyrənmə üz-üzə və onlayn təcrübələrin birləşməsidir. Qarışıq tədrisin məqsədi yaxşı öyrənmə üçün tədris və öyrənmə təcrübələrini daha çevik, səmərəli və təsirli etməkdir.

Hibrid tədris onlayn öyrənmə fəaliyyətlərinin yerində öyrənmə fəaliyyətini əvəz etmək üçün nəzərdə tutulan növüdür. Yerli görüşlərin sayının azaldılması qarışıq kursların sadəcə "texnologiya ilə təkmilləşdirilmiş" və ya "veb-təkmilləşdirilmiş" kurslardan kənara çıxmasının bir yoludur [1, s.1].

**Problemin aktuallığı.** Müasir dövrdə hibrid təhsilin inkişafına müasir informasiya-kommunikasiya vasitələri, internet şəbəkəsi böyük təsir göstərir. Bu tədris prosesində tələbələr müəllimlə həm auditoriya şəraitində, həm də virtual şəbəkələr vasitəsilə əlaqə qura bilməsi, fərdi və asinxron təlim metodlarını özündə ehtiva edə bilməsi aktuallıq kəsb edir.

**Problemin elmi yeniliyi.** Hibrid təhsil prosesində ingilis dilin qrammatikasının öyrədilməsində qarşıya çıxan çətinlikləri aşkar edib, onları qrammatik çalışmalar vasitəsilə həll etdirməkdir.

**Problemin praktiki əhəmiyyəti.** Məqalədə istifadə olunan strategiyalar hibrid tədris prosesində müəllim, tələbə və tədqiqatçılar üçün faydalı ola bilər.

**Ədəbiyyat:**


1. Stein J., Graham Ch. R. Essentials for Blended Learning/ J. Stein, Ch. R. Graham. – New York and London: Standards-based Guide, second edition, Routledge Taylor & Francis Group, – 2020. 201 p.
2. https://otsimo.com/en/hybrid-learning-and-hybrid-education/
3. https://www.ctl.ox.ac.uk/what-is-hybrid-teaching
4. https://learnenglishteens.britishcouncil.org/exams/grammar-vocabulary-exams/write-words-complete-text


**E-mail:** aida_khana@mail.ru
**Redaksiyaya daxil olub:** 19.04.2024

*UOT 372.878*

***Hicran Əzizağa qızı Sadıqzadə***
*elmlər doktoru proqramı üzrə doktorant*
*Bakı Musiqi Akademiyası*
***Orcid***: https://orcid.org/0009-0006-8564-5618

# KLASSİK MUSİQİ ƏSƏRLƏRİNİN TƏDRİSİ MƏKTƏBLİLƏRİN ESTETİK MƏDƏNİYYƏTİNİN İNKİŞAFINA TƏSİRİ

***Хиджран Азизага гызы Садыгзаде***
*докторант по программе доктора наук*
*Бакинская Музыкальная Академия*

# ВЛИЯНИЕ ОБУЧЕНИЯ ПРОИЗВЕДЕНИЯМ КЛАССИЧЕСКОЙ МУЗЫКИ НА РАЗВИТИЕ ЭСТЕТИЧЕСКОЙ КУЛЬТУРЫ ШКОЛЬНИКОВ

***Hijran Azizaga Sadiqzade***
*doctorial student in the program of doctor of science*
*Baku Music Academy*

# THE IMPACT OF TEACHING CLASSICAL MUSIC WORKS ON THE DEVELOPMENT OF AESTHETIC CULTURE OF SCHOOLCHILDREN

**Xülasə.** Musiqili səhnə əsərlərindən istifadə edilməsi, şagirdlərin bu əsərlərə maraqlarının artması ilə bərabər, onların estetik mədəniyyətinin formalaşmasına güclü təsir göstərir. Ümumtəhsil məktəblərində “Musiqi” fənni üzrə dərsliklər Azərbaycan və dünya musiqi korifeylərinin musiqili səhnə əsərləri ilə zənginləşdirilməsi, şagirdlərin estetik mədəniyyətli şəxsiyyət kimi formalaşdırılması prosesinə öz müsbət təsirini göstərir. Musiqili səhnə əsərləri bir neçə incəsənət növünün sintezindən yaranır. Bu musiqili səhnə əsərlərindən yararlanan şagirdlər müxtəlif incəsənət nümunələri arasında məntiqi əlaqələr yaradırlar. Bu da onların bilik səviyyələrinin inkişafında böyük rol oynayır.

Uşaq incəsənət məktəblərində oxuyan şagirdlərin ümumi mədəniyyət səviyyəsi orta məktəb şagirdlərindən daha yüksək olur, həm də bu tip şagirdlər yüksək mədəniyyət daşıyıcılarına çevrilirlər.

***Açar sözlər:*** *musiqi təhsili, dəyərlər, ənənələr, adətlər, mahnı, estetika, vokal, klassik musiqi.*

**Резюме.** Использование музыкальных сценических произведений, наряду с повышением интереса учащихся к этим произведениям, оказывает сильное влияние на формирование их эстетической культуры. Обогащение учебников в общеобразовательных школах по предмету “Музыка” музыкальными сценическими произведениями корифеев Азербайджанской и мировой музыки оказывает положительное влияние на процесс формирования учащихся как эстетически культурных личностей. Поскольку музыкальные сценические

произведения возникают из синтеза нескольких видов искусств. Использование этих произведений позволяет учащимся устанавливать логические связи между различными образцами искусства, что играет большую роль в развитии их уровня знаний.

Учащиеся, обучающиеся в детских художественных школах, а также в средних общеобразовательных школах, имеют более высокий уровень общей культуры, чем обычные старшеклассники, а также такие учащиеся становятся носителями высокой культуры.

***Ключевые слова:*** *музыкальное образование, ценности, традиции, обычаи, песня, эстетика, вокал, классическая музыка.*

**Summary.** The use of musical and stage works not only increases students' interest in these works but also has a strong influence on the formation of their aesthetic culture.

Textbooks on the subject of 'Music' in secondary schools have a positive influence on the process of enriching the leaders of Azerbaijani and world music with musical and stage works, shaping students as aesthetically cultured individuals. Musical and stage compositions emerge from the intricate fusion of multiple artistic disciplines. When students engage with these compositions, they inherently forge intricate connections between disparate artistic paradigms. This symbiotic interplay not only enriches their aesthetic sensibilities but also fosters a deeper understanding and appreciation across diverse realms of artistic expression, thereby catalyzing a profound evolution in their cognitive faculties.

Students enrolled in children's art schools typically exhibit a higher caliber of cultural refinement compared to their counterparts in secondary education. These individuals often emerge as stewards of elevated cultural standards within their communities, embodying and disseminating a profound appreciation for the arts.

***Key words:*** *music education, values, traditions, customs, song, aesthetics, vocals, classical music.*

Təkzibedilməz faktdır ki, məktəblilərdə estetik mədəniyyətin formalaşdırılması pedaqogika elminin əsas tərkib hissələrindən biridir. Estetik mədəniyyət isə hərtərəfli inkişaf etmiş şəxsin mühüm keyfiyyətlərindən hesab olunur.

Estetik mədəniyyət formalaşdırılmasının başlıca vəzifələrindən biri də yetişməkdə olan nəsildə estetik mühakimə və zövqü inkişaf etdirməkdən, bədii görüş dairəsini genişləndirməkdən və bu nəsli həqiqi gözəlliyi qiymətləndirə bilmək, musiqini sevmək, duymaq bacarığına alışdırmaqdan ibarətdir.

Araşdırmalar göstərir ki, böyüyən nəslin əxlaqi normalar və bədii-estetik təfəkkürə malik cəmiyyət üzvü kimi formalaşmasında böyük əhəmiyyət kəsb edən uşaq opera – balet və digər musiqi janrlarında əsərlərin yaradılması və təbliği sahəsində əsaslı dönüşə ehtiyac var. Planetimizdə bir-birinə bənzəməyən, təkrarolunmaz, müxtəlif millətlərin, dinlərin nümayəndəsi olan 6 milyarddan çox insan yaşayır. Bu insanlar həm bioloji və fizioloji, həm də fərdi psixoloji xüsusiyyətlərinə görə bir-birindən fərqlidirlər. Bu fərq özünü gözlərin rəngində, səs tembrində, barmaq izlərində, hətta ürək ritmində də büruzə verir. Təqdirəlayiq haldır ki, həmin səciyyəvi cəhətlər müvafiq elmlər, o cümlədən musiqi pedaqogikası sahəsində tədqiqat aparanların əsas predmetinə, obyektinə çevrilir.

Estetik mədəniyyətli insanın inkişafı üçün vacib məsələlərdən biri də gənc nəslin savadlı, bilikli və tərbiyəli inkişafıdır ki, bu da pedaqogika elminin əsas vəzifələrindən hesab olunur. Yəni məktəbdə aparılan müntəzəm, sistemli dərs prosesində

şagirdlər tədris planına və fənn proqramlarına uyğun bilik, bacarıq, vərdişlərə yiyələnməli və onları tətbiq edə bilməlidirlər.

IV sinif “Musiqi” dərsliyində musiqili səhnə əsərlərindən doqquz nümunə öz əksini tapmışdır. Onlardan ikisi operetta (Ü. Hacıbəylinin “Arşın mal alan” əsərindən), dördü balet (Q. Qarayevin “Yeddi gözəl”, “İldırımlı yollarla”, P.İ. Çaykovskinin “Qozsındıran”, A. Məlikovun “Məhəbbət əfsanəsi” əsərlərindən), üçü opera (Ü. Hacıbəylinin “Koroğlu”, C. Verdinin “Aida”, N. Rimski-Korsakovun “Qar qız” əsərlərindən) janrına aiddir. Göründüyü kimi, dərslik müəllifləri qeyd olunan musiqi janrlarının böyüməkdə olan gənc nəslin bir şəxsiyyət kimi formalaşdırılmasında, mədəni bir insan kimi yetişməsində rolunun əhəmiyyətini nəzərə alaraq bu addımı atmışlar. Düzdür, bütün incəsənət növlərinin, o cümlədən musiqinin insan şəxsiyyətinə olan təsirini nəzərə almamaq olmaz. Lakin musiqili səhnə əsərləri bir sintetik, yəni özündə müxtəlif incəsənət növlərini birləşdirən (musiqi, xoreoqrafiya, rəssamlıq, dramaturgiya və s.) bir yetkin janr olduğu üçün onun insan şəxsiyyətinin formalaşdırılmasında böyük rolu var ki, müəllim də bu potensial imkanların genetik hala keçməsi üçün əlindən gələni etməlidir.

Dahi Azərbaycan bəstəkarı Ü. Hacıbəylinin “Koroğlu” operasında vətənpərvərlik mövzusunda musiqi nümunələri kifayət qədərdir. Yəni operanın “Uvertürası”ndan tutmuş son “Final xoru” nadək istənilən qədər vətənpərvərlik ruhu aşılayan xalqı istismarçılara, onlara zülm edən xanlara, paşalara qarşı mübarizəyə çağıran döyüş səhnələrini təsvir edən musiqi nümunələri var. Qeyd etmək lazımdır ki, bu nümunələr muğamlarımıza əsaslanan musiqi nümunələri olduğu üçün dinləyicilər tərəfindən də maraqla qarşılanır və daha asan qavranılır. Məsələn, “Koroğlu” operasının “Uvertüra”sı si bemol mayəli “Rast”, I pərdədən “Rövşənin ariozosu” mi bemol mayəli “Rast”, I pərdədən “Xalqın xoru” mi bemol mayəli “Rast”, III pərdədən “Rəqs” mi mayəli “Rast”, V pərdədən “Xalqın xoru” do mayəli “Rast” muğamının intonasiyaları üzərində yazılmışdır. Qeyd etmək lazımdır ki, bu musiqi nümunələrinin hər biri vətənpərvərlik, qəhrəmanlıq kimi xüsusiyyətlər daşıyır və tamaşaçılarda həmin keyfiyyətlərin aşılanmasına qüvvətli təsir göstərir.

Odur ki, klassik musiqi nümunələrindən I –IX siniflərdə geniş surətdə istifadə etmək mümkündür, hətta vacibdir.

Onu da qeyd edək ki, ən böyük və əzəmətli mahnımız olan Azərbaycan Respublikasının Dövlət himni kimi, Ü. Hacıbəylinin “Koroğlu” operasının “Uvertüra” sını da məhz I sinifdən IX sinif də daxil olmaqla şagirdlərin diqqətinə çatdırmaq lazımdır. Qeyd: “Musiqi” fənni ümumtəhsil məktəblərində I – IX siniflərdə tədris olunur.

Bu gün artıq Azərbaycan orta ümumtəhsil məktəblərinin hər birində dərslər başlamazdan əvvəl məhz Azərbaycan Respublikasının Dövlət himni səsləndirilir. Üç rəngli Dövlət Bayrağımız dalğalandırılır. Dərslərin məhz himnimizin səsləndirilməsi ilə başlamasının özü şagirdlərdə mübariz əhvali – ruhiyyənin yaranmasına, dərsə marağın artmasına səbəb olan vasitələrdən sayılır.

Ü. Hacıbəylinin “Koroğlu” operasının müxtəlif pərdələrində şəxsiyyətin keyfiyyətinin formalaşdırılması ilə əlaqədar musiqi epizodları nəzərə çarpır.

Bakı şəhərinin 183 nömrəli tam orta məktəbində musiqi müəllimi Azərbaycan Respublikasının xalq artisti bəstəkar Ramiz Mustafayevin “Vaqif” operası haqqında

məlumatlardan istifadə edərək, şagirdlərdə vətənə məhəbbət keyfiyyətlərini aşılamağa çalışır. Musiqi müəllimi Ş. Mirbağırova əvvəlcə böyük Azərbaycan şairi Molla Pənah Vaqif haqqında qısa məlumat verir. O deyir ki, M. P. Vaqif XVIII əsrdə yaşayıb – yaratmış görkəmli Azərbaycan şairi olmaqla bərabər, eyni zamanda alovlu vətənpərvər olmuş, Qarabağın, Şuşanın qorunmasında çox yaxından iştirak etmişdir. Bundan sonra müəllim operanın qısa məzmununu şagirdlərə çatdırır.

Qısa məlumatdan sonra müəllim deyir ki, "Vaqif" operası 23 iyun 1960-cı ildə M.F. Axundov adına Azərbaycan Dövlət Opera və Balet Teatrının səhnəsində tamaşaya qoyulmuşdur. Operanın librettosunu müğənni Firudin Mehdiyev yazmış, rejissoru S. Dadaşov, rəssamı E. Fətəliyev, dirijoru isə Ə. Bədəlbəyli olmuşdur. Operanın əsas qəhrəmanları olan Vaqifi operanın solisti SSRİ xalq artisti L. İmanov, onun həyat yoldaşı Xuramanı məşhur qadın sopranosu SSRİ xalq artisti F. Əhmədova, Qacarı F. Mehdiyev və İbrahim xanı isə gözəl bariton, xalq artisti A.B. Bünyatzadə böyük müvəffəqiyyətlə ifa etmişdir.

Bu məlumatlar verildikdən sonra müəllim operanın I pərdəsindən "Qarabağ şikəstəsi" musiqi nümunəsini səsləndirir və şagirdlər bu səhnəyə monitor vasitəsilə tamaşa edirlər.

Bundan sonra müəllimin köməyi ilə şagirdlər müəyyən edirlər ki, dinlədikləri "Qarabağ şikəstəsi" musiqi nümunəsində əvvəlcə şikəstənin vokalsız giriş hissəsi səslənir və bu hissəni simfonik orkestr çalır, sonradan isə xanəndə zil səsilə başlayaraq bu zərbi – muğamı simfonik orkestrin müşayiəti ilə oxuyur. Beləliklə, müəllim şagirdlər arasında dialoq aparır.

Müəllim "Qarabağ şikəstəsi" zərbi muğamından xanəndənin oxuduğu hissədən bir parçanı notla və sözləri ilə şagirdlərə oxumağı təklif edir. Özü də fortepiano vasitəsilə müşayiət edir. Müşahidələr göstərir ki, kollektiv ifaçılıq zamanı fəallıq, dostluq, kollektivçilik, tapşırılan işə məsuliyyətlə yanaşmaq kimi keyfiyyətlər tərbiyə olunur ki, bütün bunlar vəhdət şəklində həm də gələcək şəxsiyyətin formalaşmasına öz müsbət təsirini göstərir.

Sonra müəllim Qarabağ haqqında məlumat verir: Qarabağ torpağı uğrunda, bu günkü kimi, həmişə mübarizələr, müharibələr, qırğınlar, şəhidlər olub. Qədim Qarabağ torpağına əvvəllər İran şahları, o cümlədən Şah Qacarda göz tikib. Nadir inci olan Şuşa şəhərini də işğal edərək böyük şairimiz M. P. Vaqifi qayadan atmaq istəyib. Lakin o, buna nail ola bilməyib və xalq Şah Qacarı Qarabağ torpağından qovub.

Hal hazırda bizim qədim torpaqlarımız olan Qarabağ və onun ətrafındakı rayonlarımız erməni qəsbkarlarının tapdağından azad olunub, ulu torpaqlarımızda əbədi zəfər çaldıq. Şanlı ordumuz xalqla birgə öz gücünü göstərib düşmənə qalib gəldi.

Şagirdlərin bir şəxsiyyət kimi formalaşması üçün məktəbdə oxuduqları müddətdə onların əqli inkişafı, yüksək biliyə malik olmaları və bu bilikləri tətbiq edə bilmələri, müasir texnologiyalardan baş çıxarmağı bacarmaları, fiziki cəhətdən sağlam olmaları sahəsində fəal iş aparılmalıdır. Yəni təlimlə birlikdə şagirdlərin bir şəxsiyyət kimi formalaşması və sonradan inkişaf etdirilməsi prosesində tərbiyə ilə əlaqədar işlər daima aparılmalıdır ki, onlar yüksək bilik sahibi olmaqla bərabər, vətənini sevsinlər, onu qorumağı bacarsınlar, eyni zamanda öz fikirlərini və mövqelərini də aydınlaşdıra bilsinlər. Məktəbdə, ailədə hörmət sahibi olsunlar, öz vətəninin

şəkilçisini əlavə etmək olmur. Buraya daxil olan sözlər, əsasən, bunlardır:

**Şəxs adları:** Toğrul, Tuqay, Eşqin, Əziz və s.

**Ölkə adları:** Azərbaycan, Türkiyə, Özbəkistan və s.

**Şəhər adları:** Bakı, Şəki, Lənkəran, Gəncə və s.

**Kənd adları:** Ellərkənd, Güllücə, Quşçu və s.

**Dəniz adları:** Xəzər dənizi, Qara dəniz və s.

**Çay adları:** Kür çayı, Arpa çayı, Araz çayı və s.

Ümumiyyətlə, xüsusi isimləri cəmdə işlətmək düzgün deyildir. Ona görə ki, xüsusi isimlər təkdir, xüsusidir, onlardan biri digərindən fərqlənir. Hər iki dildə mücərrəd mənalı sözlər, əsasən, təkdə işlənir. Azərbaycan dilində - **nifrət, qəzəb, sevgi, məhəbbət, istək, qismət** və s.

Dilimizdə mücərrəd mənalı sözlər fərdiləşdikdə cəm şəkilçisi qəbul edə bilirlər. Ona görə ki, fərdiləşmə zamanı mücərrəd mənalı sözlər növlərə, hissələrə ayrılır. Məsələn: **sevinclər** dedikdə sevincin müxtəlif keyfiyyətləri nəzərə çarpır. Deməli, mücərrəd mənalı sözlərin müxtəlif keyfiyyətlərini bildirdikdə onlar cəmlənə bilirlər.

İngilis dilində mücərrəd mənalı sözlər **knowledge** (bilik, biliklər), **advice** (məsləhət, məsləhətlər), **information** (məlumat, məlumatlar), **progress** (müvəffəqiyyət, müvəffəqiy-yətlər) ancaq təkdə işlədilir.

Azərbaycan dilində -lıq, -lik, -luq, -lük şəkilçili **dərəlik, daşlıq, ağaclıq, kolluq, meşəlik, dağlıq, azlıq, çoxluq, qırmızılıq, uzunluq, yaşıllıq** və s. sözlərin cəm şəkilçisi qəbul etməməsi onların kəmiyyətcə çoxluq bildirməsidir. Bu cür sözlərdə çoxluq mənası nisbətən konkretdir.

Azərbaycan və ingilis dillərində bir qisim sözlər var ki, təkdə olub topluluq məzmunu bildirirlər və cəmlənmirlər. Ancaq bu cür sözlər o zaman cəm şəkilçisi qəbul edir ki, həmin sözlər müxtəlif növləri, çeşidləri ümumiləşdirir. Azərbaycan dilində bu tip sözlərə **su, süd, un, yağ**; ingilis dilində isə **fruit** (meyvə), **hair** (saç) sözləri daxildir. Məsələn: yağlar dedikdə yağı növündən (günəbaxan yağı, kərə yağı, zeytun yağı, balıq yağı) söhbət gedir. Su, süd, un və s. sözlər də eyni qaydada fərdiləşə bilir və cəm şəkilçisini qəbul edər.

**Sular** - yağış suyu, dəniz suyu, mineral su, içməli su, şirin su və s.

**Südlər** – qoyun südü, qaramal südü, keçi südü, at südü və s.

**Unlar** – arpa unu, buğda unu, qarğıdalı unu, düyü unu və s.

İngilis dilində **fruit** (meyvə) ismi təkdə işlədildikdə ümumiyyətlə meyvə anlayışını, cəmdə işlədildikdə isə müxtəlif növ meyvələri bildirir. Eləcə də **hair** (saç) ismi ümumiyyətlə saç mənasında olduqda təkdə işlədilir, ayrı-ayrı tük mənasında işlədildikdə cəm şəklində olur. İngilis dilində **money** (pul) sözü dilimizdə olduğu kimi həmişə təkdə işlədilir.

Azərbaycan dilində cəmlik -lar, -lər morfoloji göstəricisi ilə, ingilis dilində -s(-es) morfoloji göstəricisi ilə ifadə olunur. Məsələn: **kağızlar, adamlar, quşlar, almalar və s.; books, boys, boxes.**

Cəmlik anlayışı aşağıdakı məzmunda olur:

1. Adi cəmlik (ümumi, qeyri-müəyyən cəmlik).
2. Təxmini cəmlik (ikili cəmlik).

Təkdə olan hər hansı söz Azərbaycan dilində -lar, -lər, ingilis dilində -s(-es) cəm şəkilçisini qəbul etdikdə adi cəmlik yaradır. Məs**ələn: uşaq-lar, dost-lar, böyük-lər və s.; book-books, pen-pens, girl-girls və s**. Cəm şəkilçisi qəbul etmiş sözlərin məzmununda konkret kəmiyyət deyil,

qeyri-müəyyən kəmiyyət məzmunu vardır.

Azərbaycan dilində həmişə cəmdə işlənən isimlər vardır. Bunlar, əsasən, aşağıdakılardır:

1)Yer adı bildirənlər: Dəllər (stansiyası), Xanlar (qəsəbəsi) və s.

2) Ümumi isimlərdən yaranmış şəxs adları: Şahlar, Bəylər, Xanlar, Ağalar və s.

3) Sifətlərdən əmələ gələn və müəyyən ictimai-tarixi hadisələri bildirən isimlər: qırmızılar, ağlar, qaralar və s.

4) Saylardan yaranmış isimlər: üçlər, dördlər, iyirmialtılar və s.

Bu qəbildən olan sözlər həmişə cəmdə olsalar da, təki bildirirlər.

İngilis dilində də news (yenilik (xəbər), yeniliklər), sonu -ics (physics, phonetics, mathematics və s.) ilə bitən bəzi isimlər formaca cəmdə olsalar da, tək mənasında işlədilir.

**Təxmini cəmlikdə** ifadə olunan kəmiyyət təxmini olur. Burada konkret kəmiyyət nəzərdə tutulmur. Təxmini cəmlik bir neçə yolla ifadə olunur:

1) Nəzərdə tutulan kəmiyyət konkret deyil, müəyyən ölçü, rəqəm, məsafə, çəki, həcm arasında olur. Məsələn: Səksəninci illər. Səksəninci illər dedikdə 80, 81, 82, 83 + ... 89-u nəzərdə tuturuq. Burada təxmini cəmlikdə olan müddət 10 rəqəm arasındadır. Bu on rəqəmdən konkret olaraq hansının nəzərdə tutulduğu məlum olmur.

2) Təxmini cəmlik birinci və ikinci şəxsin cəmində olan **biz və siz** əvəzliyi ilə ifadə olunur. Məsələn: Azərbaycan dilində **biz**, ingilis dilində **we** dedikdə bu sözün məzmununda bir neçə şəxs, o cümlədən 10, 20, 30, 100, 1000 şəxs ifadə oluna bilər. Göründüyü kimi, kəmiyyət burada da təxminidir.

Dilimizdə üslubla bağlı hörmət və ehtiram əlaməti olaraq, birinci şəxs özünə **biz**, ikinci şəxsə isə **siz** deyə müraciət edə bilər. Məsələn: Biz hər şeyi başa düşürük, siz xeyli yoruldunuz və s. Bu cümlələrdə hörmət, ehtiram əlaməti olaraq birinci şəxs **biz**, ikinci şəxs **siz** əvəzliyi ilə ifadə olunmuşdur.

3)Təxmini cəmlik bir sıra söz və ifadələrlə də ifadə olunur. Təxmini cəmliyin ifadə edilməsində Azərbaycan dilində **xeyli, çox, bir qisim, bir neçə, bir qədər, müəyyən qədər, əlliyə qədər, yüzə qədər, təxminən, bəzi və s.** , ingilis dilində **some, any, much, many, little, few və s**. söz və ifadələrin müəyyən rolu vardır. Məsələn: *bir neçə kitab, xeyli adam, çox məsələ, bir qədər alma, müəyyən qədər kağız, əlliyə qədər adam, yüzə qədər quş, təxminən 50 nəfər adam və s., some books, any pens, much time, many teachers, little water, few books və s.*

Təxmini kəmiyyət özünün semantik əlamətinə görə adi danışıqda başqa kəmiyyətlərə nisbətən daha çox işlənir.

Bəzən üslubun tələbindən asılı olaraq müəyyən edilən tək və cəmin adi şəkildə, əsl mənasında işlədilməsi halları pozula bilər. Yəni tələb olunan qaydadan kənara çıxmaq halları baş verə bilər. Əlbəttə, bunlar xüsusi hallardır, üslub xatirinədir. Danışıqda nəzakət və təvazökarlığı, etimadı, hörmət və ehtiramı ifadə etmək üçün siz düz deyirsiniz, siz necə düşünürsünüz, bizim fikrimizcə, biz belə hesab edirik ki ... və s. bu kimi ifadələrdə cəm əlamətinin işlədilməsi xüsusi hallarda, üslubun tələbindən törəmişdir.

Qrammatik kəmiyyət normalarının bu şəkildə “pozulması” na tamamilə mənfi hal kimi baxmaq olmaz.

Topluluq anlayışı tək və cəm anlayışlarından fərqlənir. Bu anlayışı cəmlik anlayışı ilə eyniləşdirmək və

ya qarışdırmaq olmaz. Çünki cəmlik bildirən, cəmdə işlədilən söz öz tərkibi etibarı ilə hissələrə, vahidlərə parçalanır. Məsələn: şagirdlər dedikdə bunun *Mehman, Məmməd, İradə, Solmaz və b.* şəxslərdən ibarət olduğunu müəyyənləşdirmək mümkündür, yəni tələbələr sözü hissələrə, vahidlərə ayrılır. Yaxud cəmlik bildirən **biz** şəxs əvəzliyini parçalamaq, hissələrə bölmək mümkündür. Bu sözün mənası mən + məndən başqa bir və ya bir neçə şəxs deməkdir.

Topluluq anlayışı bütöv, bölünməz, parçalanmayan, hissələrə ayrılmaz kimi başa düşülür. Məsələn: **əhali, camaat, ordu, sürü** və s. topluluq anlayışını bildirirlər.

Azərbaycan dilində bir qrup sözlərdə topluluq anlayışını -lıq, -lik, -luq, -lük şəkilçisi yaradır. Məsələn: ağac-lıq, kol-luq, meyvə-lik, qaya-lıq, qum-luq, daş-lıq, gül-lük və s.

Topluluq həm əşyaların, həm də şəxslərin, ümumiyyətlə bu və ya digər sözün cəmliyini, toplu olduğunu bildirir, məcmusunu ifadə edir.

Topluluq cəmlik bildirməsinə baxmayaraq, şəkil etibarilə tək formada mövcuddur. Odur ki, cəmlik bildirən toplu sözləri cinsinə, növünə, ümumiyyətlə, leksik – semantik mənasına görə aşağıdakı kimi qruplaşdırmaq olar:

1. İnsan qrupuna (qəbilə, tayfa və s.) aid toplu (ümumi) olan sözlər: Azərbaycan dilində camaat, bəşər, xalq, əhali, dəstə, cəmiyyət, icma, kütlə, izdiham, axar, külfət, ailə, millət, manqa, güruh, yığın, ittifaq, basırıq, təşkilat, tünlük və s.

Göstərilən bu kimi misallar qrammatik cəhətdən tək formada olsa da, məzmunca qeyri-müəyyən çoxluğu bütöv halda, yəni topluluq bildirir. Həmin sözlərə -lar, -lər şəkilçisi əlavə etdikdə həmin sözün leksik mənası məhdudlaşır və belə olduqda hər hansı bir xalqları, dəstələri, cəmiyyətləri, ümumiyyətlə insan toplusunu bildirir.

Cəmlik bildirmək üçün bu sözlərin bəzilərinə, "bütün", "cəmi" sözləri də əlavə edilir. Bu vaxt yenə də həmin sözlər təkdə işlədilir. Məsələn, bütün (cəmi) ailə, bütün (cəmi) xalq, bütün (cəmi) əhali, bütün (cəmi) dəstə, bütün (cəmi) cəmiyyət, bütün (cəmi) icma və s.

A. Əlizadə yazılı abidələrdə xalq mənasında bəzən tərkiblər də işləndiyini göstərir və "əhli aləm, aləm qamus, qamu aləm" kimi ifadələri də nümunələr verməklə Nəsimidən, Füzulidən və Xətaidən misallar göstərir.

2. Ümumi insan toplusunun az olduğunu bildirən sözlər: el, oba, nəsil, oymaq, ulus, cümlə, bütün, hamı, ümum və s.

3. Konkret insan toplusuna aid olub hərbi termin kimi işlənən sözlər: alay, ordu, qoşun, diviziya, korpus, ləşkər, tağım, dəstə, batalyon, bölmə, rota, bölük, tabor, çəri.

4. Heyvan və quş toplusunu bildirən sözlər: heyvanat, sürü, ilxı, naxır, karvan, qafilə, qatar, səf, cərgə, sürbə, davar.

5. İnsana aid olub əşya toplusu bildirən sözlər: əmlak, mülk, xəzinə, dəfinə, avadanlıq, mal və s.

6. Bitkilərə aid toplu isimlər: flora, bağ, meşə (orman), yarpaq, nəbatat, ağac, ot, budaq, kol və s.

7. Meyvə və giləmeyvə adlarından ibarət toplu isimlər: alma, armud, nar, heyva, əzgil, şaftalı, gavalı, iydə, xurma, şabalıd, fındıq, əncir, gilas, ərik, alça, zeytun, moruq, yemişan və s.

8. Taxıl fəsiləsinə aid bitki və məhsulu bildirən toplu isimlər: taxıl, buğda, qarğıdalı, arpa, düyü, yarma, sünbül, kəpək və s.

9. İnsan və heyvanlara xas olan tükdən ibarət toplu isimlər: saç, tük, saqqal, qaş, kirpik, bığ və s.

10. Digər sözlərdən ibarət toplu isimlər: ay, il, əsr, qərinə, epoxa, həftə, toz, torpaq, tüstü, pambıq, tütün və s.

Azərbaycan dilində bəzən toplu saylara da rast gəlinir. Məsələn, bir sözünü götürək. Bu say mənasına görə miqdar sayıdır. “Bir“ sözünə -gə, -likdə şəkilçiləri artırmaqla toplu say bildirir və aşağıdakı mənalarda işlədilir-birgə - bir yerdə, birlikdə, bərabər.

**Kəmiyyətin təkrar sözlərlə ifadəsi:** Məlumdur ki, bir qrup sözlər vardır ki, dildə qoşa işlədilir. Sözlərin qoşa işlənməsinə digər dillərdə olduğu kimi, Azərbaycan dilində də çox rast gəlirik və bu, geniş şəkildə özünü büruzə verir. Məsələn :qasırğa-firtina, dil-diş, mal-heyvan, bəzək-düzək, pul-mul, və s.

Dilimizdə topluluq ifadə edən məhsuldar söz yaratmaq üsullarından biri də sözlərin yan – yana (qoşa) işlədilməsidir. Qoşa sözlər adı ilə qeyd edilən sözlər, ümumiyyətlə, söz birləşməsidir. Deməli, başqa dillərdə olduğu kimi, müasir Azərbaycan dilində də kəmiyyət kateqoriyasının leksik yolla ifadəsi həm qoşa sözlərlə, həm də iki sözün təkrarı ilə əmələ gəlir və mürəkkəb söz yaranır.

İstər türkoloji ədəbiyyatda, istərsə də ümumiyyətlə dilçilikdə, az da olsa, dildə işlənən qoşa sözlər haqqında müəyyən qədər danışılmış, müxtəlif fikirlər söylənmişdir. Belə ki, bunlar dilçilikdə “mürəkkəb sözlər”, “qoşa sözlər”, “cüt sözlər” kimi hallandırılmış və xarakterizə edilmişdir.

Cütlük anlayışı ifadə edən sözlər kəmiyyət kateqoriyasında cəmlik, çoxluq, həm də topluluq mənalarını ifadə edir.

Qoşa sözlərin topluluq və cəmlik ifadə etməsini türkoloq A.N. Kononov da qeyd edir. Lakin o, burada qoşa sözlər ifadəsini yox, mürəkkəb isimlər ifadəsini işlədir. Müəllif öz əsərində iki sözün birləşməsinin leksik mənada topluluq, üslubi baxımdan isə ümumilik yaratdığını qeyd etmişdir.

Ümumiyyətlə, dilçilikdə qoşa sözlər haqqında müxtəlif fikirlər mövcuddur. Yəni qoşa sözləri müqayisəli – tarixi planda təhlil etdikdə belə fikirlər meydana çıxır. Məsələn, İ.A. Batmanov bu haqda bəhs edərkən onların müxtəlif dillərə məxsus olduğunu göstərir.

Beləliklə, başqa dillərə nisbətən Azərbaycan dilinin lüğət tərkibində topluluq anlayışı bildirən qoşa sözlər olduqca çoxdur. Odur ki, bu cür qoşa sözləri üç qrupa ayırmaq olar:

1.Qoşa sözlərin hər iki tərəfi müstəqil leksik mənaya malik olur.

2.Qoşa sözlərin birinci və ikinci komponenti lüğəvi məna daşıyır, yəni leksik mənası

aydın olur, ikinci tərəfinin (və yaxud birinci tərəfin ) leksik mənası anlaşıqlı olmur.

3.Birinci komponent leksik məna daşıdığı halda, ikinci tərəf leksik məna daşımır və birinci tərəfin (sözün) təhrif edilmiş formasını təşkil edir.

Müqayisəsini apardığımız Azərbaycan və ingilis dillərində tarixən kəmiyyət göstəriciləri mövcud olmuşdur.

XIII-XIV əsrlər ingilis dilində ümumgerman cəmlik şəkilçisi olan -**en** morfemi hələ də işləkdir. Məsələn: ox-öküz,oxen-öküzlər, child-uşaq, children-uşaqlar.

Azərbaycan dilində , o cümlədən türk dillərində **z, k, l, m, n, r, s**, **ç və ş** ünsürləri tarixən kəmiyyət göstəricisi kimi mövcud olmuşdur. Bu barədə V.A. Serebrennikov yazır: “Topluluq bildirən z, k, l, m, n, r, s, ç, ş göstəricilərini isim və sifətlərin kiçiltmə, azaltma bildirən şəkilçilərində, fellərdə hərəkətin təkrarlığını bildirən forma şəkilçilərinin tərkibində asanlıqla seçmək olur”. Bu göstəricilər

Azərbaycan dilində, eləcə də türk dillərində bir sıra sözlərin tərkibində qalsa da, kəmiyyət göstəricisi kimi izlərini itirməmişdir.

Dünya dillərində təklik, ikilik, cəmlik anlayışlarının ifadə olunmasında müəyyən qanunauyğunluqlar müşahidə olunur ki, C. Qrinberq həmin qanunauyğunluqları aşağıdakı şəkildə formula edir: " Üçlük formasının morfoloji cəhətdən ifadə edə bilən, lakin ikilik formasının morfoloji ifadəsinə malik olmayan dil yoxdur. İkilik formasının ifadəsinə malik olan, lakin cəmliyin morfoloji ifadəsinə malik olmayan dil yoxdur."

Bir tərəfdən tək (yaxud mütləq) miqdar forması, digər tərəfdən cəmlik formasının ifadəsində sintetik-flektiv dillərlə sintetik-iltisaqi dillər arasında struktur baxımından bir sıra özünəməxsus cəhətlər müşahidə olunur.

Analitik-flektiv dillərdə təklik-çoxluq qarşıdurması daha çox nəzərə çarpırsa, sintetik-aqqlütinativ dillərdə ümumilik-cəmlik oppozisiyası nəzəri cəlb edir.

Analitik-flektiv dillərdən olan ingilis dilində "iki kitab" anlayışı **two books** kimi səslənirsə, başqa sözlə, kitab (book)-s cəm şəkilçisi qəbul etmişdirsə, Azərbaycan dilində miqdar sayı ilə təyin olunan isim heç vaxt cəm şəkilçisi qəbul edə bilməz. Məs.: çox kitab, beş kitab. İngilis dilində isə belə halda isim cəmdə olur: many books, five books. İngilis dilində ancaq cəm mənasını verən **goods-** mal, mallar, **contents** - mündəricat, **riches**- var-dövlət, clothes-paltar isimləri cümlədə mübtədadırsa, feil cəmdə olmalıdır. Azərbaycan dilində isə belə isimlərin məzmunundan asılı olaraq feil ya təkdə, ya da cəmdə ola bilir.

**The contents** of this book **are** interesting- Bu kitabın mündəricatı maraqlıdır.

My **clothes are** wet- Paltarım yaşdır.

Qeyd etdik ki, ingilis dili analitik-flektiv dildir. Azərbaycan dili isə aqqlütinativ dillərə daxildir. Aqqlütinativ dillərdə şəkilçilər sözün kökünə çox möhkəm bağlı olmur. Burada söz öz tərkib hissələrinə asanlıqla bölünür. Məsələn: cəm şəkilçisi qəbul etmiş **yazıçılar** sözünü asanlıqla tərkib hissəsinə ayırmaq olur: yaz-ı-çı-lar. Göründüyü kimi, sanki kök və şəkilçilər süni olaraq bir-birinə yapışdırılmışdır, onları asanlıqla ayırmaq olur.

Aqqlütinativ dillərdə müəyyən qrammatik məna bu və ya başqa sözdə hansı şəkilçi vasitəsilə ifadə olunursa, digər sözlərdə də həmin şəkilçi ilə ifadə edilir.

Məsələn: kitab-lar
kitab-lar-da
traktor-lar
tələbə-lər
dəniz-lər

Göründüyü kimi, Azərbaycan dilində cəmlik anlayışı hər yerdə eyni şəkilçilərlə, yəni -lar və -lər ilə ifadə edilmişdir.

Bundan əlavə, aqqlütinativ dillərdə şəkilçilər bir sözdə eyni zamanda ancaq bir vəzifə ifadə edir. Məsələn: məktəblər, lövhələr. Bu misallarda "lər" vasitəsi ilə ancaq cəmlik anlayışı ifadə olunur.

İngilis dilinin daxil olduğu flektiv dillər isə aşağıdakı xüsusiyyətlərinə görə aqqlütinativ dillərdən fərqlənir:

1) Şəkilçilər bir-biri ilə və köklə möhkəm bağlı olur. Bu dillərdə çox zaman şəkilçiləri kökdən ayırmaq mümkün deyildir.
2) Başqa dillərə nisbətən flektiv dillərdə daxili fleksiya, yəni qrammatik forma yaratmaq üçün söz köklərində səslərin dəyişməsi halları daha qüvvətlidir.

Məsələn: man – kişi men – kişilər
woman – qadın women - qadınlar

tooth – diş teeth – dişlər
foot – ayaq feet – ayaqlar

Göründüyü kimi, ingilis dilindəki “kişilər”, “qadınlar”, “dişlər”, “ayaqlar” sözləri daxili fleksiya əsasında dəyişib yeni qrammatik forma əmələ gətirir.

Qeyd olunanlara əsasən belə nəticəyə gəlmək olar:

- Kəmiyyət kateqoriyasının dilçilikdə xüsusi rolu vardır. Bu kateqoriyanın tarixi çox qədimdir.
- Azərbaycan və ingilis dillərində isimlərin müəyyən bir qismi morfoloji əlamət olmadan cəmlik, topluluq, çoxluq, qeyri-müəyyən cəmlik anlayışlarını bildirir və bunlar da özlüyündə maraqlı xüsusiyyətlərə malikdir.
- Kəmiyyət kateqoriyası müqayisə olunan hər iki dildə işlədilərək bütün isimlərdə, eləcə də sifətlərdə, saylarda, əvəzliklərdə, feillərdə mövcuddur və o, real aləmlə bağlıdır.
- Azərbaycan dilindən fərqli olaraq, ingilis dilində digər dillərdən alınmış isimlər öz cəm şəkilçilərini həmin dillərdə olduğu kimi saxlamışlar.
- Azərbaycan dilində miqdar saylarından sonra gələn isimlər cəm şəkilçisi qəbul etmir, ingilis dilində miqdar saylarından sonra gələn isimlər cəmlənir.
- Kəmiyyət kateqoriyasında sözlərin qoşa (cüt) işlənməsi geniş yayılmışdır. Bunlar həm eyni sözün təkrarından, həm də qoşa sözlərdən ibarət olub mürəkkəb bir söz yaradır.
- Tədqiq etdiyimiz dillərdə tarixən kəmiyyət göstəriciləri mövcud olmuşdur. İngilis dilində bəzi sözlərin cəmini əmələ gətirən -en morfemi tarixən ən işlək kəmiyyət göstəricisi olmuşdur.
- Azərbaycan dili aqqlütinativ dil tipinə daxil olduğundan cəm şəkilçisi yalnız söz kökünün sonuna əlavə edilir. Azərbaycan dilindən fərqli olaraq ingilis dili flektiv dil tipinə daxil olduğundan bəzi sözlərin cəmi flektiv yolla, yəni kökdən dəyişərək əmələ gəlir.

Azərbaycan və ingilis dillərində kəmiyyət kateqoriyasının ifadə vasitələri demək olar ki, bir-birindən o qədər də fərqlənmir. Lakin hər iki dildə kəmiyyət kateqoriyasının özünəməxsus xüsusiyyətləri də vardır.

**Problemin aktuallığı.** Dilçilikdə bir sıra kateqoriyalar mövcuddur ki, bunlardan biri də kəmiyyət k-ateqoriyasıdır. Bu kateqoriya əşyanın miqdarını və onun inkişaf səviyyəsini əks etdirir. Keçmiş zamanlarda insanlar üçün əşyanın mahiyyətini anlamaq, onun miqdarını, əlamətinin dərəcəsini bilmək vacib məsələ idi. Ona görə də insan əşyanı dərk etmək üçün onun mücərrəd kəmiyyətinə nüfuz etməli olurdu.

**Problemin elmi yeniliyi.** Kəmiyyətləşmə məntiqi anlayışı əsasında mənaya bənzətməklə təbii dildə kəmiyyət göstərən ifadələrə kəmiyyət göstəriciləri deyilir: çox, bir neçə, bəzi, yüzlərlə, yığın, bir stəkan, kilo və s. “kəmiyyət göstəriciləri” isim ifadəsindəki müəyyən bir boşluğu doldurur, beləliklə, qruplaşmaları həm mənalarına, həm də paylanmalarına görə əsaslandırır.

**Problemin praktik əhəmiyyəti.** Kəmiyyət kateqoriyası insan təfəkkürünün ən vacib kateqoriyalarından biri kimi çoxsistemli və geniş spektrli təhlil tələb edir. Miqdarı, ədədi münasibətləri, say və kəmiyyət əlaqəsi olan leksik vahidlərin semantikası kateqoriyası müxtəlif humanitar və təbiət elmləri sahələrinin tədqiqat mövzusudur. Həmçinin kəmiyyət kateqoriyası bir çox dillərin inkişaf edib zənginləşməsində mühüm yer tutur.

**Ədəbiyyat:**

1. Aslanov A. Müasir Azərbaycan dilində qrammatik kateqoriyalar. -Bakı, 1985.

2. Budaqov R.A. Dilçiliyə dair oçerklər. -Bakı, Azərnəşr, -1956.
3. Əlizadə A.C. Azərbaycan dilində kəmiyyət kateqoriyası. (XIV-XIX əsrlər ədəbi dili abidələri əsasında). -Bakı, 1966.
4. Гринберг Дж. Некоторые грамматические универсалии, преимущественно касающиеся порядка значимых элементов. -М., 1970.
5. Кононов А.Н. Грамматика тюркских рунических памятников. Наука, -1980.
6. Серебренников Б.А. О некоторых частных деталях процесса образования аффикса множественного числа -лар в тюркских языках. СТ, № 1, 1970.
7. Müller V. Complete English-Russian Dictionary (New Edition). −Moscow, 2008.
8. Ganshina M.A., Vasilevskaya N.M. English Grammar. Higer schole publishing House, -1964.

**E-mail:** xeyale20202@mail.ru
**Redaksiyaya qəbul olub:**18.03.2024.

*UOT 37*

***Zümrüd Mahir qızı Qafarlı***
*Azərbaycan Dillər Universitetinin müəllimi,*
*fəlsəfə doktoru proqramı üzrə doktorant*
***Orcid**: https://orcid.org/0000-0002-0663-4640*

## İNGİLİS DİLİNİN TƏDRİSİNDƏ SABİT SÖZ BİRLƏŞMƏLƏRİNİN TƏSNİFATI PROBLEMLƏRİ

***Зумруд Махир гызы Гафарлы***
*преподаватель Азербайджанского Университета Языков,*
*докторант по программе доктора философии*

## ПРОБЛЕМЫ КЛАССИФИКАЦИИ УСТОЙЧИВЫХ СЛОВОСОЧЕТАНИЙ В ОБУЧЕНИИ АНГЛИЙСКОМУ ЯЗЫКУ

***Zumrud Mahir Gafarli***
***lecturer at** Azerbaijan University of Languages*
*doctorial student in the program of doctor of philosophy*

## ISSUES OF CLASSIFICATION OF PHRASEOLOGICAL UNITS IN TEACHING ENGLISH

**Xülasə.** Məqalədə ingilis dilində sabit söz birləşmələrinin, frazeoloji vahidlərin təsnifatı məsələləri araşdırılır. Dominant hesab olunan modellər P. Houarts, A. Koui, İ. Melçuk, Sezar, Cerni və s. kimi linqvistlər tərəfindən qəbul olunan meyarlar və onlara uyğun təsnifatlar təhlil olunur. İngilis dilini professional məqsədlərlə öyrənən tələbələrin təsnifatları bilməsi, sabit söz birləşmələrinin mənasını və ifadə variantını düzgün mənimsəyə bilməsinə və dildaşıyıcıları ilə ünsiyyətdə də çətinlik çəkməmələrinə kömək etdiyi qənaətinə gəlinir.
**Açar sözlər:** *təsnifat, sabit söz birləşmələri / frazeoloji vahidlər, semantik cəhətdən şəffaf ifadələr, semantik cəhətdən qeyri-şəffaf ifadələr, sintaktik quruluş*

**Резюме.** В статье рассматриваются вопросы классификации устойчивых словосочетаний и фразеологизмов в английском языке. Доминирующими моделями являются Ховарт, Коуи, Мельчук, Цезарь, Джерни и др. анализируются принятые лингвистами критерии и соответствующие им классификации. Делается вывод о том, что знание классификаций студентов, изучающих английский язык в профессиональных целях, помогает им правильно усваивать значение и выражение устоявшихся словосочетаний и не испытывать затруднений в общении с носителями языка.
**Ключевые слова:** *классификация, устойчивые словосочетания/ фразеологизмы, семантически прозрачные выражения, семантически непрозрачные выражения, синтаксическая конструкция*

**Summary.** The article examines the classification issues of stable/fixed word combinations and phraseological units in English. The dominant models are Howarth, Cowie, Melchuk, Caesar, Jerney, etc. the criteria accepted by linguists and their corresponding classifications are analyzed. It is concluded that knowing the classifications of students learning English for professional purposes helps them to

master the meaning and expression of fixed word combinations correctly and not to have difficulties in communicating with their native speakers.

**Keywords:** *classification, fixed word combinations / phraseological units, semantically transparent expressions, semantically opaque expressions, syntactic construction*

Kollokativ fenomenlərin təsnifatı problemi frazeologiyada tədqiqatların mərkəzində dayanır. Təsnifat – ümumi xüsusiyyətləri təqdim edən linqvistik vahidləri müəyyən etmək deməkdir. Sabit söz birləşmələrinin, yəni frazeoloji vahidlərin tədqiqi yolları dünyada onlara həsr olunmuş müxtəlif tədqiqatlara görə əhəmiyyətli dərəcədə dəyişir və təsnifat frazeologiyada tədqiqatın sabit elementi kimi müəyyən olunur. Bu sabitlik vahidliyi nəzərdə tutmur, çünki müxtəlif tədqiqatların təhlili ilə biz, bütöv bir mənzərəni müəyyənləşdirməyə çalışırıq.

Frazeoloji vahidlərin təsnifatındakı uyğunsuzluqlar, yığcamlıq hadisəsinin təsir etdiyi konstruksiyaların mürəkkəbliyi və müxtəlifliyi ilə əlaqədardır. Polileksik vahidlərin təbiətini və fəaliyyətini tənzimləyən bir çox parametrlər mövcuddur və təsnifatı formalaşdıran bu parametrlərdən birinə və ya bir neçəsinə üstünlük verilir.

Bizim ünsiyyətimiz frazeoloji vahidlərin tipologiyasının əsasını təşkil edən, çox vaxt meyarlar baxımından qəbul edilən əsas parametrləri öyrənir. Üstəlik, dominant hesab olunan model P. Houarts, A. Koui, İ. Melçuk və s. kimi linqvistlər tərəfindən qəbul olunaraq davamlılıq prinsipinə əsaslanır.

Frazeologiyada təsnifat məsələsi kifayət qədər aktual görünür, çünki təsnifat prosesi müşahidə olunan vahidlərin mahiyyətini və fəaliyyətini başa düşmək üçün əsasdır. Bu mənada, müşahidə olunan faktların təsnifatını kollokativ fenomenlərin hər hansı sonrakı təhlili üçün ilkin və vacib olan iş metodu kimi görmək olar. O, həm də dil öyrənmə kontekstində və ya yazı və tərcümədə kömək edəcək vasitələrin yaradılması kontekstində mürəkkəb dil vahidləri ilə işləmək üçün faydalı bir üsuldur.

Niyə sabit söz birləşmələri, yəni frazeoloji vahidlər təsnifat problemi yaradır? Frazeoloji birləşmələrin ən kiçik elementləri hesab olunan fonemlər, morfemlər və leksemlər bütün elmi ictimaiyyət tərəfindən qəbul edilən fundamental təsnifatlara malikdir. Bunun sübutu, aşağıda göstərildiyi kimi, müxtəlif xarakterli leksik elementlərin çoxluğunda təzahür edir: *very, because, with, to build, nonchalant, arduous, superfluous, in, to hit, sea, immense,* to *surprise, diversity, affair, where* etc.

İsimlər, fellər, sifətlər, zərflər, sözönülər və bağlayıcılarla işlədiyimizə görə yuxarıdakı sözlərin təsnifatını vermək olduqca asandır:

**Nouns Verbs Adjectives**
*sea to build nonchalant*
*diversity to hit arduous*
*affair to surprise immense*
*superflous*

**Adverbs Prepositions Conjunctions**
*very with because*
*in where*

Təbii ki, ənənəvi təsnifatlar tez-tez təkrarlanır, aydınlaşdırılır, hətta təkzib edilir. Buna baxmayaraq, onlar bu elementlərin təbiətini və fəaliyyətini araşdırmağa çalışan tədqiqatlar üçün sabit başlanğıc nöqtəsini təşkil edir.

Frazeoloji aləmdə belə yanaşma ağlasığmazdır. Frazeoloji birləşmələrin çoxluğu onların yenidən

təsnif olunması üçün kəskin linqvistik təhlillər tələb edir.

Bu baxımdan yuxarıda qeyd olunanlar dildə mövcuddur və əhəmiyyətsiz məsələlər deyil.

*Good accounts make good friends, people's savings accounts, in the presence of, start a car, see you soon, conduct an experiment, petrol engine, soon, put on your thirty-one, make the bridge, insofar as, in the same way, to draw a conclusion, after me the deluge!*

Bu misalları sintaktik quruluşuna görə təsnif etmək və təxminən aşağıdakı qrupları müəyyən etmək mümkündür:

**The structures-based nominal:**

*When the time comes*
*people's savings account*
*petrol engine*

**The structures-based verbal:**

*make the bridge*
*to draw a conclusion*
*conduct an experiment*
*start a car*
*put on your thirty-one*

**The ready-made sentences:**

*Good accounts make good friends.*
*After me, the deluge!*

**The structures-based prepositional:**

*soon*
*in the presence of*
*insofar as*
*in the same way*
*see you soon*

**Polileksik elementlərin semantik şəffaflığına görə təsnifatı:**

**1) Semantik cəhətdən şəffaf ifadələr / Semantically transparent expressions:**

*when the time comes, make the bridge, insofar as, people's savings accounts, soon, good accounts make good friends, see you soon, to draw a conclusion, in the presence of, conduct an experiment, start a car, petrol engine, in the same way*.

**2) Semantik cəhətdən qeyri-şəffaf ifadələr / Semantically opaque expressions:**

*put on your thirty-one, after me the deluge!*

Frazeoloji vahidlər həqiqətən çox mürəkkəb və çox qeyri-bərabər bir bütöv təşkil edir və onların təsnifatını problemli edən məhz bu uyğunsuzluqdur. Və frazeoloji vahidlərin təsnifatının çətinliyi çox vaxt onların təbiətinin mürəkkəbliyinin ifadəsidir.

R. Qleyzer tərəfindən təklif olunan frazeoloji birləşmələrin tipologiyası ingilis dilinin frazeologiyasına qloballaşan baxışı təklif etməyə meyllidir. R. Qleyzer ingilis frazeoloji tərkibini üç sferaya ayırır: “mərkəz sfera” (mərkəz), “keçid sferası” (keçid sahəsi) və “periferik sfera” (periferiya). [3]

Frazeoloji sistemin mərkəzini "nominativ funksiyalı vahidlər", yəni monoleksik vahidlər təşkil edir. Frazeoloji sistemin bu mərkəzi hissəsi funksional meyar əsasında alt kateqoriyalara bölünür. Beləliklə, R. Qleyzer nominal (bread and butter), adjectival (born under a lucky star), verbal (to have a swim), və s. vahidləri müəyyən edir. [3]

Keçid zonası monoleksemlər və cümlələr arasında ortada olan vahidləri əhatə edir. Bunlar R. Qleyzerin “cümlə şəklində idiomlar” adlandırdığı bir növ cümlə parçalarıdır. Orada atalar sözlərinin ellipslərini (a rolling stone), dəyişməz binomları (the ups and downs), stereotip müqayisələri (as proud as a peacock) və s. təsnif edir.

Xarici zona cümlələri təşkil edən vahidləri əhatə edir. Atalar sözləri (All roads lead to Rome.), həqiqətlər (We

only live once.), klişelər (How do you do?) sitatlar (Speak softly and carry a big stick; you will get far.) və s.

R. Qleyzer frazeoloji birləşmələrin tipologiyasını sözəbənzər vahidlərlə cümləyə oxşar vahidlər arasındakı fərqə əsaslandırır. Ümumiyyətlə, onun tipologiyası həm də frazeoloji birləşmələrin istifadə tezliyi məsələsinə əsaslanır. Mərkəzdəki bölmələr keçid və periferik bölgələrə nisbətən daha çox yayılmışdır. Tezlik polileksik vahidin identifikasiyası prosesində təkrarlanan parametrdir [3].

R. Qleyzerdən fərqli olaraq, Qross öz tədqiqatının mərkəzinə sərtlik və semantik qeyri-şəffaflıq meyarlarını qoyur. Qross "Sabit söz birləşmələri/ifadələr: mürəkkəb adlar və digər ifadələr" [5] kitabında frazeoloji vahidləri təhlil edərkən onu maraqlandıran əsas xüsusiyyətlərin sabit dəyişməz olduğunu vurğulayır. Qross polileksik vahidlərin müxtəlif dərəcələrə görə sabitləşdiyini təsdiq edir və onların sabitlik dərəcəsini müəyyən etməyi qarşısına məqsəd qoyur. Bu məqsədlə onları transformasiya generativ qrammatikası qaydalarına uyğun çoxsaylı sintaktik transformasiyalara təqdim edir, frazeoloji birləşmələrin sərtlik dərəcəsi əslində onun transformasiya çatışmazlığına görə hesablanır. Sabitlik meyarı ilə Qross müntəzəm olaraq semantik qeyri-şəffaflıq meyarını əlaqələndirir, üstəlik sabitlik, semantik qeyri-şəffaflıq, qeyri-kompozisiya və sintaktik məhdudiyyətlərin birlikdə getdiyini izah edir. Beləliklə, o, misal olaraq the verbal phrase *take the tangent* and the compound noun *blue cord*-u götürür, bunların heç biri bütünün mənasını proqnozlaşdırmağa imkan vermir ("to get out of trouble skilfully, to flee discreetly" and "good cook") və sintaktik çevrilmələri qəbul etmir.

Bir çox başqa frazeoloqlarda olduğu kimi Qrossda da tamamlayıcı tipologiyalara rast gəlirik. Beləliklə, meyarlara uyğun olaraq frazeoloji birləşmələrin ilkin təsnifatı mövcuddur. Bunlar *compound nouns, compound determiners and verb, adjectival, adverbial, prepositive and conjunctive phrases* ifadələrdəki funksiya, eləcə də mürəkkəb isimlərin alt təsnifatı yaxud gah sintaktik parametrlərə, gah da semantik parametrlərə əsasən əsaslandırdığı *des locutions adverbial phrases,* yəni sabit söz birləşmələridir [5, s. 48-59, 111-113, 119-120].

Bir çox başqa dilçilər, leksik birləşmələrin müxtəlif alt qruplarını müəyyən etmək üçün öz layihələrində sintaktik testlərdən istifadə etmişlər, transformasiya çatışmazlığı effektiv şəkildə frazeoloji birləşmələrin dondurulmasının nəticəsidir. Bu, P. Houartsın araşdırmalarının nümunəsində özünü göstərir.

P. Houarts [7, s. 33, 46-47; 1998: s.164] ingilis frazeoloji birləşmələrinin hər birinin daxilindəki sözlərin assosiasiyasının sərbəst birləşməyə və ya məhdud kolokasiyaya əsaslanmasına və ya onun məcazi idiomatik ifadə (məcazi idiom) və ya saf olmasına görə idiomatik ifadə (saf idiom) təsnif edir. Beləliklə, o sabit söz birləşmələrini/frazeoloji birləşmələri dörd kateqoriyaya bölür:

1. free combination (ex. blow a trumpet)
2. restricted collocation (ex. blow a fuse)
3. figurative idiom (ex. blow your own trumpet)
4. pure idiom (ex. blow the gaff). [7]

Bu təsnifatın əsasında sabit söz birləşmələrinin müxtəlif əsas xüsusiyyətlərinin təhlili dayanır. Həqiqətən, P. Houarts ən azı 6 parametr təyin edir və bunların hər biri frazeoloji birləşmələrin spesifik

statusunu və onun bu və ya digər alt sinfə üzvlüyünü qiymətləndirməyə xidmət edir. O parametrlər bunlardır: *wellformed, institutionalized, specialized element, collocationally restricted, semantically unitary, unmotivated* [7, s. 46-47].

Açıq-aydın görünür ki, P. Houarts öz təsnifatını frazeoloji birləşmələrin bir neçə əsas xüsusiyyətləri ilə məhdudlaşdırmamağa cəhd etsə də, onun tipologiyası son nəticədə yalnız üç parametrə əsaslanır. “Tanınan forma” meyarı heç bir fərq qoymağa imkan vermir. “İnstitusionallaşma” meyarı dəyişkən və ya uyğunsuz kimi təqdim olunur. “İxtisaslaşma” və “kollokativ məhdudiyyət” meyarlarına gəlincə, onlar üst-üstə düşür. Buna görə də saxlanılan parametrlər "kollokativ məhdudiyyət” (yəni sərtlik) [7 s. 137], "semantik unikallıq” (yəni qeyri-kompozisiya) [7 s. 138] və "motivasiyanın olmaması" [7 s. 139]. Bununla belə, bu, bir neçə meyarın aydın çarpaz təhlili əsasında frazeoloji birləşmələri təsnif etmək üçün ilk cəhddir.

İ. Melçukun təsnifatı [10, s. 84, 11, s. 30] P. Houartsın təsnifatı ilə əhəmiyyətli dərəcədə eynidir, istisna olaraq, o, əlavə kateqoriyanı, praqmatlar kateqoriyasını ehtiva edir. Praqmatizm situasiya konteksti ilə əlaqədar olaraq dondurulmuş ardıcıllıqları qruplaşdırır (məsələn, İ. Melçuka görə, bu, telefonda kiməsə sual verildiyi bir vəziyyətdə istifadə etmək üçün yeganə mümkün variantdır; İ. Melçuk praqmatik çatışmazlıqları qeyd edir. Və frazeoloji vahidlərin qrammatik və semantik cəhətdən məqbul olsa da, situasiyaya uyğun gəlməsi məsələsini vurğulayır. [ 11, s. 83].

İ. Melçuk frazemləri (phrasemes) iki yerə bölür: praqmatik frazemlər (pragmatic phrasemes) və semantic frazemlər (semantic phrasemes). Onlar da öz növbəsində pragmatems, idioms, collocations, quasi-idioms olaraq alt komponentləri təşkil edirlər. Bu bölgü İ. Melçukun 1993-cü ildə hazırlanmış və 1998-ci ildə yenilənmiş bölgüsüdür. Praqmatlardan əlavə İ.Melçukun “idiomları/idioms" ilə P. Houartsın "saf idiomlar/idioms pure", “sabit söz birləşmələri/collocations”, "məhdudiyyətli birləşmələr/restrictive collocations", "məcazi deyimlər/figurative idioms/", "kvazi-idiomalar/quasi-idioms" ilə müqayisə etmək olar.

«O klasifikaciji frazema» məqaləsində Jerney [8, s.192] frazeoloji birləşmələrin müxtəlif mümkün təsnifatlarını müzakirə edir, lakin o, etimoloji təsnifata üstünlük verir, çünki onun fikrincə, bu, tarixi maraq doğuran müəyyən sayda suallara cavab verməyə imkan verir. Cerni təsnifatını xorvat dili əsasında aparır. Təbii ki, bunun da ingilis dilindəki frazeoloji birləşmələrlə oxşar və fərqlilikləri var.

***D. Sezarın Tipologiyası*** [14]. D. Sezar [14, s.305-312] öz tədqiqat işində "qanadlı sözlər" (*krilatica*) adlandırdığı dəbdə olan sözləri, yəni tarixi, siyasi və ya mədəni materialın təkamülündə mühüm əhəmiyyət kəsb edən bütün praktik və çox vaxt əyləncəli ifadələri sadalayır: atalar sözləri, cümlələr, aforizmlər, mətnlərdən çıxarışlar, məşhur deyimlər, sitatlar, əsərlərin adları, məşhur mahnılar, şüarlar, reklam mətnləri və s.

D. Sezar izah edir ki, bu vahidlərin mənşəyi onları təsnif etməyə imkan verən yeganə tanınmış işarədir. Beləliklə, o, onları *biblical* mənbənin olub-olmamasına görə təsnif etməyi təklif edir və tədricən polileksik vahidlərin tipologiyası, əsasən, dilin frazeoloji materialını bilmək məsələsinə çevrilir. Həqiqətən, sabit birləşmələrin hər hansı təsnifatı mütləq müxtəlif növ kollokativ

hadisələrin dərin biliyini ehtiva edir. Bu həm də 1980-ci illərdə və ondan sonrakı illərdə sabit birləşmələrin tipologiyasının frazeologiya üzərində işdə həqiqətən problemə çevrildiyini də izah edir.

A. Halidey [6], C.M. Sinkler [15] və hətta L. Zqustanın [16] frazeologiya sahəsindəki ilk tədqiqatlarında biz sabit söz brləşmələrinin təsnifatına dair heç bir izə rast gəlmirik, çünki mövcud biliklər onların tipologiyası problemini təqdim etməyə hələ imkan vermirdi.

Sabit söz birləşmələrinin tipologiyasını tənzimləyən meyarlara əsasən, biz göstərməyə çalışdıq ki, sabit söz birləşmələrinin tipologiyalarının çoxluğu böyük müxtəliflik ilə bağlıdır. Və ingilis dilini professional məqsədlərlə öyrənən tələbələr təsnifatları bildikdə, sabit söz birləşmələrinin mənasını və ifadə variantını düzgün mənimsəyə bilir və dildaşıyıcıları ilə ünsiyyətdə də çətinlik çəkmirlər.

**Problemin aktuallığı.** Səmərəli ünsiyyət üçün ifadələrin düzgün istifadəsi vacibdir. İngilis dilində leksik bacarıqların yaradılması, formalaşdırılması və inkişaf etdirilməsi, xüsusilə də sabit söz birləşmələrinin tədrisi məsələlərinə dair xüsusi tədqiqatlar aparmış bəzi linqvist və metodistlərin elmi araşdırmaları ilə tanışlıq göstərir ki, yüksək səviyyədə dil öyrənənlərə leksik materialların təqdimatı və onların təsnifatları bilməsi, bununla bağlı yeni yanaşmaların tədris prosesinə gətirilməsi sayəsində uğurlu nəticələr əldə edilmişdir. Bu metodların öyrənilməsi və tətbiqi ingilis dilini öyrənərkən böyük əhəmiyyət kəsb edir və dil öyrənmə prosesini daha da asanlaşdırır.

**Problemin elmi yeniliyi.** Məqalə İngilis dilinin tədrisi zamanı sabit söz birləşmələrinin təsnifatı məsələlərinə həsr olunmuşdur.

**Problemin praktik əhəmiyyəti.** Məqalə sabit söz birləşmələrinin tədrisi zamanı ingilis dili dərslərini daha məhsuldar keçmək istəyən müəllimlər, həmçinin gənc tədqiqatçılar, doktorant və dissertantlar üçün faydalı olacaqdır.

**Ədəbiyyat:**


1. Benson, M., Benson E. & Ilson, R. (1997) The BBI Dictionary of English Word Combinations, 2nd ed., Amsterdam/Philadelphia: John Benjamin’s Publishing Company
2. Cowie, A. P. (1998a) Introduction. In Cowie, A. P. (Ed.) Phraseology: Theory, Analysis, and Applications, Oxford: OUP, pp. 1-20.
3. Gläser, R. (1988) The grading of idiomaticity as a presupposition for a taxonomy of idioms. In Hüllen, Werner & Schulze, Rainer (Eds.) Understanding the Lexicon, Tübingen: Max Niemeyer, pp. 264-279.
4. Gläser, R. (1998) The stylistic potential of phraseological units in the light of genre analysis. In Cowie, A. P. (Ed.), Phraseology: Theory, Analysis, and Applications, Oxford: OUP, pp. 125-143.
5. Gross, G. (1996) Les expressions figées en français : noms composés et autres locutions, Paris/Gap : Ophrys, coll. L’essentiel français.
6. Halliday, M. A.K. (1966) Lexis as a linguistic level. In Bazell, Charles E.; Catford, John C.; Halliday, Michael A.K. & Robins, Robert H. (Eds.) In Memory of J.R. Firth, London/Harlow: Longmans, pp. 148-162.
7. Howarth, P. A. (1996) Phraseology in English Academic Writing: Some Implications for Language Learning and Dictionary Making, Niemeyer, Tübingen Howarth, P. A. (1998) The Phraseology of Learners’ Academic Writing. In Cowie, A. P. (Ed.), Phraseology: Theory, Analysis, and Applications, Oxford: OUP, pp. 161-186

8. Jernej, J. (1992-1993) O klasifikaciji frazema. Fililogija, knjiga 20-21, Zagreb : Hrvatska akademija znanosti i umjetnosti, pp. 191-197
9. Jernej, J. (1996) Bilješke oko porjekla naše frazeologije. Suvremena lingvistika, vol. 41-42
10. Mel'čuk, I. A. (1993) La phraséologie et son rôle dans l'enseignement/apprentissage d'une langue étrangère. Etudes de Linguistique Appliquée, vol. 92, pp. 82-113
11. Mel'čuk, I. A. (1998) Collocations and lexical functions. In Cowie, A. P. (Ed.),
12. Phraseology: Theory, Analysis, and Applications, Oxford: OUP, pp. 23-53
13. Moon, R. (1998) Fixed Expressions and Idioms in English: A Corpus-based Approach, Oxford: Clarendon Press
14. Pecman, M. (2004). Phraséologie contrastive anglais-français : analyse et traitement en vue de l'aide à la rédaction scientifique. Thèse de doctorat (9. déc. 2004, dir. H. Zinglé), Université de Nice – Sophia Antipolis.
15. Sesar, D. (1998) O mjestu i ulozi krilatica u frazeološkim rječnicima. Fililogija, Odsjek za slavenske jezike i književnosti, Zagreb, 30-31.
16. Sinclair, J. M. (1966) Beginning the Study of Lexis. In Bazell, Charles E., Catford, John.
17. Zgusta, L. (1967) Multiword lexical units. Word, n. 23, pp. 578-587

**E-mail:** z_qafarli@hotmail.com
**Redaksiyaya qəbul olub:**18.03.2024

*UOT 371*

***Sahilə Əli qızı Quliyeva***
*Naxçıvan Dövlət Universitetinin müəllimi*
***Orcid:*** https://orcid.org/ 0009-0001-9949-4199

## İNGİLİS DİLİNİN TƏDRİSİNDƏ BƏDİİ MƏTNLƏRİN SEÇİLMƏSİ PROSESİ

***Сахиля Али гызы Гулиева***
*преподаватель Нахчыванского Государственного Университета*

## ПРОЦЕСС ОТБОРА ХУДОЖЕСТВЕННЫХ ТЕКСТОВ ПРИ ОБУЧЕНИИ АНГЛИЙСКОМУ ЯЗЫКУ

***Sahila Ali Guliyeva***
*the teacher of Nakhchivan State University*

## THE PROCESS OF SELECTING LITERARY TEXTS IN ENGLISH LANGUAGE TEACHING

**Xülasə.** Məqalə xarici dillərin tədrisində istifadə oluna bilən bədii mətnlərin seçilməsinə həsr olunmuşdur. Xarici dilin tədrisi üçün bədii mətnlərin seçilməsi çoxmərhələli prosesdir və bu, həmin mütəxəssislərin, o cümlədən bu seçimdə iştirak edən müəllimlərin ədəbiyyatı qiymətləndirmək üçün istifadə etdiyi meyarlardan çox asılıdır. Mühüm seçim meyarları mətnin leksik mürəkkəbliyinin tələbələrin dil hazırlığı səviyyəsinə uyğunluğu, həmçinin bu mətnə münasibətdə mətn, mühit və oxucu arasında effektiv qarşılıqlı əlaqəni təmin etmək bacarığıdır. İngilis dilini öyrənən tələbələrin xarici dili daha geniş kontekstdə istifadə etmək məqsədilə sərbəst

ünsiyyət üçün kifayət qədər bacarıqlar əldə etməsi müəyyən faktorları daxil edir ki, bura bədii mətnlərin öyrənilməsi proqramı da daxildir.
***Açar sözlər:*** *xarici dilin tədrisi, bədii mətnlərin seçilməsi, bədii əsər, mətnin məzmunu*

**Резюме**. Статья посвящена выбору художественных текстов, которые могут быть использованы при обучении иностранным языкам. Отбор художественных текстов для обучения иностранному языку представляет собой многоэтапный процесс и во многом зависит от критериев, по которым оценивают литературу эксперты, в том числе преподаватели, участвующие в этом отборе. Важными критериями отбора являются соответствие лексической сложности текста уровню языковой подготовки учащихся, а также способность обеспечить эффективное взаимодействие текста, среды и читателя по отношению к этому тексту. Изучающие английский язык приобретают достаточные навыки свободного общения, чтобы использовать иностранный язык в более широком контексте, включая определенные факторы, к которым относится изучение художественных текстов.
***Ключевые слова****: преподавание иностранного языка, подбор художественных текстов, художественное произведение, содержание текста*

**Summary**. The article deals with the selection of literary texts that can be used in teaching foreign languages. The selection of literary texts for teaching a foreign language is a multi-stage process and it depends a lot on the criteria used by those experts, including the teachers involved in this selection, to evaluate the literature. Important selection criteria are the appropriateness of the lexical complexity of the text to the students' level of language preparation, as well as the ability to ensure effective interaction between the text, the environment and the reader in relation to this text. English language learners acquire sufficient skills for free communication in order to use the foreign language in a wider context, including certain factors, which include the study of literary texts.
***Key words****: foreign language teaching, selection of literary texts, literary work, content of the tex*

Xarici dilin tədrisi üçün bədii mətnlərin seçilməsi çoxmərhələli prosesdir və bu, həmin mütəxəssislərin, o cümlədən bu seçimdə iştirak edən müəllimlərin ədəbiyyatı qiymətləndirmək üçün istifadə etdiyi meyarlardan çox asılıdır. Bəzi müəllimlər insan təbiətinin öyrənilməsinə ciddi töhfə vermiş habelə, zamanın sınağından çıxmış, həm də böyük müəlliflərin əsərlərini ədəbiyyat hesab etməyi təklif edir, digər müəllimlər isə hər hansı qiymətləndirmənin nisbiliyini və müəyyən bir tarixi dövrün adət-ənənələrindən, dəyərlərindən asılılığını qəbul edir [6, s.127].

İngilis dilini tədris edərkən, bədii materialın (mətnin) seçilməsi ilkin məsələlərdən biri hesab edilir. Bir çox müəlliflər (M.D. Zinovyeva, Q.A. Zolotova və d.) güman edir ki, bədii ədəbiyyat mənbələrinin axtarışını aparıcı nümayəndələrində axtarmaq lazımdır.

Bəzən ədəbiyyat seçimində əsərdən daha çox tanınmış yazıçıların seçilməsi meyarı üstün tutulur. Belə seçimin edilməsinə səbəb məşhur müəlliflərin əsərlərində millətin tarixi təcrübəsinin cəmləşməsinin baş verməsinin və onun mənəvi mahiyyətinin daha geniş ifadə edilməsinin əks olunmasıdır.

Şifahi nitq dərslərində şifahi nitq bacarıqlarını inkişaf etdirmək üçün mətnlərin keyfiyyətinə olan linqvodidaktik tələbləri artırmaq zəru-

ridir. Öyrədici mətnlər təkcə dil quruluşu nümunələrini əks etdirməməli, həm də informativ, maraqlı və emosional xüsusiyyətləri özündə birləşdirməlidir. Bu halda bədii mətn nitq fəaliyyətini tədrisinin ən ali vahidi kimi çıxış etməlidir, ünsiyyətin konkret situasiya və formalarında olan kommunikativ məsələləri dil vasitələri ilə həll etməyə kömək etməlidir.

Beləliklə, xarici dilin tədrisində mətnlərin seçimi müxtəlif meyarlar əsasında və müxtəlif məqsədlərə əsasən həyata keçirilə bilər. Bu baxımdan, müəllimlərdən hansı mətnlərdən istifadə etdiklərini soruşmazdan əvvəl, onların ümumiyyətlə ədəbiyyatla necə əlaqəli olduğunu başa düşmək çox vacibdir – davamlı əhəmiyyətə malik əsərlər və ya müəyyən funksional xüsusiyyətlərə malik mətnlər, bu və ya digər dərəcədə müəllim və tələbələrin ehtiyaclarına uyğundur.

Mühüm seçim meyarları mətnin leksik mürəkkəbliyinin tələbələrin dil hazırlığı səviyyəsinə uyğunluğu, həmçinin bu mətnə münasibətdə mətn, mühit və oxucu arasında effektiv qarşılıqlı əlaqəni təmin etmək bacarığıdır. D. Collie və S. Slater hesab edir ki, müəllimlər mətnin həm mədəni əhəmiyyətini, həm də onun tələbələri maraqlandırmaq qabiliyyətini nəzərə almalıdırlar [7, s.2 ]. Onlar mətnin məzmunun tələbələr üçün xüsusi əhəmiyyətini vurğulayırlar. A. Maley həmçinin mətnlərin seçilməsində ilk növbədə tələbələrin maraqlarına əsaslanmasını qətiyyətlə tövsiyə edir [9].

Mətnlərin dövrlərinə gəlincə, N. Zaqryadskaya [14,s.22] XX və XXI əsrlərin mətnlərindən olsa da, müxtəlif dövrlərə aid əsərlərdən istifadə etməyi mümkün hesab edir. onun fikrincə, ingilis dilinin tədrisində ən effektivdir, çünki onlar, xronoloji olaraq dövrümüzə daha yaxın olan tələbələrin daha çox marağını oyatmaq və təsvir olunan hadisələrə münasibət bildirərək onları müzakirələrdə iştirak etməyə təşviq etmək baxımından faydalıdır.

Beləliklə, mətnləri seçərkən, onların bir çox xüsusiyyətlərini nəzərə almaq lazımdır – seçim etməyin çox vaxt çətin olması təəccüblü deyil. İ. Morozova hesab edir ki, Rusiyada müəllimlər ingilis dilini öyrənmək üçün mətn seçərkən ciddi problemlərlə üzləşirlər, çünki onların şəxsi üstünlükləri tələbələrinin ədəbi zövqündən çox fərqlidir [10, s.317-327]. O, mətnləri metodla seçməyi tövsiyə edir, və həmkarlar ilə daha tez-tez məsləhətləşməyi, beləliklə, onun fikrincə, müəllim tələbələrin imkan və maraqlarını maksimum dərəcədə nəzərə almaqla yanaşı, linqvistik və mədəni məzmuna uyğunluğa nail ola bilməyin mümkünlüyünü qeyd edir.

İngilis dili dərslərində bədii mətnlərdən istifadə mədəniyyətşünaslıqla bağlı material kimi istifadə edilə bilər. Bu cür materiallar tarixi hadisələr, milli mədəniyyət, müxtəlif millətlərin adət-ənənələri, nitqin "saflığı" və mədəniliyi ilə bağlı olur. Şifahi nitq dərslərində istifadə edilən bədii mətnlər gerçəkliklə bağlı realiləri özündə birləşdirə və izah edə bilir, ictimai həyatın çalarlarını aşkarlayır, nitq və etiket formaları üçün motivasiya edə bilir, milli psixologiyanı üzə çıxartmağa kömək edə bilir. Şifahi nitq dərslərində bədii mətnlərdən istifadənin məqsədi dil öyrəncilərinə dili mədəniyyətin bir elementi kimi öyrətməyi qarşısına məqsəd qoyur ki, bu da nəsillərdən qalan təcrübəni öyrənmək deməkdir.

Ünsiyyətin mövzusundan asılı olan açar sözləri xarakterizə edən təsviri-ifadəli dil vasitələrinin nəzərə alınması prinsipi.

Bədii ədəbiyyat üçün səciyyəvi olan bədii və ya estetik funksiya

səbəb-nəticə əlaqələrini aşkar edir, nəticələr çıxarır, dərin ümumiləşmələr aparmağı öyrənir.

Fəal təlimin psixoloji mexanizmləri aşağıdakılardır:

**1- Problemli situasiyanın yaradılması.**

Qeyd edək ki, şəxsiyyətə istiqamətlənən təlim prinsipinə müvafiq olaraq təlim prosesi həm şagirdlərin idrak maraqlarına, həm də tədqiqatçılıq mövqeyinə əsaslanarsa daha çox səmərə verir. Onu da qeyd edək ki, bu mövqeyi yaratmaq üçün tədqiqat təlim prosesinin mərkəzində dayanmalıdır. Hər bir tədqiqat problemin necə qoyulmasından başlanır. Fəal təlim metodu isə təqdim olunan informasiyanın yarımçıq və ya ziddiyyətli olması üzündən əqli cəhətdən problemli vəziyyətin yaradılmasına əsaslanan metoddur. Problemli vəziyyətin yaradılması məktəbliləri qarşıya qoyulan məqsədə çatmaq üçün əlverişli yollar və vasitələr axtarmağa sövq edir. Bu zaman şagirdlərin təfəkkürü formalaşır. Bu da onlarda tədqiqat fəaliyyətini artırır və idrak fəallığı yaradır.

Problem-situasiya- istənilən məsələnin həll edilməsində ziddiyyətlərin və variantların mövcudluğunu özündə ehtiva edir. Yəni, problem qoyulur, şagirdlərin təfəkkürü formalaşır, idrak fəallığı yüksəlir.

**2- Əməkdaşlığın və dialoqun zəruriliyi.**

Qoyulmuş problemin həll edilməsi zərurəti müxtəlif baxışların və fərziyyələrin nəzərdən keçirilməsini və ən əlverişli metodlara istinad etməsini tələb edir. Bu isə təlim prosesində iştirak edən digər şagirdlərlə fəal əməkdaşlıq şəraitində səmərəli şəkildə əldə edilə bilər. Ona görə də təlim metodunu ifadə etmək üçün ya “problemli”, yaxud ”problemli-dialoji” təlim anlayışlarından istifadə edilir.

**3- Tədqiqatçı-şagird, fasilitator-müəllim.**

Şagirdlərin idrak fəaliyyətinin fəallaşdırılmasının ən vacib mexanizmlərindən biri də ənənəvi təlim metodunun dəyişdirilməsidir, yəni təlimə tədqiqat xarakteri verilməklə, şagirdlərin elmi biliklərin mənimsənilməsi prosesinin əsas iştirakçısına, bərabərhüquqlu subyektə çevrilməsidir. Bu da şagirdlərin və müəllimlərin təlim prosesində öz mövqelərinin və funksiyalarının dəyişməsi hesabına əldə edilə bilər. Bu prosesdə şagird “kəşf edən”, ”tədqiqatçı” mövqeyində dayanır. Gücü çatan problemlərlə rastlaşarkən bu problemləri şagird müstəqil şəkildə tədqiqat prosesi zamanı həll edir. Bu prosesdə təlimin məqsədlərinin mühüm şərti kimi aşağıdakı suallar ortaya çıxır:

- nəyi dərk etmək və nə üçün dərk etmək;
- nəyi öyrənmək və nə üçün öyrənmək;
- sonda hansı nəticələr əldə edilə bilər (yəni təlim hansı səmərəni verə bilər).

Yuxarıda qeyd etdiyimiz kimi, müəllim bu prosesdə fasilitator (bələdçi), “aparıcı” (istiqamətverici) mövqeyində dayanır. Yəni bu yolda şagirdlərə məsələni həll etmək üçün əlverişli şərait yaradır. O, şagirdlərlə məqsədyönlü, sistemli və ardıcıl şəkildə əməkdaşlıq edir:

- təlim prosesində problemli situasiya yaradır;
- tədqiqatın məqsədinin qoyuluşunda şagirdləri istiqamətləndirir;
- problemin həllinə metodiki köməklik göstərir;
- elmi biliklərin əldə edilməsində və şagirdlər tərəfindən

mənimsənilməsində yol göstərir. Müəllimin (fasilitatorun) əsas vəzifəsi şagirdlərə öyrənməyi öyrətməkdir.

Fasilitasiya bu prosesdə yönəldici və köməkçi sualların tətbiqi nəticəsində şagirdlər arasında diskussiyaların təşkilini və onların fəallaşmasını təmin edir.

Fasilitasiya yeni biliklərin müəllimlər tərəfindən deyil, şagirdlər tərəfindən aşkara çıxarılmasına şərait yaradır. Fasilitatorun əsas funksiyası şagirdlərin düşüncəsini inkişaf etdir-mək və onu lazım olan istiqamətə yönəltməkdir.

**4- Şagirdlərə psixoloji dəstək-hörmət, etibar.**

Müəllim şagirdin idraki mövqeyinin yüksək səviyyədə tutulması üçün onlara hörmətlə, mərhəmətlə yanaşmalı, sinifdə müsbət psixoloji mühit yaratmalı, hər şagirdə fərdi yanaşmalıdır.

Şagirdlərə humanist yanaşma, xeyirxah münasibət, onların hər birini olduqları kimi qəbul etmək, inanmaq, daima dəstəkləmək, qabiliyyət və bacarıqlarına inandığını söyləmək onların özünəinamını möhkəmləndirə bilər. Belə olduğu təqdirdə qarşıya qoyulmuş problemin həll edilməsində müəllim şagirdin hər bir cəhdini yaradıcı cəhd kimi qiymətləndirməli və onların fikirlərinə hörmətlə yanaşmalıdır. Təlim prosesində müəllim tərəfindən müsbət psixoloji mühitin bu cür dəyişdirilməsi şagirdlərdə inamsızlığı, uğursuzluq qorxusunu aradan qaldırar və bütün dərs boyu onların idrak fəallığını yüksək səviyyədə saxlayar.

Hər bir şagirdə məhəbbətlə yanaşmaq, etibar etmək, verdikləri pis və ya yaxşı cavabları qiymətləndirməkdən imtina onlarda özünə inam, müəlliminə isə hörmət hissini aşılayır.

**Fəal təlimim strukturu.**

**Birinci mərhələ motivasiya və problemin qoyuluşu mərhələsidir.** Bildiyimiz kimi tədqiqata problemi müəyyənləşdirməklə başlanılır. Hər bir halda problem çoxsaylı ehtimallar, fərziyyələr doğurur və onları yoxlamaq məqsədi ilə tədqiqatın sualı müəyyənləşdirilməlidir. Hər bir tədqiqat sualı yeni biliklərin "kəşfinə" aparan bələdçi rolunu oynayır. Məhz problemin olması şagirdlərin idraki fəallığının yaranmasının birinci addımıdır.

Nə üçün dərsin bu mərhələsi məhz motivasiya adlandırılır? Motivasiya istənilən fəaliyyətin mexanizmini işlədən əsas qüvvədir. Qoyulmuş problem və onun həlli fəal təlimdə şagirdlərin təfəkkür fəaliyyətini formalaşdırır və onların idraki fəallığını artırır. Prosesin müvəffəqiyyətinin əsası sərbəst düşünmək və müstəqil olmaqdır. Belə ki, problemin həllində "mənim fikrimcə", "mən belə hesab edirəm ki", "mənə elə gəlir ki" ifadələrindən istifadə edir.

**İkinci mərhələ tədqiqatın aparılmasıdır.** Bu mərhələdə qoyulmuş problemin həllində irəli sürülən ehtimalları təsdiq və yaxud təkzib edən, qoyulmuş tədqiqat sualına cavab verəcək faktları tapmaq zərurəti meydana çıxır. Bu prosesdə şagirdlərə irəli sürülən problemin həllinə apa-ran, özündə yeni informasiyaları və sualları daşıyan müxtəlif tipli tapşırıqlar kömək edir. Bu zaman yeni-yeni faktların öyrənilməsi və bu suallara cavabların tapılması zamanı düşünərək yeni elmi bilikləri "kəşf etmək" üçün münbit şərait yaranır.

Tədqiqat cürbəcür formalarda aparıla bilər: sinfin bütün kollektivi ilə, kiçik qruplarla, cütlüklərlə və yaxud fərdi şəkildə. İnteraktiv təlimin əsas xarakteri kiçik qruplarla, yaxud

cütlüklərlə aparılan işlərdə daha qabarıq şəkildə özünü göstərir.

**Üçüncü mərhələ informasiya mübadiləsi** adlanır. Şagirdlər bu mərhələdə əldə etdikləri yeni informasiyalar haqqında fikir mübadiləsi aparırlar və bir-birinin təqdimatını dinləyirlər. Bu zaman yeni bir tələbat meydana çıxır ki, bu da həmin bilikləri sistemləşdirmək, qaydaya salmaq və müəyyən nəticəyə gəlmək məqsədi ilə tədqiqat sualına cavab tapmaqdan ibarətdir.

**Dördüncü mərhələ informasiyanın müzakirəsi və təşkili** mərhələsidir. Bu mərhələ interaktiv təlimin ən mürəkkəb mərhələsidir və biliklərin, bacarıq və vərdişlərin, təfəkkürün yaradıcı, məntiqi, tənqidi növlərinin səfərbər edilməsini tələb edir. Müəllimin köməkçi, yönəldici suallarından istifadə etməklə əldə olunan faktların müzakirə edilməsinə və təşkilinə köməklik göstərir. İnformasiyaların təşkili faktlar arasında mövcud əlaqələrin üzə çıxarılmasına və sistemləşdirilməsinə istiqamətləndirilir. Son nəticədə tədqiqat sualının cavabı yavaş-yavaş seçilməyə başlayır.

**Beşinci mərhələ nəticə və ümumiləşdirmədir.** Bu mərhələdə yeni biliklərin "kəşfi" yolunda şagirdlərə son addımı atmaq qalır ki, bu da konkret nəticəyə gəlmək və ümumiləşdirmələr aparmaqdan ibarətdir. Şagirdlər bu zaman həm əldə etdikləri bilikləri ümumiləşdirməli, gəldikləri nəticəni həm tədqiqat sualı, həm də irəli sürülən fərziyyələrlə müstəqil şəkildə tutuşdurmalıdır. Bu mərhələ şagirdlər üçün mühüm mərhələdir, ona görə ki, bilikləri özləri "kəşf" etdikləri üçün hədsiz sevinc hissi yaşayırlar.

**Altıncı mərhələ yaradıcı tətbiqetmə** adlanır ki, bu da elmi biliklərin yaradıcı şəkildə tətbiqidir. Bu mərhələdə yaradıcı tətbiqetmə bilikləri möhkəmləndirir və praktiki əhəmiyyətini şagirdə göstərir. Müəllim şagirdlərə hansısa suallara cavab tapmaq məqsədi ilə qazandıqları bilikləri tətbiq etməyi tövsiyə edir. Tətbiqetməni dərhal həyata keçirmək mümkün deyilsə, biliklərin mənimsənilməsini axıra qədər getmək tələb olunarsa, demək ki, bu yolu sonacan getmək lazım gələcək. Lakin sonda uşaqlara "kəşf" etdikləri elmi biliklərin tətbiq edilməsi üçün tətbiqetməyə aid yeni tapşırıqlar verilsin. Belə olduqda bu biliklər şagirdlərin şüurunda həmişəlik qalacaqdır. Fəal təlimin bu mərhələsinin sona çatması bir dərsdə başa çatmaya da bilər, onun başa çatdırılması sonrakı dərslərdə də mümkün ola bilər. Yeddinci, sonuncu mərhələ qiymətləndirmə və refleksiya mərhələsidir. İstənilən bir prosesin təkmilləşdirilməsini qiymətləndirmə mexanizmi təmin edir. Şagirdlərin yol verdikləri qüsurlara, müvəffəqiyyətlərə və qazandıqları uğurlara nəyin mane olacağını, nəyin kömək etdiyini müəyyən etmək çox vacibdir. Fəal təlimin ən mühüm xüsusiyyəti şagirdlərə müstəqil təlim və müstəqil özünüinkişaf vərdişlərinə yiyələnmələrinə əlverişli şərait yaratmaqdan ibarətdir. Refleksiya nədir? Başa çatan proseslərin şüurda inikası deməkdir. Eyni zamanda refleksiya elmi biliklərin şagirdlər tərəfindən mənimsənilməsinin bütün mərhələlərini təhlil edərək onu başa düşməyə imkan yaradan mexanizmdir. Şagirdlərə refleksiyanı həyata keçirmək məqsədi ilə təlim fəaliyyətinin alqoritmini izləməyə yönəldilmiş sualların verilməsi kifayətdir. (Məsələn: biz nə işlə məşğul olduq? Bizim məqsədimiz nə idi? Biz son nəticəyə necə gəldik? Qarşınıza qoyduğunuz problemi həll etməkdə sizə nə köməklik göstərdi? və. s.). Sonda şagirdlər apardıqları tədqiqatın əsas mərhələlərini, kom-

ponentlərini, müvəffəqiyyət qazanmağa yardımçı olan amilləri dərk edirlər.

Bəzi hallarda qiymətləndirmə və refleksiyanı dərsin digər mərhələlərinə daxil edirlər ki, bu da dərsin uğurlu təşkilinə kömək edir. Şagirdlərin fəaliyyətinin səmərəlilik dərəcəsi müxtəlif formalarda, müxtəlif üsullarla həm keyfiyyət, həm də kəmiyyətcə qiymətləndirilir. Müəllim bu prosesdə unutmamalıdır ki, qiymətləndirmə şagirdlər üçün özünənəzarət və özünüqiymətləndirmə vasitəsi rolunu oynayır. Sonda onu qeyd edək ki, şagirdlər öz arzusu, öz fəaliyyətinə güvənərək yeni biliklər əldə etməyə nail olarsa o, dərsə həvəslə, maraqla və yaradıcı yanaşar, əldə etdikləri elmi bilikləri daha dərindən mənimsəyər.

**Problemin aktuallığı.** Təlim prosesinin daha maraqlı və dinamik təşkil edilməsi üçün fəal təlimin mərhələlərinin tətbiqi vacibdir. Odur ki, şagirdlərin axtarıcılıq, tədqiqatçılıq bacarıqlarını üzə çıxarmaq üçün təlimin mərhələlərlə həyata keçirilməsi hal-hazırda çox aktualdır və hər bir fənn müəllimi bu mərhələlərlə öz dərsini qurmalıdır.

**Problemin elmi yeniliyi.** Müasir təlim prosesinə yeni konsepsiyalar tətbiq edilməkdədir. Təlimin keyfiyyətlərinin yüksəldilməsi şagirdlərin təlimə münasibətinin daha maraqlı olması üçün dərsin hansı mərhələlərlə keçirilməsi və şagirdlərin idrak fəallığının yüksəldilməsində əldə ediləcək nailiyyətlər haqda ətraflı məlumat verilmişdir.

**Problemin praktik əhəmiyyəti**. Bu məqalə ümumtəhsil məktəblərində yüksək nailiyyətlər əldə etmək üçün təlim prosesinin mərhələlərlə aparılmasına təşəbbüs göstərən fənn müəlliminin dərsi yüksək səviyyədə qurmasına şərait yaradacaqdır.

**Ədəbiyyat:**


1. Azərbaycan Respublikasının təhsil sahəsində İslahat Proqramı. Azərbaycanın təhsil siyasəti (1998-2004-cü illər). I kitab. -Bakı: Çaşıoğlu, -2005.
2. İsmixanov M, Bəxtiyarova R. Məktəbin idarə edilməsi: Dərs vəsaiti / M. İsmixanov, R. Bəxtiyarova. -Bakı, 2012. -s. 235.
3. Mehrabov A.O. Təhsildə səriştəli yanaşma: mahiyyəti və əsas xüsusiyyətləri. Azərbaycan məktəbi. -Bakı, 2007, №1, -s.3-10



**E-mail:** a.ismayilxanova @gmail.com


**Redaksiyaya daxil olub:** 15.04.2024

UOT 159.9

***Gülnarə Həmzəbəyovna Əlixanova***
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin baş müəllimi,*
*psixologiya üzrə fəlsəfə doktoru*
***Orcid**: https://orcid.org/0000-0002-5241-0250*

## VALİDEYNLƏRİNDƏN PSİXOLOJİ ASILILIĞI OLAN YENİYETMƏLƏRƏ MƏXSUS "MƏN – OBRAZ"IN XÜSUSİYYƏTLƏRİ

***Гюльнара Гамзабековна Алиханова***
*старший преподаватель*
*Азербайджанского Государственного Педагогического Университета,*
*доктор философии по психологии*

## ОСОБЕННОСТИ "ОБРАЗА Я" СВОЙСТВЕННЫХ ПОДРОСТКАМ ПСИХОЛОГИЧЕСКИ ЗАВИСИМЫХ ОТ СВОИХ РОДИТЕЛЕЙ

***Gulnara Kamzabekuly Alikhanova***
*senior lecturer of*
*Azerbaijan State Pedagogical University,*
*doctor of philosophy in psychology*

## "I – IMAGE" CHARACTERISTICS OF ADOLESCENTS WHO ARE PSYCHOLOGICALLY DEPENDENT ON THEIR PARENTS

**Xülasə.** Valideyn – uşaq münasibətlərində psixoloji asılılığın tədqiqi hazırda çox aktual mövzudur. Şəxsiyyətlərarası münasibətlər psixoloji asılılıq isə emosional yaxınlıq prosesində vacib şəxs tərəfindən dəstək və müdafiə prosesində müstəqil davranış qabiliyyətinin azalmasını ifadə edir. Bu problemin ayrılmaz xüsusiyyətləri kimi özünə inamsızlıq, çarəsizlik, müdafiə və dəstəklənmə, özünü təminetməyə və emosional yaxınlığa ehtiyac, sevgi və qəbuletmə, mümkün imtinaetmə və tənhalıqla bağlı narahatlıq hissi və sairə qeyd olunur. Valideyn - övlad münasibətlərində psixoloji asılılığın həddindən artıq özünü göstərməsi müvafiq problemlərin təzahürünü ifadə edir. Bu da özünüdərketmənin və şəxsiyyətin inkişaf xüsusiyyətlərində özünü göstərən təhrif edilmiş şəxsi inkişafın göstəricisi onun "mən - obraz" məhsulu kimi çıxış edə bilər.
***Açar sözlər:*** *özünüdərk, özünüqiymətləndirmə, şəxsiyyət, psixoloji asılılıq, neqativizm, yeniyetməlik dövrü*

**Резюме.** В настоящее время актуальной темой является исследование психологической зависимости в детско-родительских отношениях. Межличностные отношения и психологическая зависимость означают снижение способности вести себя самостоятельно в процессе поддержки и защиты со стороны важного человека в процессе эмоциональной близости. К неотъемлемым чертам этой проблемы относятся неуверенность в себе, беспомощность, защита и поддержка, потребность в самодостаточности и эмоциональной близости, любви и принятии, тревога по поводу возможного отвержения и одиночества и т.д. Чрезмерное проявление психологической зависимости в детско-родительских отношениях свидетельствует о проявлении соответствующих проблем. Это показатель искаженного развития личности, который проявляется в

самосознании и особенностях развития личности и может выступать продуктом его «Я- образа».
***Ключевые слова:*** *самопознание, самооценивание, личность, психологическая зависимость, негативизм, подростковый период*

**Summary.** The study of psychological dependence in parent-child relationships is currently a very relevant topic. Interpersonal relations and psychological dependence mean a decrease in the ability to behave independently in the process of support and protection by an important person in the process of emotional closeness. Inherent features of this problem include self-doubt, helplessness, protection and support, need for self-sufficiency and emotional closeness, love and acceptance, anxiety about possible rejection and loneliness, etc. The excessive manifestation of psychological dependence in parent-child relationships indicates the manifestation of relevant problems. This is an indicator of distorted personal development that manifests itself in self-awareness and personality development characteristics, and can act as a product of his "ı-image".
***Key words:*** *self-awareness, self-esteem, personality, psychological dependence, negativism, adolescence*

Bu gün müasir cəmiyyət şəxsiyyətin hərtərəfli inkişafı üçün müstəqil şəxsi həyat məqsədləri müəyyənləşdirmək bacarığı və müstəqillik kimi yeni vacib tələbləri qarşıya qoyur. Psixoloqların "müstəqilliyə meylin formalaşması dövrü" adlandırdıqları yeniyetməlik yaşına xüsusi qayğı yetirilir. Bu dövrdə fərdi inkişaf iki fərqli istiqamət meylliliyi ilə fərqlənir. Bu bir tərəfdən yeniyetmənin mövcud yaşla əlaqədar ontogenetik inkişaf vəzifələri ilə şərtlənən müstəqil olmaq arzusudur. Digəri isə, yeniyetmə şəxsiyyətinin hərtərəfli inkişafı üçün yaradılan obyektiv şəraitin mövcudluğunda özünü təzahürüdür. Bu dövrdə yeniyetmə valideynləri ilə birgə yaşamağa davam edir. O, bir çox cəhətdən valideynlərindən iqtisadi asılı vəziyyətdə olur. Bu cür vəziyyət yeniyetmələrin valideynlərindən asılılığını kifayət qədər tənzimləməklə onlarda təhlükəsizlik, müdafiə və güvən hissinə öz təsirini göstərir. Yeniyetmənin valideynlərindən asılılığı təbii və normativ xarakter daşıdığı zaman fərdi meyllərinin üstünlüyü sabit şəxsi formalaşmaya keçir. Bu da yeniyetmə şəxsiyyətinin inkişafına birbaşa öz mənfi təsirini göstərir.

Bu sahədə tədqiqat aparan alimlərdən O.P. Makuşina, E.O. Smirnova, M.İ. Lisina və R. Searsın daha səmərəli və dəyərli nəzəri fikirləri vardır. O.P. Makuşinanın bir çox dəyərli və məhsuldar fikirlərinin nəzəri və praktiki elmi dəyəri xüsusilə qeyd edilir. E.O. Smirnova bağlılıq problemini ətraflı şərh edir. M.İ. Lisinanın "ünsiyyətin genezisi konsepsiyası"nda uşağın yaxın bildiyi, tanıdığı və tanımadığı yaşlı insanlara fərqli münasibətinin formalaşması prosesi, uşağın "mən"i və erkən uşaqlıqda anasına bağlılığın psixoloji xüsusiyyətləri təhlil edilir. Tədqiqat prosesində körpəlik yaş dövründə ana ilə birbaşa affektiv əlaqələrin yaranması və inkişafı problemləri də hərtərəfli öyrənilmişdir (4, s.78).

Psixoloji ədəbiyyatda O.P. Makuşinanın "yeniyetməlik dövründə psixoloji asılılıq" mövzusuna konkret olaraq həsr olunmuş əsərləri də vardır. Tədqiqatın əsas məqsədini psixoloji cəhətdən öz valideynlərindən asılı olan yeniyetmələrin "mən – obrazı"nın psixoloji xüsusiyyətlərini öyrənmək problemi təşkil etmişdir. Psixoloji ədəbiyyatda "psixoloji asılılıq

fenomeni" probleminin mürəkkəbliyi fərdi komponentlərinin düzgün müəyyənləşdirilməsində öz təsdiqini tapır:

1) koqnitiv komponent (başqalarını güclü və nüfuzlu şəxs kimi qəbul etməklə özünü zəif, gücsüz və bacarıqsız insan kimi təsəvvür etmək);

2) motivasiya komponenti (başqalarının dəstəyi və rəhbərliyinə ehtiyacın olduğunu ifadə etmək);

3) emosional komponent (müstəqil davranış tələb edən vəziyyətlərdə xarici narahatlıq və ya qorxu hissinə meyllilik);

4) davranış komponenti (başqaları ilə qarşılıqlı münasibətlərdə təslim olmaq meyli ilə təsdiq və kömək axtarmaq) (6, s.13-17).

Yeniyetmənin valideynlərindən psixoloji asılılığı iki formada təzahür edir:

1.Faktiki asılılıq formasında; 2. Neqativizm formasında.

"Asılılığın neqativ təzahürü" problemi ilk dəfə R. Sears tərəfindən müəyyən edilmişdir. Onun tədqiqatlarında "mənfi diqqət axtarışı" problemi təsvir edilir. R. Sears "mənfi diqqət axtarışı" problemini fərdin bütün davranışlarının başqalarının ondan gözlədiklərinin "əksinə hərəkət etmək istəyi ilə diktə olunan üsyan" kimi ifadə edir. Onun fikrincə, bu neqativ davranış yeniyetmənin daxili müstəqilliyə olan ehtiyacını ödəyir. Davranış konfliktli hərəkətlərə səbəb ola bilən emosional əlaqə və təcrübəsizlik acısının təzahürü və sübutu kimi qəbul edilir.

Belə bir vəziyyətdə subyekt seçimi eynilə asılılığın özünün təzahürləri vəziyyətindəki kimi, digər insanların düşüncələri və tələbləri əsasında müəyyənləşdirilir. Valideynlərindən neqativ asılı olan yeniyetmə artıq öz istəklərini deyil, onun üçün əhəmiyyətli sayılan şəxslərin "əks – istəklərini" əlində əsas tutaraq müxtəlif hərəkətlər nümayiş etdirir. Bu dövrdə yeniyetmənin ən əsas məqsədini valideyn himayəsindən qaçmaq meyli və fikri təşkil edir. Məqsəd yeniyetmə şəxsiyyətinin emansipasiya (asılılıqdan azad olunma) reaksiyası ilə əlaqədar onun fərdiləşdirilməsi yolu ilə əldə edilir. Emansipasiya reaksiyasının əsasını yeniyetmə şagirdlərin onlara daha yaxın olan yaşlıların - qohumların, müəllimlərin, tərbiyəçilərin, mentorların və bütövlükdə yaşlı nəslin qəyyumluğu, nəzarəti və himayəsindən çıxaraq azad olmaq istəyi təşkil edir. Deməli, emansipasiya reaksiyasının arxasında fərdin özünəməxsus müstəqillik arzusu dayanır. Yeniyetmələrə məxsus emansipasiyanın üç növü qeyd edilir:

1. Emosional emansipasiya;
2. Davranış emansipasiya;
3. Normativ emansipasiya (2, s. 40-44).

Yeniyetmələrin inkişafının obyektiv şərtləri ilə əlaqəli olaraq onların davranış və normativ – özünüidarə (muxtariyyət) arzusu nisbi halda olur. Bununla belə, bu istəyin təzahürlərinə əsaslanaraq, yaşla bağlı olan vəzifələrin yerinə yetirilməsinə nəzarət etmək vacibdir. Onlar həll edilmədikdə isə psixoloji asılılığın formalaşması prosesi öyrənilir. Özünüdərketmənin formalaşması yeniyetməlik dövrünün əsas nəticəsi hesab edilir. Bu gün özünüdərk, nəticəsi "mən - obraz" olan dəyərli bir proses kimi başa düşülür. "Mən - obraz" ın təhlili onda seçilən iki cəhəti ayırd etməyə imkan verir:

- özü haqqında bilik (idrak komponenti kimi);

- özünə münasibət (affektiv komponent kimi).

Affektiv komponentə fərdin özünə münasibəti və özünüqiymətləndirmə prosesləri daxildir. Özünüqiymətləndirmənin əsas

parametrləri onun səviyyə, sabitlik və fərqləndirmə dərəcəsi hesab edilir. “Mən - obraz”ın mərkəzi komponentləri aşağıdakılar hesab olunur:

1) Subyekti digər insanlarla birləşdirən ümumi oxşar xüsusiyyətlər və bu xüsusiyyətlər haqqında əldə olunan bilik ("mən – konsepsiyanın" birləşdirici forması və ya özünü identifikasiya sistemi);

2) Subyektin “mən”ini digər insanlarla müqayisədə fərqləndirən bilik (“mən konsepsiya”nın fərqləndirici komponenti).

Subyektin “mən”ini digər insanlarla müqayisədə fərqləndirən bilik formativ subyektə özünəməxsusluq və orijinallıq hissini bəxş edir. Eyni zamanda, “mən - obraz”ın bu cür xüsusiyyətləri idrak mürəkkəbliyi, özünü dərketmə, sabitlik, şüur və öz subyektivliyini qəbul etmə vəziyyəti kimi müəyyən edilir (3, s.90- 94).

Yeniyetmələrin “mən obrazı”nin koqnitiv və emosional komponentinin öyrənilməsində “Avtoportret”, “İnşa” metodlarından istifadə edilir. T. Dembonun, S.Y. Rubinşteynin metodologiyası vasitəsilə “mən - obraz”ın özünüqiymətləndirmə kimi aspekti, həmçinin onun strukturunda valideyn və yeniyetmənin özünüqiymətləndirmələri arasındakı fərq və əlaqə aşkar edilir. Yeniyetmələrin valideynlərindən psixoloji asılılığının diaqnostik nəticələrinin öyrənilməsində “Yeniyetmələrin valideynlərdən psixoloji asılılığının diaqnostikası” metodundan istifadə olunur. Həyata keçirilən empirik tədqiqat çərçivəsində müvafiq metodlardan istifadə etməklə psixoloji cəhətdən valideynlərindən asılı olan yeniyetmələrin “mən - obraz”ının aşağıdakı xüsusiyyətləri müəyyən edilir:

- Mənfi cəhətdən asılı olan yeniyetmələrlə ümumi heysiyyətinın faktiki asılı olduğu yeniyetmələrin özünüqiymətləndirməsi arasındakı fərq;

- Neqativ davranışlı yeniyetmələr arasında özünü dərketmə səviyyəsinin tam asılı və müstəqil olanlarla müqayisə fərqinin mümkün səbəblərinin müəyyənləşdirilməsi (1, s. 30-36);

- Neqativ davranışlı yeniyetmələrin davranışı valideynlərdən asılılığı olan və ya müstəqil yeniyetmələrə nisbətən daha aşağı qiymətləndirilir. Neqativ davranış şəklində olsa da, valideynlərindən asılılığı olan yeniyetmə bu qiymətləndirməni introyeksiya etməyə səy göstərir. Eyni zamanda təxmin edilir ki, mənfi davranışlı yeniyetmə özünün asılılıq mövqeyini qəbul etmir, ondan uzaqlaşmağa çalışır. Həqiqətən asılı olanlar qrupuna aid olan yeniyetmələrin 47%-də özünəinam fərqlənmir, yəni onlarda ibtidai məktəb yaşına xas olan özünə münasibət tərzi hələ də nisbətən üstünlük təşkil etməkdədir.

Tədqiqatın nəticələrinə görə neqativ asılılığı olan yeniyetmələr arasında 72% real və ideal özünüqiymətləndirmə arasında əhəmiyyətli fərq nəzərə çarpır. Neqativ davranışlı yeniyetmələrin arasında özünü qəbul etmə səviyyəsi də əslində valideynlərindən asılılığı olan və müstəqil olanlarla müqayisədə bir qədər aşağıdır. Güman edilir ki, neqativ davranışlı bir yeniyetmə öz asılı mövqeyini qəbul etmir, ondan uzaqlaşmağa çalışır. Tədqiqatın nəticələrinə görə, həqiqətən asılı olanların alt qrupundakı yeniyetmələrin yalnız 18%-i və neqativ davranışlı yeniyetmələrin 22%-i özlərinin və valideynlərinin onlar haqqında qiymətləndirmələrini fərqləndirə bilirlər. Bu məlumatlar psixoloji olaraq valideynlərindən asılılığı olan yeniyetmələrin özlərini müstəqil qiymətləndirmədikləri, lakin valideyn qiymətləndirmələrini introspekt

etdikləri fərziyyəni sübut edir. Yeniyetmələrin “real - mən”i ilə “valideyn ideal məni” arasında fərq qoyan yeniyetmələrin ən az sayı (42%) faktiki asılılığı olanların alt qrupunda aşkar edilmişdir. Ehtimal olunmuşdur ki, belə yeniyetmələrin özləri şəxsi haqqında şəxsi təsəvvürləri yoxdur, onlar öz valideynlərinin təsəvvürlərinə uyğun olmağa çalışırlar. “Real mən” və “valideyn ideal məni” arasında fərq qoyan yeniyetmələrin sayı (72%) neqativ davranışlı yeniyetmələrin alt qrupunda mövcud olmuşdur. Yeniyetmənin reallıqda özü haqqında təsəvvürləri ilə valideynlərinin ideal ideyalarının üst-üstə düşməməsi isə təsdiq edir ki, neqativdən asılı olan yeniyetmələr valideynlərinin istəklərinə zidd davranmağa və baxmağa meyl göstərmişlər (5).

Valideynlərindən psixoloji cəhətdən asılı olan yeniyetmələrin daxili obrazları müxtəlifdir və digərlərindən çox az fərqlənir. Yeniyetmələrin “mən”in müqayisəli fərqləndirici komponentinə görə psixoloji cəhətdən valideynlərindən asılılığı olan yeniyetmələrin fikirlərində onları bütün insanlardan fərqləndirən biliklər də azdır. Psixoloji cəhətdən müstəqil yeniyetmələr arasında “mən - obraz”ın sabitliyinin sayı hər bir fərdi alt nümunədə olduğundan daha çoxdur. Yeniyetmələrin bu cür psixoloji asılılığı onların “mən-obraz”ının digər insanların fikir və qiymətləndirmələri ilə müəyyən edildiyini bir daha göstərir (2).

Öz subyektivliyini dərk edən və qəbul edən yeniyetmələrin ən az sayı valideynlərindən psixoloji asılı olanlar (39%) arasında aşkar edilmişdir. Bu da psixoloji cəhətdən asılı olan yeniyetmələrin özlərini zəif və passiv qəbul etdiklərini bir daha təsdiqləyir. Eyni zamanda neqativdən asılı olan yeniyetmələrin subyektivlik duyğusunun keyfiyyətcə orijinallığı prosesi onun istənilən vəziyyəti dəyişdirə biləcəyinə və tam məsuliyyətə inamı olduqda baş verir.

**Problemin aktuallığı.** Valideynlərindən psixoloji asılılığı olan yeniyetmələrə məxsus “mən – obraz”ın xüsusiyyətlərinin əsas təzahürlərini müəyyənləşdirmək, müasir psixologiyanın elmi – nəzəri tələbləri səviyyəsində həmin problemlərin təhlilini verməkdən ibarətdir.

**Problemin elmi yeniliyi.** Valideynlərindən psixoloji asılılığı olan yeniyetmələrə məxsus “mən - obraz”ın xüsusiyyətlərinin psixoloji probleminin təhlili yollarını müəyyənləşdirməkdən ibarətdir.

**Problemin praktik əhəmiyyəti və tətbiqi.** Məqalədən elmi yaradıcılıq işində bu mövzu ilə maraqlananlar, eləcə də ali və orta ixtisas məktəblərinin tələbə və magistrləri, psixoloq və pedaqoqlar istifadə edə bilər.

**Ədəbiyyat:**


1. Əliyev, R.İ. Tərbiyə psixologiyası / R.İ. Əliyev. −Bakı: Nurlan, −2006. −200 s.
2. Əliyev, B.H. Pedaqoji psixologiya / B.H. Əliyev, K.R. Əliyeva, R.V. Cabbarov. −Bakı: Təhsil, −2011. −214 s.
3. Əlixanova, G.H. Məktəbəqədər yaşlı uşaqlarda “Mən obraz”ının formalaşmasında ailənin rolu. Monoqrafiya. / G.H. Əlixanova. −Bakı: ADPU, −2021. −168 s.
4. Əkbərov, N. Ailə və cəmiyyətdə əxlaq və davranış qaydaları. / N. Əkbərov − Bakı: Bərəkət, −2009, −145 s.
5. Бодалёв, А.А. Общая психодиагностика. / А.А. Бодалёв, В.В. Столин. − СПб: Изд-во «Речь», −2002. −440 с.

6. Макушина О.П. Причины психологической зависимости подростков от родителей // Вопросы психологии, −2002. № 5. -с. 67-70.

**E-mail:** gulnare.alixanova@mail.ru
**Redaksiyaya daxil olub:** 22.04.2024

*UOT 159.9*

***Kamilə Qinyaz qızı Kazımova***
*Bakı Dövlət Universitetinin Psixologiya kafedrasının baş müəllimi, psixologiya üzrə fəlsəfə doktoru*
***Orcid**: https://orcid.org/0000-0001-6360-2322*

***Qərənfil Yaşar qızı Səmədzadə***
*Bakı Dövlət Universiteti*
*https://orcid.org/0009-0009-1175-5170*

## UŞAQLIQ TRAVMALARININ ALEKSİTİMİYAYA TƏSİRİ

***Камила Гиньяз гызы Казимова***
*старший преподаватель кафедры Психологии Бакинского Государственного Университета, доктор философии по психологии*

***Гаранфил Яшар гызы Самадзаде***
*Бакинский Государственный Университет*

## ВЛИЯНИЕ ДЕТСКОЙ ТРАВМЫ НА АЛЕКСИТИМИЮ

***Kamila Ginyaz Kazimova***
*senior lecturer of the Psychology department Baku State University, doctor of philosophy in psychology*

***Garanfil Yashar Samadzade***
*Baku State University*

## ALEXITHYMY EFFECT OF CHILDHOOD TRAUMA

**Xülasə.** İstismar, laqeydlik və ya zorakılığa məruz qalma kimi təcrübələri əhatə edən uşaqlıq travması, hissləri tanıma, anlama və ifadə etməkdə çətinliklərlə xarakterizə edilən bir vəziyyət olan aleksitimiyanın inkişafı ilə sıx bağlıdır. Uşaqlıq travmalarının aleksitimiya üzərindəki təsirləri dərin və çoxşaxəlidir. Uşaqlıq dövründəki travmatik hadisələr çox vaxt emosional olaraq təzyiqə səbəb olur, insanın öz hisslərini müəyyən etmək və ifadə etmək qabiliyyətinə mane olur. Bu emosional təzyiq aleksitimik xüsusiyyətlərin ortaya çıxmasına təsir edə bilir. Uşaqlıq travmasının aleksitimiyaya təsiri şəxsiyyətlərarası münasibətlərə və ümumi psixoloji sağlamlığa təsir göstərir, yetkinlik dövründə də davam edə bilir. Uşaqlıqdakı travmatik təcrübələr emosional tənzimləmə problemlərinə, daxili münaqişələrə və özünü qoruma mexanizmlərinin inkişafına mənfi təsir göstərir.
***Açar sözlər:** uşaqlıq travmaları, aleksitimiya, istismar, laqeydlik*

**Резюме**. Детская травма, которая включает в себя такие переживания, как жестокое обращение, пренебрежение или насилие, тесно связана с развитием алекситимии — состояния, характеризующегося трудностями в распознавании, понимании и выражении чувств. Влияние детской травмы на алекситимию глубоко и многогранно. Травматические события в детстве часто вызывают эмоциональный стресс, препятствуя способности человека идентифицировать и выражать свои чувства. Это эмоциональное давление может влиять на появление алекситимических черт. Влияние детской травмы на алекситимию воздействует на межличностные отношения и общее психологическое здоровье и может сохраняться и во взрослом возрасте. Травматические переживания в детстве негативно влияют на проблемы эмоциональной регуляции, внутренние конфликты, развитие механизмов самозащиты.

***Ключевые слова:*** *детская травма, алекситимия, эксплуатация, пренебрежение*

**Summary.** Childhood trauma, which includes experiences such as abuse, neglect, or violence, is strongly associated with the development of alexithymia, a condition characterized by difficulties recognizing, understanding, and expressing feelings. The effects of childhood trauma on alexithymia are profound and multifaceted. Traumatic events in childhood often cause emotional distress, hindering a person's ability to identify and express their feelings. This emotional pressure can influence the emergence of alexithymic traits. The effects of childhood trauma on alexithymia affect interpersonal relationships and overall psychological health, and may persist into adulthood. Traumatic experiences in childhood negatively affect emotional regulation problems, internal conflicts, and the development of self-protection mechanisms.

**Key words:** childhood trauma, alexithymia, exploitation, neglect

"Travma" (τραύμα) sözü yunan dilindən "yaralanmaq" və "zərər vermək" deməkdir. Əvvəllər tibbi-cərrahiyyə elm sahələrində işlədilən bu termin, XVIII əsrdə psixiatriya və klinik psixologiyada, bir stimulun fərdin onun öhdəsindən gəlmək qabiliyyəti üzərindəki böyük təsirini göstərmək üçün istifadə edilmişdir. Çox az insanın həyatı travma ilə qarşılaşmadan keçə bilər. Adi çətinliklərdən fərqli olaraq, travmatik hadisələr qəfil və gözlənilməz olur. Bədən xəsarəti və ya ölüm kimi, həyat üçün ciddi təhlükə yaradır, insanın nəzarətindən kənarda baş verir. Ən əsası, hadisələr insanın dünyada təhlükəsizlik hissini zədələyəcək və hər an bir fəlakətin baş verə biləcəyi hissini yaradacaq qədər travmatikdir.

Psixoloji travma ağır narahatedici və insan həyatında iz buraxan kədərli hadisələr nəticəsində yaranan emosional reaksiyadır. APA (Amerika Psixoloqlar Assosiasiyası) (1994) travma anlayışını fərdin ciddi xəsarət, ölüm, ölüm təhlükəsi və sağlamlığına təhlükə yaradan hadisələrə şahid olması və ya qarşılaşması kimi müəyyən edir. İnsanda bu hadisələr nəticəsində qorxu, acizlik, dəhşət hissləri inkişaf edir [4].

Maraqlıdır ki, travma anlayışının perspektivi və tərifi zamanla dəyişmişdir. Başqa bir şərhə görə, travma; bir fərdin fiziki və ya zehni rifahına davamlı təsir göstərən hadisə və ya silsilə hadisələrin nəticəsidir. Travma nəticəsində fərdin funksionallığında, fiziki, sosial, emosional və mənəvi rifahında pozulmalar baş verir.

Psixoloji problemlərə səbəb olduğu bilinən travma bir çox fərqli şəkildə baş verə bilər. Travmatik hadisələr zəlzələ, daşqın kimi təbii fəlakətlər, həmçinin yol-nəqliyyat və iş qəzaları gözlənilməz ölümlər, ağır/ölümcül xəstəliklərə yoluxma,

işgəncələrə, zorakılığa, təcavüzə məruz qalma, müharibədə uzun müddət bombardumana məruz qalma, terrorçular tərəfindən girov saxlanılma, təcavüzə məruz qalma kimi və s. kimi insani hərəkətlərdən də yarana bilər.

Travmatik xatirələr, təbiətinə və etibarlılığına görə, əsrlər boyu psixiatriya sahəsində mübahisəli məsələ olmuşdur. Bəzi tədqiqatlar mənfi həyat təcrübələrinin neytral təcrübələrdən daha az yadda qaldığını göstərsə də, bunun əksini iddia edən tədqiqatlar da var. Brainerd, Stein, Silveira, Rohenkohl, və Reyna mənfi hadisələrin neytral hadisələrdən daha çox yanlış xatırlandığını müdafiə ediblər. Tədqiqatlarında yanlış xatırlamanın müsbət hadisələr üçün ən az, mənfi həyat hadisələri üçün ən çox olduğunu müəyyən ediblər. Onlar bu vəziyyətin emosional oyanışın yüksək olduğu travmatik həyat hadisələrində diqqətin azalması səbəbindən hafizənin əvvəlki kimi kodlaşdırmaması və saxlamaması ilə bağlı olduğunu irəli sürmüşlər. Demək olar ki, mənfi emosional stimulun xatırlanması zamanı senzura tətbiq edilir və buna görə də hadisələr yanlış xatırlanır.

Araşdırmalarda məlum olur ki, insanın yetkin yaşda travmaya məruz qalması psixiatrik problemlərə səbəb ola bilir, bu vəziyyətin uşaqlıq dövründə yaşanması isə daha böyük risk daşıyır. Uşaqlıq travmaları, 18 yaşına çatmamış şəxslərin fiziki inkişafına, psixi sağlamlığına, emosional və cinsi laqeydlik, istismar kimi mənfi bir şəkildə təsir göstərən hadisə və vəziyyətlər olaraq qəbul edilməkdədir. Uşaqlıq travmalarına (psixoloji) səbəb olan şəxslər uşağa qayğı göstərənlər və ya ətrafındakı insanlar ola bilər. Bu insanlar uşağın inkişafına mane olan, onu məhdudlaşdıran müxtəlif hərəkətlər nümayiş etdirirlər. Göstərilən bu hərəkətlər isə uşağa əqli, fiziki, sosial və cinsi cəhətdən mənfi təsir göstərir, bununla da uşağın sağlamlığı və təhlükəsizliyi üçün təhlükə yaradır.

Uşaqlıq travmaları istismar və laqeydlik olaraq iki yerə bölmək olar. Ədəbiyyatda laqeydliyin və istismarın bir çox fərqli tərifləri vardır. Uşağın psixoloji və ya fiziki inkişafına mənfi təsir göstərən münasibət və davranışlara istismar deyilir. Ümumdünya Səhiyyə Təşkilatının ən əhatəli tərifinə görə istismar, qəsdən və ya bilməyərəkdən uşağın sağlamlığına, psixoloji, fiziki və sosial inkişafına mənfi təsir göstərən davranışlar olaraq təyin olunur. Uşağa qarşı olan laqeydlik isə uşağın geyim, qidalanma, sığınacaq, sevgi, sağlamlıq və təhsil kimi əsas ehtiyaclarına etinasız yanaşılması nəticəsində onun emosional, fiziki və sosial inkişafının qarşısının alınması kimi təyin edilə bilər. Laqeydlik və istismar arasındakı fərq ondan ibarətdir ki, laqeydlik passiv, istismar isə aktiv prosesdir. Buna görə də istismar uşağa qarşı şüurlu və bilərəkdən edilən, müşahidə edilə bilən aktiv hərəkətdir. Laqeydlik isə qayğı göstərənlər tərəfindən uşağın ehtiyaclarının ödənilməməsi və uşağın lazımi səviyyədə qorunmaması nəticəsində yaranan passiv vəziyyətdir. Xüsusən də uşağın inkişafında gerilik olması, psixo-sosial uyğunlaşma problemləri yaşaması və təhsildə çatışmazlıqları aradan qaldırılması çətin olan uşaqların olması onların diqqətdən kənarda qaldığını göstərir. Uşaqların inkişafına və psixi sağlamlığına təsir göstərən laqeydlik və istismarın növləri var; fiziki istismar, cinsi istismar, emosional istismar və fiziki laqeydlik, cinsi laqeydlik, emosional laqeydlik.

Fiziki istismar. On səkkiz yaşına çatmamış şəxsə baxan ana, ata və ya tərbiyəçi, müəllim tərəfindən uşağa zərər vuran fiziki zorakılıq, uşağı

yaralayan və ya yaralanmasına səbəb ola biləcək bədbəxt hadisə sayılmayan hər növ davranış və münasibət kimi müəyyən edilir. Fiziki zorakılıq ən çox yayılmış və diaqnozu ən asan olan istismar növüdür. Uşağın bədənindəki göyərmələr, əziklər, baş travmaları, əzaların sınığı və yerindən çıxması, yanıq izləri kimi uşağa zərər verən, uşağın fiziki və psixoloji cəhətdən tamlığına zərər verən davranışlar fiziki istismar olaraq qarşımıza çıxa bilir [7]. Bəzən ailələr, pedaqoqlar və ya ekspertlər uşağa qarşı səlahiyyət əldə etmək və ya qəzəbini boşaltmaq üçün fiziki zorakılığa əl atırlar. Bu fiziki zorakılıq uşağa təkcə fiziki ziyan vurmur, həm də uşağın zehni və emosional olaraq döyülməsinə səbəb ola bilir. Bəzi mədəniyyətlərdə zorakılıq təhsil vasitəsi kimi istifadə olunsa da, ədəbiyyatda bunun əksini, cəzanın əslində çəkindirici bir üsul olmadığını bildirən çoxlu araşdırmalar vardır [12].

Cinsi istismar. Uşağın hələ nə baş verdiyini qavraya bilmədiyi, inkişaf baxımından da hələ belə bir vəziyyətə hazır olmadığı cinsi hərəkətə məcbur edilməsi onun, düşdüyü bu vəziyyətə adekvat reaksiya bildirə bilmək səviyyəsində olmamasıdır. Başqa sözlə desək, uşaqlara qarşı edilən bu davranış onlardan alət kimi istifadə edərək böyüklərin cinsi həzzini təmin etməsidir [3]. Cinsi istismar uşaqlara qarşı olan istismarlar arasında müəyyən edilməsi ən çətin olan istismar növüdür. On səkkiz yaşına çatmamış şəxslərin cinsi, fiziki və əqli inkişafını hələ tamamlamadığı dövrdə baş verən istismarlar uşağın gələcək həyatında çox ciddi mənfi nəticələrə səbəb ola bilər. Uşaqlıqda baş verən bu neqativ hadisələr psixi və fiziki xəstəliklərə səbəb olmaqla yanaşı, beynin inkişafına da mənfi təsir göstərərək, sonrakı nəsillərdə də özünü göstərə bilər [10]. Cinsi istismara məruz qalan uşaqlarda xəyanət, acizlik, stiqma, depressiya, qorxu, qəzəb, uşağın özünə hörmətinin azalması, yuxusuzluq, maddə istifadəsi, iştahsızlıq, görmə hallüsinasiyaları, cinsi problemlər və s. kimi müxtəlif pozuntular baş verə bilər. Eyni zamanda, bu əlamətlər uşağın yaşına və cinsinə, istismar edən şəxsin istismara məruz qalan uşağa olan yaxınlığına, istismarın formasına, müddətinə və tezliyinə görə dəyişə bilər [16].

Emosional istismar – gündəlik həyatda ən çox rast gəlinən istismar növlərindən biridir. Bu istismar uşağın ailəsi, dayəsi və əhatəsindəki insanların uşağın şəxsiyyətinə xələl gətirən, emosional olaraq ona mane olan hərəkətlər göstərməsi kimi müəyyən edilir. Uşaqdan yaşına uyğun olmayan məsuliyyət gözləmək, uşağa qışqırmaq, onu alçaltmaq, uşağı rədd etmək, bacı-qardaşlar arasında ayrı-seçkilik etmək, uşağı alçaldıcı şəkildə təhqir etmək, uşağın emosional ehtiyaclarının ödənməməsi, uşağa ləqəb qoymaq və onu elə çağırmaq, uşağı evdə təkbaşına və ya başqa bir yerdə istəmədiyi halda tək buraxmaq, qorxutmaq, uşağı təhdidlərə məruz qoymaq, uşağı ətrafdakılardan asılı vəziyyətə salmaq və ya həddindən artıq qoruyucu münasibətlər göstərmək daxildir. Emosional istismara məruz qalmış uşaqlar əsasən öz hisslərini ifadə etməkdə və başqalarının hisslərini real və dəqiq şəkildə şərh etməkdə çətinlik çəkirlər. Bu tip istismara məruz qalan uşaqların bağlılıq münasibətləri də zədələnə bilər, məruz qaldıqları istismar nəticəsində onlar neqativ emosiyalar içərisində olurlar və bu da onların həyatlarında baş verəcək hadisələri adekvat qiymətləndirmələrinə mane olaraq yaşadıqları dünyanı pis bir yer kimi qəbul edirlər.

Fiziki laqeydlik. Fiziki laqeydlik uşağın normal qida və ya geyimlə

təmin edilməməsi, müvafiq sağlamlıq xidməti, müşahidə və nəzarət təmin edilməməsi, həmçinin, tərk edilmə də daxildir. Məsələn, uşağın təcrid edilməsi, tək buraxılması və ya evdən qovulması tərk edilmə nümunəsi kimi verilə bilən fiziki laqeydliyin formalarıdır. Yurdakök və İnce fiziki laqeydliyi, baxımından məsul olan şəxsin uşağın sağlamlıq ehtiyaclarına laqeyd yanaşması və ya gecikdirməsi kimi təyin etmişlər. Məsələn, uşağın xəstəliyinə və ya zədələnməsinə məhəl qoymamaq və peyvənd olunmaması kimi hallar fiziki laqeydliyin olmasını göstərən amillərdəndir.

Emosional laqeydlik. Emosional laqeydlik valideynlərin və tərbiyəçinin uşağa adekvat emosional yaxınlıq və emosional dəstək göstərməməsi kimi müəyyən edilir. Yurdakök və İnceyə görə emosional laqeydlik uşağın sosial inkişafının dəstəklənməsinə maraq göstərməmək və onun emosional ehtiyaclarını ödəməmək, uşağın psixoloji ehtiyaclarına cavab verməmək, sosial qaydaları öyrənməkdən məhrum etməklə özünü göstərir [13].

Cinsi laqeydlik. Cinsi laqeydlik uşaqların ailəsi tərəfindən onların cinsi istismara qarşı müdafiəsiz qalması, bu vəziyyətə biganə münasibət göstərilməsi, uşağın cinsi inkişafına lazımi əhəmiyyət və qayğının göstərilməməsi kimi müəyyən edilir.

Uşaqlıq dövründə istismar və laqeydlikdən sonra uşağın biopsixososial inkişafında neqativ amillər meydana gəlir. Travmatik hadisədən sonra yaranan problemlər qısa müddətdə görünə bilsə də, hadisənin təsirləri uzun müddət sonrada daha aydın hiss edilir. Zorakılığa və baxımsızlığa məruz qalan uşaqlarda müxtəlif psixiatrik əlamətlər müşahidə oluna bilir. Bununla belə, bir çox zorakılığa məruz qalan uşaqlarda (cinsi zorakılıq da daxil olmaqla) heç bir psixiatrik əlamət olmaya bilər. Hadisədən dərhal sonra heç bir psixiatrik əlamətin olmaması, uşağın sonrakı həyatında heç bir psixiatrik pozuntu inkişaf etməyəcəyi kimi şərh edilməməlidir. Bir dəfə belə zorakılığa məruz qalmaq uşağın inkişafına mənfi təsir göstərir. Bəzən unudulduğu güman edilən erkən uşaqlıq travmaları (psixoloji) zaman keçdikcə uşağın sonrakı yaş dövrlərində mənfi nəticələrlə üzə çıxaraq, sosial və psixoloji problemlərə səbəb ola bilir.

Oriyentasiya problemləri də uşaqlıq travmalarına səbəb olan amillərdən biridir. Daxili və xarici olmaqla iki növ oriyentasiya problemi var. Daxili oriyentasiya problemləri uşaqlarla pis rəftarın ən ümumi nəticələrindən biridir. Bu mənada zorakılığa və baxımsızlığa məruz qalan uşaqlarda müşahidə olunan problemləri daxili və xarici olmaqla iki qrupda araşdırmaq məsələyə aydınlıq gətirəcək. Daxili oriyentasiya problemləri; təşviş, depressiya, tibbi səbəblərə görə olmayan somatik şikayətlər, sosial mühitdən uzaqlaşma kimi problemlərdir. Xarici oriyentasiya problemləri; kənardan müşahidə oluna bilən, dağıdıcı və zərərli davranışları ehtiva edən problemlərdir. Daxili oriyentasiya problemi olan uşaqlarda aqressivlik, davakarlıq və impulsivlik müşahidə olunur. Kiçik yaşda zorakılığa və laqeydliyə məruz qalan uşaqlarda xarici oriyentasiya problemləri tez-tez görülsə də, daha böyük yaşlı uşaqlarda və ya yeniyetmələrdə daxili oriyentasiya problemlərinə rast gəlinir. Buna görə də uşaqlıq travmaları ilə yetkinlik dövründə baş verən daxili oriyentasiya problemləri arasındakı əlaqəni araşdırmaq vacibdir.

Çində bir poliklinikaya müraciət edən 229 depressiya, 102 bipolyar, 216 şizofreniya xəstəsi və 216 sağlam

nəzarət qrupu ilə aparılan araşdırmada depressiya xəstələrinin 55 %-i, bipolyar xəstələrin 61,8 %-i, şizofreniya xəstələrinin 47,2 %-si və sağlam olan şəxslərin 20,5 %-sində ən azı bir növ psixoloji travma müəyyən edilmişdir

Xəstə qruplarında ən çox fiziki laqeydlik və emosional laqeydlik bildirilsə də, ən az cinsi istismar və fiziki istismar qeydə alınıb. Sağlam nümunə tərəfindən bildirilən ən çox uşaqlıq travmasının 11,4% ilə fiziki istismar olduğu müşahidə edilmişdir.

Örsel və digərlərinin (2011) psixiatrik xəstələrlə apardıqları araşdırmada uşaqlıqda emosional istismara məruz qaldıqlarını bildirən iştirakçılarda əhval və narahatlıq pozuntularına tez-tez rast gəlindiyi müəyyən edilmişdir. Uşaqlıqda cinsi istismarı bildirən qrupda alkoqol-maddə istifadəsi və intihara cəhdlərin yüksək olduğu aşkar edilmişdir [15, s.16]

Məhkəmə-tibbi ekspertiza üçün klinikaya göndərilən cinsi istismar qurbanı olan və 215 uşaq və yeniyetmələrlə (157 qız, 58 oğlan) aparılan tədqiqatların nəticələrinə görə, tədqiq edilənlərin 81,9 faizində istismardan sonra ən az bir psixi pozuntunun inkişaf etdiyi müşahidə edilib. Bunlardan 33 %-də travma sonrası stress pozuntusu, 25,6 %-də kəskin stress pozuntusu, 25,1 %-də əsas depressiv pozuntusu, 2,8 %-də davranış pozuntusu aşkar edilib. Bildirilib ki, bir halda kəkələmə və gecə enurezi inkişaf edib [15, s.16]

Artıq qeyd etdiyimiz kimi uşaqlıq travmaları uşağın həyatında ciddi problemlərə səbəb ola bilər. Bu travmatik "təcrübələr" uşağın emosional sağlamlığına dərindən təsir edə bilər və uzunmüddətli nəticələrə səbəb ola bilər. Uşaqlıq travmaları aleksitimiya kimi emosional pozuntuların inkişafına da təsir edə bilər. Aleksitimiya anlayışı ilk dəfə 1970-ci illərdə Sifneos tərəfindən emosional problemləri izah etmək üçün istifadə edilmişdir. Aleksitimiya emosiyaların koqnitiv emalı və tənzimlənməsində çatışmazlıqları əks etdirən bir şəxsiyyət xüsusiyyətidir. Aleksitimiya "a" - yox, "lexis" - söz, "tymos" – emosiya sözlərindən ibarət olan və emosiyaların yoxluğunu ifadə edən yunan terminidir. Bu anlayış bir çox tədqiqatçılar tərəfindən emosiyaları adlandırma, emosiyaları mənalandırma və emosiyaların ifadə edilməsinin çətinliyi kimi müəyyən edilir. Bu anlayış dilimizə tərcümə olunduqda bu anlayış müxtəlif mənalarda qarşımıza çıxa bilər. Dereboyun fikrincə, bu, “hisslər üçün söz yoxluğu” deməkdir [8, s. 157]. Dökmenin fikrincə, “fikir köləliyi” mənasını daşıyır [1, s.27]. Bu anlayışın ilk zamanlarda psixosomatik xəstələrdəki simptomlarla əlaqəli olduğu düşünülsə də, sonradan bunun təkcə psixosomatik xəstəliyə sahib olanlarda olmadığı və fiziki və psixi pozuntularda da olduğu ortaya çıxdı.

Məlumdur ki, insanın həyatında hisslər mühüm yer tutur. İnsanı digər canlılardan fərqləndirən, onun cism - hadisələrə, başqa insanlara və özünə münasibətini ifadə edən hisslər, insanın ömür yolunda, onun hansı vəziyyətdə olmasını ifadə edən və buna əsasən insanın davranış tərzini şərtləndirərək (o cümlədən sevincli, kədərli, ikrah, nifrət, məmnun və s.) mənalı bir həyat sürməsinə şərait yaradır ki, bu da insan üçün həyatda öz məqsədini düzgün şəkildə müəyyənləşdirmək qədər mühüm əhəmiyyətə malikdir. Həyatda mühüm yeri olan hisslərin başa düşmək və mənalandırmaq çox vacibdir. Bununla belə, bəzi hallarda emosiyalarımızı başa düşməkdə və onları mənalandırmaq da çətinlik çəkə bilərik.

Aleksitimiya ilk olaraq insanın emosional aləmində və başqaları ilə

münasibətlərin saxlanmasında yaşadığı çətinliklər kimi ortaya çıxır. Bu, insanın o an hiss etdiyi hissləri təsvir etməkdə və bu hisslərin nə olduğunu ayırd etməkdə çətinlik çəkməsi ilə xarakterizə olunan bir anlayışdır. Bu anlayış insanın hisslərini anlamaq, müəyyən etmək və ifadə etmək çətinliyi və buna görə də konkret düşünmə meyli və xəyal qurma qabiliyyətinin azalması ilə müşayiət olunan şəxsiyyət xüsusiyyətlərini izah edir. Şəxsiyyət xüsusiyyəti olaraq qəbul edilməklə yanaşı, insanın yaşadığı sıxıntını sözlə ifadə edə bilməməsi nəticəsində yaranan somatik simptomun inkişafı ilə cavab vermə üsulu kimi də şərh edilə bilər.

Aleksitimik səxslərin xüsusiyyətləri, həyatlarında dəhşətli hadisələr yaşamış, xüsusən də davamlı və təkrarlanan travmalara məruz qalmış şəxslərin xüsusiyyətləri ilə olduqca oxşardır. Aleksitimiyanın müxtəlif psixiatrik pozuntularla əlaqəli olub olmaması tədqiq edilmişdir. Məsələn, daha yaxın zamanlarda aparılan tədqiqatlar aleksitimiyanın təkcə psixosomatik pozuntularla deyil, həm də digər somatik və psixiatrik pozuntularla əlaqəli olduğunu ortaya qoydu. Aleksitimiya ilə bağlı araşdırmaların əksəriyyətinin erkən psixoloji travmalarla əlaqəli olduğu da məlumdur. Bu mövzu ilə bağlı aparılan araşdırmalar, aleksitimiyanın uşaqlıq travmaları ilə əlaqəli olduğunu müəyyən etdi. Bununla belə, əksər tədqiqatlar uşaqlıqda cinsi və fiziki zorakılıqla bağlı olduğundan, uşaqlıq istismarı və laqeydlik tarixi ilə aleksitimiyanın inkişafı arasındakı əlaqə tam olaraq başa düşülməmişdir. Bermond, B., Moormann, P. P., Albach, F. və Van Dijke, A. tərəfindən 2008-ci ildə aparılan, uşaqlıqda cinsi istismara məruz qalan şəxslərin aleksitimik xüsusiyyətlərini araşdıran tədqiqatda, uşaqlıqda şiddətli cinsi istismar tarixi olan şəxslərin cinsi istismar tarixi olmayanlarla müqayisədə Bermond-Vorst Aleksitimiya Şkalasının (BVAQ) hissləri müəyyən etmək, təhlil etmək və şifahi ifadə etmək kimi altmiqyaslarından daha yüksək bal alıblar [2]. Bu tapıntı Krystalın (1988) uşaqlıqda cinsi zorakılığın yetkinlikdə aleksitimiyanın inkişafında mühüm faktor olduğu fikrini dəstəkləyir.

Uşaqlıqda emosional istismar və aleksitimiyanın inkişafı arasındakı əlaqəni ilk dəfə 2009-cu ildə Evren, C., Evren, B., Dalbudak, E., Ozcelik, B. və Oncu, F. tərəfindən araşdırılan tədqiqatda, aleksitimik xüsusiyyətlər olan qrupda olmayanlara nisbətən emosional istismarı bildirmə nisbətinin daha yüksək olduğu aşkar edilmişdir [6].

Eynilə, emosional laqeydlik tarixinin aleksitimiyanın inkişafı baxımından rolunu araşdırarkən, psixoloji və fiziki cəhətdən sağlam fərdlərlə aparılan bir araşdırmada, uşaqlıq dövründəki emosional laqeydlik ilə aleksitimiya arasında müsbət və əhəmiyyətli bir əlaqə tapıldı.

Uşaqlıq dövründə laqeydlik və ya istismara məruz qalan şəxslərin psixoloji və fiziki cəhətdən mənfi təsirə məruz qaldığı bildirilir. Müxtəlif araşdırmalar nəticəsində belə qənaətə gəlinir ki, aleksitimiyası olan insanlar uşaqlıqda travmatik hadisəyə və ya vəziyyətə məruz qalıblar. Aleksitimiya ilə bəzi psixoloji pozuntular arasındakı əlaqə araşdırılmış və bu pozuntuların bir çoxunun travmatik təcrübələrlə əlaqəli olduğu qənaətinə gəlinmişdir.

Aleksitimiya ilə bağlı aparılmış tədqiqatların təhlilindən belə nəticəyə gəlmək olar ki, aleksitimiyanın etiologiyasında ilkin qayğı göstərənlərlə erkən münasibətlərin pozulması ilə uşaqlıq travmaları

4. Kalyuzhny, A.A. Psychology of Teacher's Image Formation. / A.A. *Kalyuzhny* // −M: Humanitarian Publishing Center VLADOS, −2004. −p. 222.
5. https://success-teacher.do.am/index/kriterii_sovremennogo_uroka/054

**E-mail:** mmmdovakonu391@gmail.com
**Redaksiyaya daxil olub:** 17.04.2024

*UOT 159.9*

***Aytən İlham qızı Alışanlı***
*fəlsəfə doktoru proqramı üzrə dissertant*
*Bakı Dövlət Universiteti*
***Orcid**: https://orcid.org/0009-0000-0706-550X*

## PSİXOLOGİYADA EMOSİYA VƏ İNTELLEKTİN QARŞILIQLI ƏLAQƏSİ PROBLEMİ

***Айтен Ильхам гызы Алышанлы***
*диссертант по программе доктора философии*
*Бакинский Государственный Университет*

## ПРОБЛЕМА ВЗАИМОСВЯЗИ ЭМОЦИЙ И ИНТЕЛЛЕКТА В ПСИХОЛОГИИ

***Aytan Ilham Alishanli***
*doctorial student in the program of doctor of philosophy*
*Baku State University*

## THE PROBLEM OF THE RELATIONSHIP BETWEEN EMOTION AND INTELLIGENCE IN PSYCHOLOGY

**Xülasə.** Məqalədə emosiya və intellektin qarşılıqlı əlaqəsi probleminin psixologiyada elmi-nəzəri və praktiki əhəmiyyəti nəzərdən keçirilir. Psixologiyanın təşəkkül mərhələsindən bu günə kimi geniş bir tarixi dövr ərzində problemin tədqiqi prosesi əsaslı şəkildə izlənilir və təhlil olunur. Eyni zamanda psixoloji fikirdə “sosial intellekt”, “praktiki intellekt”, “emosional intellekt” anlayışlarının formalaşmasından, emosional intellektin müxtəlif modellərinin yaranmasından sonra koqnitiv və emosional-affektiv sferaların qarşılıqlı əlaqəsinin praktiki əhəmiyyəti ilə bağlı yeni yanaşma və konsepsiyaların mühüm məqamları, ümumi və fərqli tərəfləri üzə çıxarılır. Məqalədə problemin müasir dərki və qiymətləndirilməsi ilə bağlı aparılan təhlillərdə bir sıra psixi proseslərin izahında böyük əhəmiyyət kəsb edən məsələlərə xüsusi diqqət yetirilir.

***Açar sözlər:*** *emosiya, intellekt, emosional intellekt, sosial intellekt, praktiki intellekt*

**Резюме.** В статье рассматривается научно-теоретическая и практическая значимость проблемы взаимодействия эмоций и интеллекта в психологии. От этапа становления психологии до наших дней процесс исследования проблемы фундаментально прослеживается и анализируется на протяжении широкого исторического периода. В то же время, после формирования в психологической мысли понятий «социальный интеллект», «практический интеллект», «эмоциональный интеллект», появления различных моделей эмоционального

интеллекта, выявлены важные моменты, общие и различные аспекты новых подходов связанные с практической значимостью взаимодействия познавательной и эмоционально-аффективной сфер. В статье при анализе современного понимания и оценки проблемы особое внимание уделено вопросам, имеющим большое значение для объяснении ряда психических процессов.

***Ключевые слова:*** *эмоция, интеллект, эмоциональный интеллект, социальный интеллект, практический интеллект*

**Summary.** The article examines the scientific, theoretical and practical significance of the problem of interaction between emotions and intelligence in psychology. From the stage of formation of psychology to the present day, the process of studying the problem is fundamentally traced and analyzed over a wide historical period. At the same time, after the formation of the concepts “social intelligence”, “practical intelligence”, “emotional intelligence” in psychological thought, the emergence of various models of emotional intelligence, important points, general and various aspects of new approaches related to the practical significance of the interaction between cognitive and emotional-affective spheres. In the article, when analyzing the modern understanding and assessment of the problem, special attention is paid to issues that are of great importance for explaining a number of mental processes.

***Keywords:*** *emotion, intelligence, emotional intelligence, social intelligence, practical intelligence*

Psixologiya elminin formalaşdığı dövrdən bu günə qədər emosiya və intellektin qarşılıqlı əlaqəsi bir sıra elmi anlayışların və psixi hadisələrin dəqiqləşməsi və izahında xüsusi əhəmiyyət daşımasına, müxtəlif yanaşmalara və polemikalara səbəb olmasına görə daim diqqət mərkəzində olan və praktiki əhəmiyyəti ilə seçilən mövzulardandır. Məlum olduğu kimi, psixologiya ilkin olaraq fəlsəfi biliklər çərçivəsində inkişaf edib. Ağıl və hisslərin qarşılıqlı münasibəti kimi psixoloji problem də ilk dəfə antik dövr filosoflarının diqqət dairəsində olub. Psixologiya tarixində bu dövrlə bağlı aparılan ümumiləşdirmədə qeyd olunur ki, affektiv həyat filosoflar tərəfindən daha az dəyərləndirilir və bütövlükdə təfəkkürə tabe etdirilirdi. Məsələn, Sokrat və Platonun təlimlərində əqli sfera emosional-motivasiyalıdan fərqləndirilib və əsas rol “ağıl”a ayrılıb. Platona görə, ağıl və emosiyaların qarşılıqlı əlaqəsi “ağa və kölənin” münasibəti kimidir. Burada ağıl emosiyaların dağıdıcı təsirinə bütövlükdə nəzarət etməlidir. Belə ki, hisslər və emosiyalar həqiqətin dərk olunması yolunda maneələrdir.

Lakin psixologiyaya qədərki dövrdə də bu problemə yanaşmada fərqlilik müşahidə olunur. Məsələn, Platondan fərqli olaraq Aristotel dərketmə prosesində emosiyaların mühüm rolundan bəhs edirdi. Aristotel hesab edirdi ki, intellektual yanaşmalar kimi, emosiyalar da insanın mühakimələrinə təsir göstərir. Onun fikrincə, emosional münasibət göstərmə həm real şəkildə mövcud olan stimulun təsiri ilə, həm də müəyyən situasiyanın qeyri-düzgün dərki ilə bağlı yarana bilər. Bu zaman situasiyanı qiymətləndirmə və interpretasiyasını dəyişməklə emosiyaları idarə etmək olar.

Stoiklər emosiya və intellektin qarşılıqlı əlaqəsi barədə təlimi inkişaf etdirərək emosiyaların mənfi rolunu qeyd edirdilər. Onlar fərdin cəmiyyətə və özünün ondakı yerinə dair səhv mühakimələrini emosiyaların mənbəyi adlandırırdılar. Bu da emosiyaları stimulların koqnitiv qiymətləndirilməsi hesab edən

Aristotelin fikrindən köklü şəkildə fərqlənirdi.

Yeni dövrdə koqnitiv və emosional sferaların qarşılıqlı əlaqəsi məsələləri antoqonist istiqamətlərə: empirizm (F. Bekon, T. Qobs, D. Yum və b) və rasionalizmə (R. Dekart, B. Spinoza və b.) bölünən qnoseoloji təlim çərçivəsində aparılıb. Birinci istiqamətin nümayəndələri biliyin yeganə mənbəyi kimi hissi təcrübəni, ikincilər isə ağılı göstəriblər. Beləliklə artıq XVII əsrdə təfəkkürdə ağıl və hisslərin yerini müəyyənləşdirməyə cəhdlər edilib. Həmin dövrdə rasionalizmin əsas nümayəndəsi R. Dekart sayılırdı. Dekartın rasionalist metodunun mahiyyəti iki əsas müddəadan ibarətdir. Birincisi, Dekarta görə, idrakın əsasında intellektual intuisiya dayanmalıdır. İkincisi, ağıl deduksiya əsasında bu intuitiv baxışlardan bütün vacib nəticələri çıxarmalıdır. Dekartın fikrincə, nəticə hər zaman aydın və dəqiq olmadığına görə, deduksiya vacibdir (4).

Bu metodologiyanın inkişafını filosof B. Spinozanın tədqiqatlarında görmək olar. Spinoza emosional təzahürləri iki tipə ayırırdı: ehtiras və emosiyalar. Ehtiras şüurda hər hansı aydın ideya ilə, daha dəqiq desək bilik və prinsiplərlə bağlı olmayan hissdən ibarətdir. Emosiyalar isə hisslərin və koqnisiyaların cisimlər arasındakı əlaqənin dərk olunması yolu ilə əldə edilən nəticəsidir. O, təxəyyül adlandırdığı hissi təsəvvürləri kəskin şəkildə dərketməyə qarşı qoyur. Spinozaya görə, hissi təsəvvürlər biliklərin ilk, aşağı növünü yaradır. Biliklər qavrayışın iki yolu ilə yaranır. Onlardan birincisini B. Spinoza qeyri-müəyyən, nizamsız təcrübə adlandırır. Bu təcrübə insan həyatının geniş sferasını əhatə edir. Çünki heç bir insan belə təcrübəsiz keçinə bilməz. Lakin təcrübi biliklərlə əldə olunan həqiqət və ya ideyaların nəzəri dəyəri böyük olmur. Etibarlı biliklər yalnız dərketmənin ikinci yolunu təşkil edən düşüncə və ağıl mərhələsində mümkündür.

Beləliklə, əgər empirik F. Bekon hər zaman ideyaların hissi məzmununu qeyd edirsə, rasionalist B. Spinoza onların məntiqi təbiətini vurğulayır. Onun fikrincə, yalnız mühakimələrin məntiqi bağlılığı, sistemliliyi insanı adekvat biliklərə gətirib çıxarmağa qadirdir. Empirizmin digər bir nümayəndəsi D. Yum şüura xidmət edən koqnitiv proseslərə emosiyaların təsirindən söz açır. O, insanın özünə hədsiz eqosentrik marağını ehtiva edən şəfqəti ən vacib insan emosiyası hesab edirdi.

Beləliklə, Yeni dövrün filosofları üçün emosiya və ağılın qarşı-qarşıya qoyulması xarakterikdir və bu da sonrakı yüzilliklər ərzində filosoflar və psixoloqlar üçün ənənə halını alıb. Onlar intellekt və emosiyaların qarşılıqlı əlaqəsindən bəhs edərkən bunu ilk növbədə əqli funksiyaların affektiv sfera üzərində dominantlığı kimi izah edirdilər. İntellektin hisslərə nisbətən üstün mövqe tutması ilə bağlı rasionalist baxış fəlsəfədə, sonralar isə psixologiyada üstünlük təşkil etməyə başlamışdır. Lakin XIX əsrin ortalarında Qərbi Avropa fəlsəfəsində ön plana irrasionalist konsepsiyalar çıxır. Əgər rasionalizm insan aktivliyinin rasional-məqsədyönlü formalarını önə çəkirsə, irrasionalizm də mənəvi olanı spontan, qeyri-iradi impulslarla, subyektin emosional-iradi, mənəvi-praktiki strukturları ilə eyniləşdirir. Rasionalizm sistemindəki dünyaya nəzəri-dərketmə yanaşmasının qarşısına irrasionalizm mənəvi-praktik olanı qoyur. Rasionalizm üçün xarakterik olan subyekt-obyekt münasibətlərini irrasionalizm subyekt-subyekt münasibətləri ilə əvəzləyir. İnsan başlıca olaraq ünsiyyət (kommunikasiya) subyekti kimi nəzərdən keçirilir.

Həyat fəlsəfəsinin nümayəndələri olan V. Diltey, Q. Zimmel və b. həyatı iradə, həvəs, hiss-həyəcan faktları kimi müəyyənləşdirirlər. Onlar qeyd edirlər ki, "həyat təcrübəsi"nin düşüncəyə aiddiyyatı yoxdur, o irrasionaldır.

Rasionalizmlə müqayisədə irrasionalizm üçün emosiya və intellektin uyğunsuzluğu xarakterikdir. İrrasionalizmdə qnoseoloji yox, aksioloji yanaşma üstünlük təşkil edir və əsas prioritet intellektlə deyil, mənəvi dəyərləndirmə qabiliyyətinə verilir. İrrasionalizm fəlsəfəsinin daha bir əsas cəhəti intellektin gerçəkliyi əksetmə vasitəsi kimi inkarıdır. Dünyanın həqiqi dərki emosiyalar, intuisiya və inam sayəsində baş verir.

Beləliklə, fəlsəfədə emosiya və intellektin qarşılıqlı əlaqəsinə iki əsas baxış mövcuddur. Rasionalist yanaşma üçün intellektin emosiyalar üzərində dominantlığı xarakterikdir. İrrasionalizmdə isə affektiv sferanın prioritet olması vurğulanır. Lakin fəlsəfi fikirdə dominant olan ümumi ideya bu psixi funksiyalar arasında mürəkkəb münasibətlərin mövcudluğunun təsdiq edilməsidir.

Psixologiya XIX əsrin sonunda müstəqil elm sahəsi kimi formalaşdı və dərhal da emosiyaların ciddi şəkildə öyrənilməsinə başlanıldı. Məsələn, V. Vundt hisslərin üçölçülü nəzəriyyəsini (1880) yaratdı. Bu nəzəriyyədə emosiyalar aydın şəkildə təsəvvürlərə təsir edən daxili dəyişmələr kimi qiymətləndirilirdi. Belə alınırdı ki, emosiyalar istənilən fizioloji prosesin mənbəyi rolunu oynayır.

XX əsrin əvvəllərində tədqiqatçıların intellekt məsələlərinə marağı kəskin şəkildə artdı. Lakin bu sahədə çalışan A. Bine, Ç. Spirmen, L. Terstoun kimi psixoloqlar intellektin şəxsiyyət xarakteristikasından asılılığını nəzərə almaq istəmirdilər. 1908-ci ildə alman alimi Q. Mayer tərəfindən psixikanın emosional və koqnitiv sferaları arasında qarşılıqlı əlaqəni ehtimal edən model təklif olundu. O, "məntiqi" və "emosional" təfəkkürü fərqləndirir, ikincini praktik təfəkkürlə, yəni insanın adi həyat tərzi ilə bağlayırdı.

Emosiya və intellekt arasındakı əlaqənin müəyyən dərəcədə etiraf olunmasına baxmayaraq, əksər tədqiqatlarda onlar yenə də ayrılıqda öyrənilirdi. 1930-cu illərin sonunda R.L. Torndayk və S. Şteyn tərəfindən ilk dəfə sosial intellekt anlayışı irəli sürüldü. Tədqiqatçılar onu, "insanları anlamağın, insani münasibətlərdə müdrik davranmağın ümumi bacarığı" kimi izah etdilər (9). Onun ölçülməsi imkanı barədə qənaət əldə olundu. İntellektin çoxtərəfliliyi ideyası D. Veksler (1958) tərəfindən inkişaf etdirildi. D. Veksler ümumi bacarıqların "qeyri-intellektual" aspektlərini qeyd etdi. O, bu ad altında fərdin psixikasının affektiv-tənzimləyici komponentlərini nəzərdə tuturdu (9).

Bəzi tədqiqatçılar sosial intellektin özünəməxsusluğunu insan davranışı nəzəriyyəsini öyrənməklə başa düşməyə çalışıblar. Sternberq və onun kolleqaları davranışın müxtəlif növlərindən hansının akademik, hansının gündəlik intellektə aid olduğunu göstərməyi mütəxəssislərdən və diletantlardan xahiş etmişdilər. İntellektin hər bir tipinin qiymətləndirilməsinin analizi sosial mötəbərlik amilini müəyyənləşdirməyə imkan verdi.

Ötən əsrin sonlarında Kosmitski və Con sosial intellekt anlayışına aid olan əksliklərı aradan qaldırmağa cəhd göstərdilər. Onlar sosial intellekt konsepsiyasında əsas olan yeddi tərkib hissəsi müəyyən etdilər. Bunlar həm koqnitiv (perspektivin qiymətləndirilməsi, insanları başa düşmək, sosial qaydaları bilmək, ətrafdakılarla münasibətdə açıqlıq), həm də gündəlik (insanlarla iş görə

bilmək qabiliyyəti, sosial uyğunlaşma, şəxsiyyətlərarası münasibətlərdə istilik) elementlərdir. Sosial intellektin öyrənilməsi zaman-zaman tədqiqatçıların diqqətindən kənar qalıb. Bu da sosial intellektin sərhədlərini müəyyən etmək, onu akademik və ya mücərrəd olandan ayırmaq cəhdlərinin uğursuzluğu ilə şərtlənir. Bu sərhədlərin müəyyənləşməsindəki çətinliklər sosial intellektin koqnitiv aspektlərinə üstünlük verən yanaşmalar və əsasən verbal qiymətə aid olan metodlarla əlaqələndirilir. Torndayk və digər tədqiqatçılar sosial intellektin çoxölçülü təbiətini etiraf ediblər. Lakin son vaxtlara kimi onun tədqiqində koqnitiv aspektlərə, o sıradan sosial qavrayışa daha çox diqqət ayrılıb. Bu koqnitiv xarakteristikaları müəyyən etmək üçün tədqiqatçılar verbal ölçmənin nəticələrinə əsaslanıblar. Həmçinin sosial intellektlə bağlı gündəlik aspektlərin qiymətləndirilməsi də verbal metodların (məsələn, özünühesabat) köməyi ilə həyata keçirilib. Ədəbiyyatın qısa icmalından aydın olur ki, sosial intellektin müəyyənləşməsində gündəlik və ya qeyri-verbal vasitələrə üstünlük verən tədqiqatçılar verbal və ya koqnitivə əsaslananlardan daha çox uğur qazanıblar.

Koqnitiv və emosional proseslərin qarşılıqlı münasibəti problemi xüsusən təfəkkür psixologiyası sahəsində özünü qabarıq büruzə verir. Hələ psixologiyanın ilkin mərhələsini təmsil edənlər də insan təfəkküründə emosional komponentlərin mövcudluğu faktını inkar edə bilmirdilər. Məsələn, E. Bleyer patoloji analizə əsaslanaraq təfəkkürü autistik və realistə ayırırdı. Bir qayda olaraq, emosional təfəkkür adi həyatdakı fəaliyyətlə, intellektual isə elmi dərketmə ilə əlaqələndirilirdi. E. Bleyerə görə autistik təfəkkürün məqsədlərinə affektlərin təsirindən asılı mexanizmin köməyi ilə çatmaq olur. Belə təfəkkür növü səhv anlayışlar, simvollarla fəaliyyət göstərir, müvəqqəti münasibətləri inkar edir. Realistik təfəkkürün məqsədi ətraf aləmin düzgün dərkini yaratmaq, həqiqəti tapmaqdır. Autistik funksiyalar məmnunluq affekti ilə boyanmış təsəvvürlər yaratmağa, əks təsəvvürləri sıxışdırmağa cəhd edir. Bu müəllifə görə, aralarındakı əksliklərə baxmayaraq, autistik və adi təfəkkür arasında dəqiq sərhəd yoxdur.

XX əsrin ikinci yarısında emosiyaların koqnitiv nəzəriyyələri yarandı. Onlardan daha geniş yayılanı S. Şexterin emosiyaların koqnitiv-fizioloji nəzəriyyəsi oldu. Şexter hesab edirdi ki, insanın emosiyaları təkcə müəyyən stimulların və onların yaratdığı fizioloji dəyişikliklərin yox, keçmiş təcrübənin, eləcə də hazırda mövcud olan tələbat və maraqların təsirinə məruz qalır.

XX əsrin 60-cı illərindən sonra emosiya və intellektin qarşılıqlı əlaqəsinin öyrənilməsinə maraq artdı. Nəticədə emosional və koqnitiv proseslərin səmərəli qarşılıqlı əlaqəsi barədə hələ psixologiyanın təşəkkül dövründə irəli sürülən fikir və mülahizələr öz təsdiqini tapmağa başladı. 1970-ci illərdə ABŞ-də təfəkkürün informasiya nəzəriyyəsi meydana çıxdı. Q. Saymon belə bir tezisi əsaslandırdı ki, "təfəkkürün motivasiyalı və emosional tənzimlənməsi informasiya prosesi sisteminə daxil edilə bilər" (6). Bu zaman müəllif faktiki olaraq emosional tənzimləməni məqsədin əldə olunması və ya əldə olunmaması halında davranış alt proqramının kəsilməsi mexanizmi ilə eyniləşdirir. Orqanizmin daha güclü, təxirə salınmaz tələbatlarının aktuallaşması bu kəsilmənin əsası olur. Belə yanaşmada fəaliyyətin tənzimləyiciləri kimi emosiyaların psixoloji əhəmiyyəti bütünlüklə bağlı qalır.

1980-ci illərin sonu – 1990-cı illərin əvvəlində Qərb

psixologiyasında əqli fəaliyyətin emosional tərkibinə marağın intibah dövrü başlayır. Harvard psixoloqu H. Qardnerin təsnifatında intellekt yeddi variantda təqdim olunur: məkan, motor, musiqi, linqvistik, riyazi-məntiqi, şəxsiyyətlərarası və şəxsiyyətdaxili. Onun fikrincə, sinir sisteminin işində onların hər birinə uyğun gələn, müəyyən informasiyanın – verbal, məkan və s. emalında ixtisaslaşan altsistemlər var. H. Qardnerin təsəvvürünə görə, təlim və məşqlər intellektin baza gücünü artırmağa qadir olmasa da, bir qayda olaraq intellektual potensialın artırılmasında həlledici rol oynaya bilir (11).

Ümumiyyətlə, XX əsrin sonlarında intellektin qeyri-akademik formalarına marağın artdığını müşahidə edirik. Onların tədqiqi üçün mübahisəli olsa da bir sıra dəyərli, qismən bir-birini təkrar edən konsepsiyalar irəli sürülüb. Onlardan biri Sternberqin praktik intellekt konsepsiyasıdır. Onunla yanaşı sosial intellekt, emosional intellekt, şəxsiyyətdaxili, şəxsiyyətlərarası intellektlər barədə təsəvvürlər də formalaşır. Cons və Dey intellektin praktik əhəmiyyət daşıyan müxtəlif konsepsiyalarının oxşarlığını qeyd ediblər. Onlar hesab edirdilər ki, praktik, sosial və emosional intellekt anlayışlarının əsasında təsviri və metodik biliklər, eləcə də bilikləri bərpa etmək və problemləri həll etmək qabiliyyətləri dayanır (12).

Praktik intellektin ("empirik ağılın") digər müasir tədqiqatçısının – S. Epşteynin konsepsiyası emosiya və təfəkkürün əlaqəsi xarakteristikasına daha inkişaf etmiş yanaşmalardan biridir. O öz nəzəriyyəsində emosiyaların təfəkkürə təsiri mexanizmini açır, intellektin və bütövlükdə şəxsiyyətin uğurlu fəaliyyəti üçün emosional vəziyyətlərin tənzimlənməsi vacibliyini sübut edir.

S. Epşteyn hesab edir ki, insanda iki növ intellekt var. "Biz rasional intellektlə yanaşı, digərinə də malikik. Onu İQ-in köməyi ilə ölçmək mümkün deyil". S. Epşteyn intellektin bu növünü "empirik ağıl" adlandırır. "Əgər biz rasional təfəkkür vərdişlərini mücərrədləşdirmə və analizin köməyi ilə əldə ediriksə, empirik ağıl bilavasitə təcrübədə təkmilləşir. Rasional metod problemləri məntiqi sıralamanın köməyi ilə həll etməyə cəhd göstərir, empirik isə intuitiv müdrikliyə əsaslanır. Empirik ağıl rasionala nisbətən bizim emosiyalarımızla daha sıx bağlıdır" (10). Empirik ağıl həyat təcrübəsi ilə qırılmaz şəkildə əlaqəlidir. O cari hadisələrin fasiləsiz interpretasiyası və uyğun reaksiyaların müəyyənləşdirilməsi ilə məşğuldur. Eyni zamanda informasiyanı sürətlə, effektiv və intuitiv emal edir. Hərçənd ki, rasional nöqteyi-nəzərdən bu hər zaman düzgün alınmır.

S. Epşteyn həmçinin rasional və empirik ağılın üstünlüklərindən istifadə etmək qabiliyyəti barədə konstruktiv təfəkkür konsepsiyasını irəli sürüb. Emosiyaların idarə olunması və davranışın idarə olunması konstruktiv təfəkkürün iki mühüm komponentidir. Onlar birlikdə hisslərin daxili dünyası və hadisələrin xarici aləmi ilə affektiv qarşılıqlı əlaqə yaratmaq bacarığını müəyyən edir. S. Epşteyn neqativ hisslərin öhdəsindən uğurlu gələn emosional müvazinətli insanlar təsvir edir. Onları düşüncənin sakitliyi, stressin aşağı səviyyəsi, toparlanmaq bacarığı xarakterizə edir. Onlar uğursuzluqlara qarşı həddindən artıq həssas deyillər və onlardan asılı olmayan şeylər barədə narahat olmurlar. Onlar özlərinə və digərlərinə həddindən artıq tənqidi yanaşmırlar, xoşagəlməz hadisələr əsasında hədsiz ümumiləşdirmələr aparmırlar" (10). S. Epşteynin konsepsiyasında konstruktiv təfəkkür emosional və

rasionalın ətraf aləmə uyğunlaşmanı təmin edən effektiv qarşılıqlı əlaqəsidir.

Bütövlükdə qeyd etmək lazımdır ki, emosiya və intellektin qarşılıqlı əlaqəsi problemi XX əsrin sonuna kimi nəzəri və xüsusən praktiki planda kifayət dərəcədə işlənilməyib. Təfəkkürün emosional tənzimlənməsi problemi nəinki tədqiqatların prioritet istiqamətlərinə daxil edilməyib, ümumiyyətlə diqqətdən kənarda qalıb.

Emosional və koqnitiv proseslərin səmərəli qarşılıqlı fəaliyyəti ilə bağlı ehtimallar bir sıra tədqiqatlarda öz əksini tapıb. Depressiyaların şüurun realistliyinə təsirinin, əhvalın dəyişilməsinə meylliliklə kreativlik arasında qarşılıqlı əlaqənin, emosional özünütənzimləmə bacarığının öyrənilməsini (R. Lazarus, L. Şpits, F. Danes, K. Şerer və b) bu sıraya aid etmək olar. 1970-1980-ci illərdə özündə əhvalı və mühakiməni birləşdirən "koqnitiv halqa"nın mövcudluğu ehtimalı yaranır. Onun mahiyyəti bundan ibarətdir ki, mənfi emosiyalar neqativ fikirlər yaradır və onlar da öz növbəsində emosional həyəcanların intensivliyini artırır. Eyni zamanda müsbət emosiyalar pozitiv fikirləri aktivləşdirir.

XX əsrin sonlarında psixologiyada "emosional intellekt" anlayışının formalaşması və inkişafı emosiya və intellektin qarşılıqlı əlaqəsinə yeni bir konseptual baxış bucağının yaranmasına səbəb oldu. 1990-cı ildə iki amerikan tədqiqatçısının – C. Mayer və P. Saloveyin Eİ konsepsiyasının təsvir olunduğu məqaləsi çap olundu. P. Salovey və C. Mayer hesab edirdilər ki, "İnsan təbiəti rasional hesablama ilə məhdudlaşmır. Emosiya və intellektin qarşılıqlı əlaqələrinin çox müxtəlif olmasına baxmayaraq, onlardan yalnız bir neçəsi bizi həqiqətən də ağıllı edir. Bu qarşılıqlı kəsişmə və təsirin kifayət qədər məhdud sahəsini emosional intellekt kimi müəyyənləşdirmək olar" (13). Emosiyalarla intellektin bu "qarşılıqlı kəsişmə və təsir sahəsini" Eİ-nin qabiliyyətlər modelinin müəllifləri olan C. Mayer, P. Salovey və D. Karuzo emosiyaları müəyyənləşdirmək (identifikasiya) və ifadə etmək, müəyyən emosiyaları doğurmaq və onların koqnitiv sistemə necə daxil olmasına və koqnisiyanı dəyişdirməsinə nəzarət etmək, emosiyaları dərk etmək və onları idarə etmək bacarıqları kimi təqdim edirlər. Eİ-nin qarışıq modellərində (D. Qoulmen, R. Bar-On və b.) isə emosional intellekt şəxsiyyət xarakteristikaları ilə qarşılıqlı əlaqədə təqdim olunur. Bu baxımdan Rusiyalı tədqiqatçı D.V. Lyusinin yanaşması da maraq doğurur. Onun fikrincə, emosiyaların dərki və idarə olunması bacarıqları şəxsiyyətin emosional sferaya ümumi istiqamətlənməsi ilə (insanların daxili dünyasına maraq, davranışın psixoloji analizinə meyl) sıx bağlıdır. Buna uyğun olaraq, emosional intellekt ikili təbiətə malikdir. O bir tərəfdən koqnitiv bacarıqlarla, digər tərəfdən şəxsiyyət xarakteristikaları ilə bağlıdır (7).

Beləliklə, emosional intellekt fenomeninin kəşfi koqnitiv və affektiv proseslərin təbiəti, onların qarşılıqlı əlaqəsi barədə təsəvvürlərin inkişafının nəticəsidir. Bu prosesdə mühüm nailiyyətlər bunlardır: emosiyalar barədə təsəvvürlərin zənginləşməsi (onlara şüurun alt sistemlərindən biri kimi, motivasiya faktoru kimi baxılmağa başlanıldı); intellekt haqqında təsəvvürlərin genişlənməsi (intellektual təzahürlərin çoxtərəfliliyi ideyası, sosial intellektin kəşfi); emosiyalar və intellektə aid tədqiqatlarda affektiv və koqnitiv proseslərin birliyi və səmərəli qarşılıqlı fəaliyyətinə dair yeni konsepsiyaların və yanaşmaların irəli sürülməsi.

Emosiya və intellektin qarşılıqlı əlaqəsi probleminin tədqiqi prosesini izləməklə belə bir qənaətə gəlmək olar ki, gələcək araşdırmalar üçün müəyyən nəzəri-metodoloji əsasların yaradılmasına baxmayaraq, koqnitiv və affektiv proseslərinn təbiəti, spesifikliyi, qarşılıqlı təsir mexanizmləri barədə yekdil və aydın elmi təsəvvürlərin formalaşmasına böyük ehtiyac duyulur. Emosiya və intellektin qarşılıqlı təsir və əlaqəsinə dair əsaslı nəticələrin əldə olunması sosial intellekt və emosional intellekt anlayışlarının mahiyyəti və tərkib hissələri barədə aydın təsəvvürlərin formalaşması baxımından da mühüm əhəmiyyət daşıyır.

**Problemin aktuallığı.** Emosiya və intellektin qarşılıqlı əlaqəsi psixoloji tədqiqatların prioritet istiqamətlərindən, elmi-praktiki dəyəri ilə seçilən mövzularından biridir. Koqnitiv və emosional sferaların bağlılıq dərəcəsinin və bir-birinə təsir imkanlarının tədqiqi bir sıra elmi anlayışların dəqiqləşməsində, bir çox mürəkkəb psixi proseslərin izahında və qiymətləndirilməsində xüsusi rola və əhəmiyyətə malikdir. Emosiya və intellektin qarşılıqlı təsir mexanizmlərinin tam aydınlaşmaması səbəbindən müasir psixologiyada bu problem öz aktuallığını qoruyub saxlayır. **Problemin elmi yeniliyi.** Məqalədə psixologiya elminin təşəkkül mərhələsindən bu günə qədər emosiya və intellektin qarşılıqlı əlaqəsinə dair tədqiqatların, müxtəlif yanaşma və qiymətləndirmələrin sistemli təhlili aparılmış, müvafiq nəticələr əldə olunmuşdur.

**Problemin praktik əhəmiyyəti.** Müasir psixologiyada emosiya və intellektin qarşılıqlı əlaqəsinin yeri və rolunu müəyyənləşdirmək baxımından onun mahiyyəti, funksiyası, təsir mexanizmləri barədə ətraflı təsəvvürə malik olmaq vacibdir. Məqalədən ali məktəb müəllimləri, tələbə və magistrantlar istifadə edə bilərlər.

**Ədəbiyyat:**


1. Əlizadə, Ə.Ə. İdrak prosesləri və hisslər. Psixopedaqoji məsələlər / Ə.Ə. Əlizadə. −Bakı: 2006. −346 s.
2. Əliyeva, K.R. Şəxsiyyətin formalaşmasında emosional intellektin rolu: Monoqrafiya / K.R. Əliyeva. −Bakı: Şərq-Qərb; −2023. −248 s.
3. Hüseynova, G.Q. Emosiyaların psixologiyası: Ali məktəblər üçün dərs vəsaiti / G.Q. Hüseynova, Y.Ə. Vəliyeva. −Bakı, 2022. −284 s.
4. Алексеев, П.В. Философия: учебник. / П.В. Алексеев, А.В. Панин. – Изд. 3-е, перераб. и доп. – М.: ПБОЮЛ Грачев С.М., –2000. – 608 с.
5. Гоулман, Д. Эмоциональный интеллект. / Д. Гоулман. –М: АСТ Москва, – 2009. – 478 с.
6. Карпов, А.В. Психология эмоционального интеллекта: теория, диагностика, практика: монография / А.В. Карпов, А.С. Петровская; Яросл. гос. ун-т. – Ярославль : ЯрГУ, – 2008. – 344 с.
7. Люсин, Д.В. Социальный и эмоциональный интеллект: от моделей к измерениям / Д.В. Люсин, Д.В. Ушаков. – М.: Институт психологии РАН, – 2009. – 347 с.
8. Р. Дж. Стернберг, Дж. Б. Форсайт, Дж. Хедланд и др. Практический интеллект — СПб.: Питер, –2002. — 272 с.
9. Ушаков, Д.В. Социальный и эмоциальный интеллект: надежды, сомнения, перспективы / Д.В. Люсин, Д.В. Ушаков. – М.: Институт психологии РАН, – 2009. – 347 с.
10. Epstein, S. Constructive thinking: A broad coping variable with specific components / S. Epstein, P. Meier // Journal of Perso- nality and Social Psychology. – 1989. – V. 57. – P. 332–350.
11. Gardner, H. Multiple intelligence / H. Gardner. – N.Y., 1993.

12. Jones, K. & Day, J. D. Discrimination of two aspects of cognitive social intelligence from academic intelligence. Journal of Educational Psychology, 1997. P. 89, 486-497.
13. Mayer, J. Emotional Intelligence: Theory, Findings and Im- plications / J. Mayer, P. Salovey, D. Caruso // Psychological Inquiry, 2004. – V. 15, № 3. – P. 197–215.

**E-mail:** alishanli.aytan.ilham@bsu.edu.az
**Redaksiyaya daxil olub:** 23.04.2024

*UOT 159.9*

***Günay Hümbət qızı Məmmədzadə***
*Azərbaycan Respublikası Təhsil İnstitutunun*
*fəlsəfə doktoru proqramı üzrə doktorantı,*
*Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət Universitetinin*
*Sosial-mədəni fəaliyyət kafedrasının müəllimi*
***Orcid:** https://orcid.org/0000-0002-8484-1792*

## ÜMUMTƏHSİL MƏKTƏBLƏRİNDƏ BULLİNQ HALLARI VƏ ONUN ARADAN QALDIRILMASI PROBLEMİNİN ÜMUMPEDAQOJİ MƏSƏLƏLƏRİ

***Гюнай Гумбат гызы Мамедзаде***
*докторант по программе доктора философии*
*Института Образования Азербайджанской Республики,*
*преподаватель кафедры Социально-культурной деятельности Азербайджанского*
*Государственного Университета Культуры и Искусств*

## СЛУЧАИ БУЛЛИНГА В ОБЩЕОБРАЗОВАТЕЛЬНЫХ ШКОЛАХ И ОБЩЕПЕДАГОГИЧЕСКИЕ ВОПРОСЫ ПРОБЛЕМЫ ИХ УСТРАНЕНИЯ

***Gunay Humbat Mammadzada***
*doctoral student of the doctor of philosophy program of the*
*Institute of Education of the Republic of Azerbaijan,*
*teacher of the department of Social and cultural activities of*
*the Azerbaijan State University of Culture and Arts*

## GENERAL PEDAGOGICAL ISSUES OF BULLYING AT SCHOOLS AND ITS ELIMINATION WAYS

**Xülasə.** Məqalədə bullinqin nə olduğu, onun yaranma səbəbləri, bullinqin qarşısının alınması üçün atıla biləcək addımlar haqqında danışılır, məktəblərin bəlasına çevrilmiş bullinq hallarından bəhs olunaraq, bu haqda tədqiqat aparmış dünyanın bir sıra alimlərinin yanaşmalarına toxunulur. Burada bullinqin şagirdlərin həyatına göstərdiyi mənfi təsirlərə diqqət çəkilərək, Azərbaycan məktəblərində də geniş yayılmış bullinq hallarının nə kimi nəticələr yaratdığı vurğulanır və bu halların qarşısının necə alına biləcəyi araşdırılır. Tədqiqat işində ümumtəhsil məktəblərində bullinqin qarşısının alınmasında məktəb idarəçilərinin üzərinə düşən vəzifələr haqqında danışılarkən düzgün tərbiyə modelinin qurulması və maarifləndirmə məsələsi önə sürülür.
***Açar sözlər:** məktəb, bullinq, buller, qurban, həll yolları, idarəçilik.*

**Резюме.** В статье говорится о том, что такое буллинг, причины его возникновения, способы, которые можно предпринять для предотвращения буллинга, случаи буллинга, а также уделяется внимание мнениям мировых ученых, занимающихся проблемой буллинга. Здесь, обращая внимание на негативное влияние буллинга на жизнь учащихся, подчеркивается, какие последствия имеют массовые случаи буллинга в азербайджанских школах и как эти случаи можно предотвратить. В исследовательской работе, говоря об обязанностях администрации школы по предотвращению буллинга в общеобразовательных школах, выдвигается вопрос о создании правильной модели обучения и воспитания.
***Ключевые слова:*** *школа, буллинг, буллер, жертва, способы решения, управление.*

**Summary.** The article deals about what bullying is, its causes, and solutions that can be taken to prevent bullying. The article mentions the cases of bullying that have become a scourge of modern schools, and touches upon the approaches of a number of scientists of the world who have conducted research on this issue. Here, paying attention to the negative effects of bullying on students' lives, it is emphasized what kind of consequences the widespread cases of bullying in Azerbaijani schools have and how these cases can be prevented. In the research work, is talked about the duties of the school management in preventing bullying in secondary schools.
***Keywords:*** *school, bullying, buller, victim, solutions, management.*

Birləşmiş Millətlər Təşkilatının Uşaq Hüquqları Konvensiyası bütün uşaqların hər hansı formada zərər və sui-istifadədən müdafiə olunmaq hüququnu təsbit edir və dövlətlərin üzərinə uşaq hüquqlarının qorunması sistemlərinin yaradılmasını təmin etmək öhdəliyi qoyur. (Uşaq Hüquqları Konvensiyası 1989)

Hər bir dövlətin sosial siyasətinin əsas vəzifələri bütün uşaqların yaşaması, inkişafı, tərbiyəsi və təhsili üçün əlverişli şəraitin təmin edilməsi ilə yanaşı onların zorakılıq hallarından qorunmasını təmin etməkdir. Zorakılıq halları uşaqların həyatının istənilən sahəsində baş verə bilir. Məktəb də bu sahələrdən biridir.

Məktəb uşaqların təhsil almaq hüquqlarını təmin etməkdə əsas rol oynayan, eyni zamanda onların təlim və tərbiyəsi ilə məşğul olan məkandır. Əgər məktəbin birinci vəzifəsi dövrün bilik və bacarıqlarını təhsilalanlara çatdırmaqdırsa, ikinci vacib vəzifəsi isə təhsilalanların şəxsiyyət kimi yetişməsini təmin etmək, dövrün və cəmiyyətin tələblərinə uyğun şəkildə formalaşdırmaqdır. Məktəbin bir digər vəzifəsi də təhsilalanların və təhsilverənlərin təhlükəsizliyini qorumaqdır. Lakin son illər məktəblərdə baş verən neqativ halların artması məktəblilərin təhlükəsizlik məsələsini sual altına alır. Bu halların içində bullinqi xüsusi qeyd etməliyik.

Bu gün məktəblərdə bullinq məsələsi dünyaca geniş yayılıb. Uşaqlara Qarşı Zorakılıq üzrə Dünya Hesabatında qeyd edilir ki, məktəblərdəki hər 10 uşaqdan biri zorakılığa məruz qalır və bu rəqəm ilbəil artmaqdadır. Bəs bullinq halları ilə necə mübarizə aparmalıyıq, bu kimi halların qarşısını almaq üçün hansı addımlar atmalı, nə kimi qanun layihələri hazırlamalıyıq?

Bullinqə qarşı mübarizə aparmaq üçün ilk olaraq məfhumun nə olduğunu anlamalı, eyni zamanda hansı halların bullinq sayıldığını dəqiqləşdirməli, məktəblərdə bullinqin yaranma səbəblərini öyrənməli, bullerlərlə qurbanların psixoloji vəziyyətini fərqləndirməli, sonra isə

bu halla mübarizə üsulları yaradılmalıdır.

Bullinq ingilis sözü olub qorxutmaq, təhqir etmək, təcavüz etmək mənasına gəlib, fərqli fiziki və ya mənəvi gücə malik, eyni və ya müxtəlif yaş qrupundan olan şagirdlərin bir-birinə etdiyi fiziki, psixoloji və sözlü təzyiqdir.

UNİCEF-ə görə bullinq uşaqların incidilməsinə səbəb olan ixtiyari və təkrar olaraq törədilmiş aqressiv davranışdır. Çevlik Akara görə bullinq daha çox güc əldə etmək üçün təzyiq yolu ilə edilən istənilən neqativ haldır. (Çevlik, 2013:12). Rigbi K.-ya görə, bullinq stress yaradan fenomen olub, uşağın sosial və mental həyatına bir sıra mənfi təsirlər göstərir. (Rigby, 2017: 58) Kreyq və Peplerə görə isə bullinq qurbanda mənəvi-psixoloji yaralar açan, davamlı psixoloji, fiziki sözlü şiddətlə təkrarlanan və məqsədi pis olan bir davranışdır. (Kreig and Pepler, 2003: 575)

Vacib məsələlərdən biri də hansı halların bullinq sayılmasıdır.

Olveusa görə bullinq aralarında fiziki və mənəvi cəhətdən güc natarazlığı olan bir və ya bir neçə şəxsin, zəif tərəfə mütəmadi və istəyərək fiziki, sözlü və psixoloji təzyiqidir və bir hərəkət o zaman bullinq sayılır ki;

1. O qəsdən, zərər vermək məqsədilə aparılsın; 2. Bu davranışlar təkrarlansın; 3. Bullinqə məruz qalanla törədən arasında güc disbalansı olsun. (Olveus, 1993: 12)

Bullinq məsələsində diqqət edilməli əsas hissə bullinqin məqsədyönlü şəkildə törədilməsidir. Bu düşünülmüş, planlaşdırılmış, davamlı olaraq edilən neqativ davranış formasıdır.

Məktəblərdə baş verən bullinq halları şagirdlərin təhsil həyatına olduqca mənfi təsir göstərir. Bullinq şagirdlərdə bir sıra neqativ hisslər yaradır. Bullinqə məruz qalan şagirdlər özlərini məktəbdə təhlükəsiz hiss etmirlər, yaşıdları, sinif yoldaşları ilə ünsiyyət qura bilmir, utancaq olur, özlərini ifadə edə bilmir, asosial həyat tərzi keçirir, ətrafdakılara etibar etmirlər. Bu kimi hallar isə nəticə etibarilə şagirdlərin təhsilalma səviyyəsini aşağı salır.

Del Rio və Baumana görə bullinq məktəb həyatına və şagirdlərin öyrənmə bacarığına mənfi təsir edir. Şagird məktəbdə özünü təhlükəsiz hiss etməzsə, bullinqə məruz qalarsa, onu fiziki və mənəvi cəhətdən risk altına salan məktəb mühitini sevməz, hər vəchlə uzaqlaşmağa çalışar və beləliklə, məktəblərdə sağlam təhsil mühiti yaranmaz. (Del and Bauman, 2005: 430)

Bəs bullinqi yaradan səbəblər nədir? Nəyə görə hər hansı bir uşaq və ya uşaq qrupları, digərlərini təzyiqə məruz qoymağa çalışır, məqsədli şəkildə ona fiziki və ya mənəvi cəhətdən zərər vermək istəyir?

Aparılan bir sıra araşdırmalara görə bunun təkcə bir səbəbi yoxdur. Buraya ailədən gələn zorakılıq və ya doğru olmayan tərbiyə forması, şagirdlərin psixoloji pozuntuları, uşağın sosial əhatəsi, uşağın baxdığı və təsirinə düşdüyü bir sıra oyunlar, proqramlar və s. aiddir.

Z. Koçun apardığı elmi araşdırmalar göstərir ki, şagirdlərin ailələrindən diqqət görməməsi, valideynlərin övladlarının hisslərinə önəm verməməsi, ailədaxili bağların zəifliyi, uşağın daim təzyiq altında olması, sevgisiz böyüməsi, fiziki cəzanın tətbiqi bullerlərin yetişməsinə şərait yaradır. Bullerlər ən çox belə mühitlərdən çıxır. Ümumən götürdükdə bullerlər həmişə problemli ailələrin övladları olurlar. (Koç, 2006: 18)

(Kriade Martinezə görə isə, uşaqlar bəzən özlərinə status qazanmaqdan ötrü də buller olurlar. Buna səbəb isə ümumiyyətlə

uşaqların güc anlayışında fiziki güc anlayışının xüsusi rol oynamasıdır. (Criado, 2014: 65)

Ümumiyyətlə, bullinqin səbəblərini aşağıdakı kimi sistemli qruplaşdıra bilərik.

1. Şəxsi səbəblər – Buraya şagirdin psixoloji vəziyyəti aiddir. Məktəblərdə müxtəlif psixologiyalı şagirdlər təhsil alır və onların hamısının psixoloji sağlamlığı yerində olmur. Bu şagirdlərin psixoloji halları onların digər şagirdlərə qarşı neqativ davranış göstərməsinə səbəb ola bilir. Hal-hazırda bu səbəbi nəzərə alaraq Azərbaycanda şagirdlərin psixoloji pasportunun çıxarılması məsələsi gündəmdədir.

2. Ailədən gələn səbəblər. Belə bir atalar sözümüz var: Uşaq evin güzgüsüdür. Bullerləri və qurbanları araşdıran zaman aydın olur ki, uşağın tərbiyəsindəki qüsurlar, uşağın yaşadığı mühitdəki çatışmazlıqlar onun formalaşmasına mənfi təsir göstərir və bu da onun yoldaşları ilə münasibətinə sirayət edir. Bu kimi mənfi halların başında ailədə uşağa diqqət ayrılmaması, valideynlərin övladlarına fərq qoyması, ata-ana münasibətlərinin gərginliyi, valideynlərin uşaqlara qarşı həddindən artıq tələbkar olması, ata-ananın övladına qarşı qəddar davranışı, ata-ananın övladı eqoist böyütməsi gəlir.

Zorakılığın adi hala çevrildiyi ailələrdən də bullerlərin çıxması danılmazdır. Ailədə güclü olanın sözünün keçdiyini görən şagird bu halı məktəbdə tətbiq edir.

Bullerlərin çoxu ailədə bullinqə məruz qalanlardır. Onlar daxillərində yığılan mənfi enerjini, alçalmışlıq hissini, gücsüzlüyü dəf etməkdən ötrü başqalarını da bullinqin qurbanına çevirirlər.

Bullinq bullerə güc və özünü önəmli hissetmə duyğusu verir. O bir növ bullinq etməklə eqosunu təmin etmiş olur.

3. Mühit amilləri. Hər bir uşaq nə qədər də öz ailəsindən tərbiyə alsa da, mühitin onun üzərindəki təsiri danılmazdır. Xüsusilə də XXI əsrdə texnologiyanın inkişafı uşaq tərbiyəsində müsbət imkanlar yaratsa da, mənfi hallar da yaradır. Televiziya, internet, sosial medianın uşaqlar üzərində mənfi təsirləri təkzib edilməzdir. Aqressiya yaradan kompüter oyunları oynayan uşaqlarda kimisə döymək, təhqir etmək halları adiləşir. Çünki onlar günlərinin ən azı iki saatını döyüş xarakterli oyunlar oynamaqla keçirirlər və oyundakı personajları öldürmək, döymək artıq onlara zövq verir və alternativ olaraq "güc" xəstəliyinə tutulmuş olurlar. Onlar virtual dünyadakı liderliklərini, aqressiyalarını real dünyaya da tətbiq etmək istəyirlər. Və təəssüf ki, bu məkanlardan biri də məktəb olur.

4. Məktəbə aid səbəblər – Şagirdin lider olmaq arzusu, dərslərdəki uğursuzluğu, müəllimin diqqətsizliyi, rəhbərliyin idarəçilik qabiliyyətinin aşağı olması. Hər sinifdə lider olmaq arzusunda olan qız və oğlanlar olur. Bəzən bu şagirdlər təbiətən lider xüsusiyyətlərinə malik olub digər şagirdlər arasında hörmət qazanaraq lider olurlar, bəzən isə bu cür xarakterlərdən uzaq şagirdlər sinif yoldaşları arasında istədikləri nüfuzu qazana bilmədikləri üçün bullinqə baş vururlar. Şagirdin dərslərdəki uğursuzluğu da onu buller edə bilər. Bəzən qiymətləri aşağı olan şagirdlər yaxşı oxuyan sinif yoldaşlarına qarşı bullinq tətbiq edirlər. Onlar müəllimin sevimlisi olan şagirdlərə qısqanclıqla yanaşır, öz bacarıqsızlıqlarının qisasını onlardan almağa çalışırlar.

Bullinqin geniş hal almasında məktəb rəhbərliyinin idarəçilik qabiliyyətinin aşağı olması da mühüm rol oynayır. Şagirdlərə nəzarətin zəif olduğu məktəblərdə bullinq halları daha çox baş verir. Bəzi müəllimlərə görə məktəbdə müəllim nüfuzunun

zədələnməsinə görə bullinq halları baş verir. Bu gün müəllimin əvvəlki kimi söz haqqı və səlahiyyəti yoxdur. Bu boşluq isə hansısa şagirdin məktəbdə lider olmaq, başqalarını əzə bilmək hissələrinin inkişafına gətirib çıxarır.

5. Sosial iqtisadi səbəblər. Sosial iqtisadi vəziyyəti aşağı olan ailələrin övladları arasında da bullerlər çoxdur. Adətən uşaq bu tip hərəkətlərlə özünü ətrafında təsdiq etdirmək istəyir. İşləməyə məcbur olan ata-ana diqqətindən yayınan uşaq, diqqət mərkəzində olmaq, hörmət və sevgi görmək üçün bullinqə əl ata bilir. Sosial-iqtisadi vəziyyəti həddindən artıq yaxşı olan şagirdlər arasında da bullerlər az deyil. Adətən onlar valideynlərindən yox sözü eşitmirlər, hər istədikləri olur, onlara həddindən artıq sərbəstlik verilir. Və onlar sonsuz gücə sahib olduqlarını düşünürlər. Digərləri ilə empatiya qura bilmir və bullerlərə çevrilirlər.

Məktəbdə baş verən bullinq halları ilə necə mübarizə aparıla bilər?

Təhsil müəssisəsində çalışanların məktəbdəki təhsilalma və təhsilvermə prosesini yüksək səviyyədə təşkil etmələri üçün təhlükəsizliyi təmin etmələri mütləqdir. Buna görə də məktəbdə işləyən hər kəs, müdir, müəllim, texniki işçilər də daxil olmaqla, hər kəs bullinq haqqında məlumatlı olmalı, bullerləri və qurbanları tanıya bilməlidirlər.

Bu müstəvidə atılacaq ilk addım buller və qurbanın müəyyənləşdirilməsidir.

Adətən bullerlərin müəllim və məktəb rəhbərliyi ilə də münasibəti yaxşı olmur. Onlar tez-tez müəllimlərlə mübahisə edir, dərsi pozur, sinif yoldaşlarına lağ edir, dərsdən yayınır, müdiriyyətə tabe olmurlar. Bu tip şagirdləri araşdırarkən onların valideynləri və ailənin digər üzvləri ilə də normal münasibətlərinin olmadığını görürük. Onlar psixoloji və fiziki cəhətdən daha güclü olur, özlərinə güvənirlər. Qurbanların isə özünəinamı aşağı olur, çarəsiz, tez ağlayan olurlar. Qurbanların dost əhatələri elə də geniş olmur. Onlar çox vaxt tənha olur və ya bir dostları olur. Əgər bullerlərlə qurbanlar yaxın və eyni məhəllədə, küçədə yaşayırlarsa, bu zaman qurbanın həyatı daha da dözülməz olur. Buller məhəllədə də onu təqib edir.

Qurbanların daimi bullinqə məruz qalmaları təhsil almalarına da mənfi təsir göstərir. Bullinqə məruz qalan şagirdlərin psixoloji və fiziki sağlamlıqlarında da müxtəlif problemlər yaranır. Bunun nəticəsi olaraq ibtidai sinif şagirdlərində ürək bulanma, qusma, qarın ağrısı, gecə yerini islatma kimi hallar baş verir.

Məktəblərdə bullinqin qarşısını almaq üçün onun tətbiq olunduğu yerləri də bilmək lazımdır.

Adətən bullinqin, xüsusilə də fiziki bullinqin tətbiq olunma yerləri məktəbin daha az istifadə olunan yerləri: məsələn akt zalı, idman zalı, boş otaqlar olur. Buna görə də məsul şəxslər az istifadə olunan otaqların daim qıfıllı olmasına diqqət etməli, boş otaqlara isə nəzarət etməlidir.

Qurban sözlü və mənəvi bullinqə isə demək olar ki məktəbin hər yerində; sinif otağında, dəhlizdə, ayaqyolunda, bufetdə, məktəbin həyətində məruz qala bilir. Kral və Kəpənəkçiyə görə uşaqların ən çox təhlükə altında olduqları vaxt tənəffüs saatlarıdır. Bu saatlarda uşağı qorumaq vəzifəsi növbətçi müəllimlərin üzərinə düşür. (Kıral və Kepenekçi, 2018: 696)

Deməli, bullinqin kim tərəfindən və harada törədildiyini bildikdən sonra nəzarətin kimlər tərəfindən aparılacağı dəqiqləşdirilməlidir. Bullinq hallarının baş verdiyi yerlərdə nəzarəti gücləndirmək, növbətçi

müəllimlər və ya işçilər təyin etmək problemin həllinə ciddi şəkildə kömək edə bilər. Texnikanın verdiyi üstünlüklərdən istifadə edərək "qırmızı bölgələr"i daim nəzarətdə saxlamaq lazımdır.

Posluoğlu da bullinqin qarşısının alınmasında növbətçi müəllimlərin roluna diqqət çəkir. O bildirir ki, növbətçi müəllimlər tənəffüs saatlarında dəhliz, ayaqyolu, məktəb həyəti, nərdivanlar, yeməkxanaları gəzərək uşaqları daim nəzarətdə saxlamalı və beləliklə, uşaqlar arasında baş verəcək mənəvi və fiziki təzyiqlərin qarşısını almalıdırlar. Daimi nəzarəti görən bullerlər ən azından məktəb ərazisində davranışlarına nəzarət edəcək, qısnama hallarına son qoymalı olacaqlar. (Posluoğlu, 2014: 57)

Bullinq məsələsində sinif rəhbərlərinin məsuliyyəti, oynayacaqları mənfi və müsbət rollar danılmazdır. Sinif rəhbəri sinfə rəhbərlik etdiyi zaman bütün uşaqlarının xasiyyətini bilməli, onlarla rəftar strategiyası qurmalıdır. Çox vaxt bullerlər qurbanlarına qarşı etdikləri əməllərin nə kimi pis nəticələr verdiyini, və ya verəcəyini anlamırlar. Bəzən hətta əldə etdikləri kiçik "uğurlar"la fəxr də edirlər.

Bullerləri müəyyən etdikdən sonra onlarla ayrılıqda söhbət aparmaq, davranışlarının səbəbini anlamaq, hərəkətlərini fəsadlarını başa salmaq lazımdır. Bu təsir etmədikdə valideynlərlə söhbət, sonra isə müvafiq nizamnaməyə uyğun olaraq cəza tədbirləri görmək də sinif rəhbərinin atacağı addım siyahısına əlavə oluna bilər. Sinif rəhbərinin səmimi müəllim-şagird münasibəti qurması bullinq probleminin həllində müsbət nəticə verə biləcək amillərdəndir. Bullinqə məruz qalan şagird onu qoruyacaq, müdafiə edəcək şəxsin olduğunu bilməlidir. Əgər sinifdəki heç bir müəllim şagirdə bu səmimiyyəti verə bilməyibsə, o şagird qorxunun yaratdığı mənfi təsir nəticəsində dərslərdən yayınacaq və məktəbə gəlmək istəməyəcəkdir.

Valideyn iclası, dəyərlərimizin təbliği, hüquq tərbiyəsi, estetik tərbiyə, və s. hüquq mühafizə orqanı işçilərinin məktəbə dəvət olunması və şagirdlərin edəcəkləri hər hansı mənfi halın qanun qarşısındakı dəyəri də bullerləri bullinqdən çəkindirə bilər. Bəzən şagirdlər bullinqə məruz qaldıqlarını deməkdən çəkinirlər bunun üçün anonim anket sorğuları aparmaq, məktəbdə şikayət qutusu qoymaq olar.

Bullinq zamanı əgər buller məktəb rəhbərliyi tərəfindən cəzalandırılmırsa, bu ona gələcək davranışlarında daha sərbəst olmağa imkan verir. Əgər o qurbana ancaq sözlü təzyiq edirdisə, cəzasızlıq onu fiziki bullinqə də ruhlandıra bilər. Bu cür cəzasızlıq qurbanın məktəb rəhbərliyinə olan etimadını azaldır. Buna görə də bir çox hallarda qurbanlar problemlərini müəllimləri və məktəb rəhbərliyi ilə bölüşməkdən çəkinirlər.

Bəzən isə qurban son çarəni intiharda görür. Dəhşətlisi isə odur ki, Azərbaycanda 2009-2015-ci illərdə 10 məktəbli intiharı qeydə alınıb. Bunlardan 8-ci sinif şagirdi Elina Hacıyevanın intiharı isə xüsusi diqqət çəkir. O, özünü məktəbin üçüncü mərtəbəsindən ataraq intihar etmişdir. (9) Çox təəssüf ki, bu intiharın səbəbi Elinanın məktəbdə gördüyü bullinq idi. O, istər sinif yoldaşları, istərsə də daha böyük siniflər (10-11-ci sinif şagirdlərin onu təpikləməsi və bunun müəllimlər tərəfindən gizlədilməsi faktı var) və eləcə də bir neçə müəllimi tərəfindən bullinqə məruz qalmışdı. Bu hadisədə günahkar isə şagirdin bullinqə məruz qaldığını bilən, lakin bu faktı gizlətməyə çalışan, bullinqə məruz qalan şagirdə heç bir psixoloji və mənəvi kömək gös-

tərməyən səriştəsiz məktəb rəhbərliyi və övladının içindəki təlatümləri görə bilməyən valideynlərdir.

Görünən odur ki, Azərbaycan məktəblərində bullinqin öyrənilməsi və onunla mübarizə yollarının ümumpedaqoji məsələləri yetərli qədər işlənməyib.

Bullinqin təhlükəsi təkcə məktəb həyatına verdiyi fəsadlarla bitmir. Təəssüflə qeyd etməliyik ki, bullerlər başqalarının üzərində qurduqları fiziki və mənəvi “hökmranlıq”dan ilhamlanaraq həyatlarını buller olaraq davam etdirirlər. Məktəb rəhbərliyinin bullerlərə nəzarəti eyni zamanda cəmiyyətin təhlükəsizliyi naminə də olmalıdır. Aparılan elmi tədqiqatlar onu göstərir ki, bullerlər bullinqi həyat tərzinə çevirir, həyatlarında ən azı bir dəfə cinayət əməli törətmiş olurlar. Qurbanların həyatları da ürəkaçan olmur. Məktəb zamanından qazandıqları özünəinamsızlıq, özünüifadə edə bilməmə, güvənsizlik, inamsızlıq onların gələcək həyatlarında da problem yaradır, onların depressiv həyat sürməsinə, bəzən isə intihar etməsinə gətirib çıxarır.

Bu kimi hallar bizi bir daha əmin edir ki, bullinq məsələsinə xüsusi önəm verməli və gələcəyimiz olan şagirdlərimizin təhlükəsiz mühitdə böyüməsini və təhsil almasını təmin etməliyik.

Onu da vurğulamalıyıq ki, şagirdlərin məktəbdə davranış qaydalarını tənzimləməkdən ötrü Azərbaycan Respublikası Elm və Təhsil Nazirliyi ümumtəhsil müəssisələrində şagird davranış qaydaları hazırlamışdır. (10) Bu qaydalarda şagirdlərin hüquq və vəzifələri aydınlaşdırılır, hansı halların mənfi davranış qaydalarına aid olduğu göstərilir və cəza tədbirləri haqqında şagirdlərə məlumat verilir. Sözügedilən sənəddə bullinq hallarına da toxunulur və bu halda hansı cəza tədbirlərinin görüləcəyi aydınlaşdırılır.

Araşdırmaların nəticəsi göstərir ki, bu kimi atılan addımlar gələcəkdə məktəblərimizdə təhlükəsiz təhsil mühitinin yaranmasında müsbət rol oynayacaq.

**Problemin aktuallığı.** Ümumtəhsil məktəblərində keyfiyyətli təhsil prosesinin təmini zamanı qarşıya bir sıra problemlər çıxır ki, bu problemlərdən biri də bullinqdir. Məqalənin aktuallığı da onun belə bir məsələyə həsr edilməsindədir.

**Problemin yeniliyi.** Məqalədə şagird şəxsiyyətinin formalaşmasına, məktəbdəki təhsil, təlim və tərbiyə mühitinin normal inkişafına mənfi təsiri olan bullinq, onun yaranma səbəbləri araşdırılmışdır.

**Problemin praktik əhəmiyyəti.** Məqalədən ümümtəhsil məktəblərinin əməkdaşları və eləcə də övladlarını bullinqdən qorumaq istəyən valideynlər yararlana bilər.

**Ədəbiyyat:**


1. Akar, Ç. P. Okul yöneticilerinin ve öğretmenlerin akran zorbalığına ilişkin tutumları ve müdahele stratejileri. -Malatya, 2013. – 172 s.
2. Rigby, K. Bullying in schools: and what to do about it. -Australia: ACER Press, -2017. -s. 28-34
3. Craig, M.W.&Pepler,J.D. Identifying andtargeting risk for involvement in bullying and victimization. -USA: CanJPsychiatry, -2003. – 582 s.
4. Olweus, D. Bullying at school. What we know and what we can do? -Norway: Blackwell Publishing, -1993. -140 s.
5. Del Rio, A. And Bauman,S. Knowledge and beliefs about bullying in schools.-Washington: DC: School Psychology International, -2005. – 442 s.
6. Kılıç, N. Ortaokul 6-7 ve 8 sınıf öğrencilerinin zorbalık düzeylerinin yordanması. (Konya ili Cihanbeyli İlçesi Örneği) 2017. -s. 38-59
7. CriadoMartinez,G. Theworld of bullying: Anoverviewand reflexion.Coolabah, Australia 2014 -s.61-73.
8. Kıral, B. və Kepenekçi Y. “Nöbetçi öğretmen uygulamasının çocuğun güvenliğini sağlamakdakı etkililiği. -Kırşehir, 2018 -s. 696-713
9. https://www.bbc.com/azeri/azerbaijan-49672783
10. https://edu.gov.az/uploads/Qaydalar/2023/sagird-davranish-qaydalari.pdf - 18 s.



**E-mail:** mammadzadagunay17@gmail.com



**Redaksiyaya daxil olub:** 16.04.2024

UOT 159.9

***Aynur Yaqub qızı Mahmudova***
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin müəllimi*
***Orcid:*** *https://orcid.org.0009 -0007- 7578 – 0992*

# YENİYETMƏNİN TƏLİM FƏALİYYƏTİNDƏ KOQNİTİV PROSESLƏRİNİN İNKİŞAFI

***Айнур Ягуб гызы Махмудова***
*преподаватель*
*Азербайджанского Государственного Педагогического Университета*

# РАЗВИТИЕ ПОЗНАВАТЕЛЬНЫХ ПРОЦЕССОВ ПОДРОСТКА В УЧЕБНОЙ ДЕЯТЕЛЬНОСТИ

***Aynur Yakub Makhmudova***
*teacher at*
*Azerbaijan State Pedagogical University*

# DEVELOPMENT OF THE ADOLESCENT'S COGNITIVE PROCESSES IN EDUCATIONAL ACTIVITIES

**Xülasə.** Təlim prosesini sadəcə olaraq yeniyetmələrə bilik, bacarıq və vərdişlərin aşılanması kimi xarakterizə etmək problemə birtərəfli yanaşılmaqla nəticələnə bilər. Əsas vəzifə ondan ibarətdir ki, müəllim təlim prosesində biliklərin mənimsənilməsinin yeniyetmə üçün nə kimi əhəmiyyət kəsb etdiyini dərindən dərk edərək izah edə bilsin. Bu əsasda təlimlə təhsilin məqsədlərinə uyğun gələn motivlərin təşəkkül və inkişafı real zəmin üzərində qurulacaqdır.

Təlimin səmərəsi onun hansı formada təşkilindən çox asılıdır. Təlim prosesində bilik, bacarıq və vərdişlərin mənimsənilməsinin özünəməxsus xüsusi şəraiti mövcuddur. Məhz belə bir zəmində təlim fəaliyyəti ilə yanaşı digər fəaliyyət növlərinin də şagirdin psixi inkişafına təsiri müəyyənləşdirilərək təhlil edilir.

***Açar sözlər:*** *idrak, fəaliyyət, qavrama, hərəki komponentlər, təlim prosesi, yeniyetməlik dövrü.*

**Резюме**. Характеризовать процесс обучения просто как передачу подросткам знаний, умений и навыков может привести к одностороннему подходу к проблеме. Основная задача – чтобы учитель умел с глубоким пониманием объяснить важность получения знаний в процессе обучения. В этом смысле на реальной основе будет строиться формирование и развитие мотивов, соответствующих целям обучения и образования.

Эффективность обучения зависит от того, как оно организовано. В процессе обучения создаются особые условия для приобретения знаний, умений и навыков. Именно на такой основе определяется и анализируется влияние других видов деятельности на умственное развитие учащихся.

***Ключевые слова:*** *. познание, деятельность, восприятие, двигательные компоненты, учебный процесс, подростковый возраст.*

**Summary.** Characterizing the training process simply as the imparting of knowledge, skills and habits to teenagers may result in a one-sided approach to the problem. The main task is for the teacher to be able to explain with a deep

understanding of the importance of acquiring knowledge in the learning process. On this basis, the formation and development of motives corresponding to the goals of training and education will be built on a real basis.

The effectiveness of training depends on how it is organized. In the training process, there are special conditions for the acquisition of knowledge, skills and habits. It is on such a basis that the influence of other types of activities on the mental development of the student is determined and analyzed.

***Key words:*** *cognition, action, perception, motor components, learning process, adolescence.*

Yeniyetməlik yaşı dövründə şagirdin qavrama fəaliyyətinin inkişafı və perseptiv fəaliyyətinin formalaşmasında təlimin rolu ön plana çəkilir. Bu məktəb təlimi prosesində şagirdlərin qavramanın inkişafında xüsusi təlim üsullarından istifadə edilməsi ilə əlaqədardır. Sensor mədəniyyətin düzgün aşılanması sayəsində şagirdlər ətraf aləm haqqında olan biliklərini dəqiqləşdirirməklə düzgün qavrama vərdişinə yiyələnirlər. Qavrama fəaliyyətinin inkişafına yönələn müxtəlif xarakterli üsul və vasitələr şagirdin əqli fəaliyyətini aktivləşdirir, onunla ətraf gerçəklik arasında mövcud olan əlaqə və asılılığın məzmununa mühüm təsir göstərir. Ümumilikdə yeniyetmənin qavrama fəaliyyətinin inkişafı onun əqli fəaliyyətinin inkişafının strukturunda həyata keçirilən bir proses kimi qiymətləndirilir. Yeniyetmənin təlim fəaliyyətinin əsasında duran tələbat və motivlərin nəzərə çarpan cəhəti özünü uşağın tədricən onu əhatə edən aləmə nəzəri münasibət bəsləməklə həmin aləmə bələdləşməyə başlamasında büruzə verir (5. s.34-37).

Prof. Ə.Ə. Əlizadəyə görə, təlim fəaliyyəti prosesində yeniyetmələrdə gerçəkliyə nəzəri münasibətin formalaşdırılması bütövlükdə təlim prosesinin özünəməxsus tələbatı və motivi kimi çıxış edir. Təlim fəaliyyətində müxtəlif xarakterli təlim məsələlərini həll edən yeniyetmə nəzəri şüurun mövcud formalarından istifadə edir. Yeniyetməlik yaşı dövründə mövcud 3 idraki inkişaf sahəsinn hər biri özü - özlüyündə qavrayışın ardıcıllığının təmin edilməsində xüsusi rola malikdir:

*Birincisi*, yeniyetmələr vəziyyətə uyğun olan bütün imkanları araşdırmaq, fərziyyələrdən və məntiqi təfəkkürdən istifadə etməklə düşünmə bacarıqlarını inkişaf etdirirlər.

*İkincisi,* yeniyetmələrdə mücərrəd düşünmə qabiliyyəti inkişaf edir. Bu yeniyetmələrə sevgi, mənəviyyat haqqında düşünmək və qavramaq imkanı verir. Konkret mütəfəkkir səviyyəsində yeniyetmə problemin həllində fiziki cəhətdən mövcud olan obyektlərə diqqətini mərkəzləşdirir.

*Üçüncüsü,* yeniyetməlik dövrünə xas olan və onlara meta-idrak haqqında düşünməyə imkan verən formal əməliyyat düşüncəsidir. Bu xüsusiyyət yeniyetmələrə hiss etdiklərini və başqalarının onları necə qəbul etdiklərini düşünmək qabiliyyətini inkişaf etdirməyə imkan verir (1. s. 68).

Təlim məsələsi ilə qarşılaşan yeniyetmə müvafiq problem şəraitinə daxil olmaqla bu və ya digər konkret məsələlərin həll olunması şərtlərinə bələdləşir, O, eyni zamanda ümumiləşmiş və konkret iş üsullarından istifadəyə fəal meyl etməyə başlayır. Ona görə də təlim məsələlərinin həllinə yönələn ümumiləşmiş və konkret təlim işlərinin müəyyənləşdirilməsi və şüurlu surətdə tətbiqi yeniyetmənin mənimsəmə fəaliyyətinin

səmərəliliyini təmin edən amillərdə əsas yer tutur.

Yeniyetmələrlə təlim prosesində növbəli, cəlbedici, fəal iş formaları, səmərəli dərslər şagirdlərin təlimə cəlb edilməsində əhəmiyyətli rol oynayır. N.F. Dobrınının tədqiqatları sübut etmişdir ki, yeniyetmələrdə iradi səylə əlaqələnmiş ixtiyari diqqət ixtiyaridən sonrakı diqqət adlandırılan diqqətin məhsuldar fəaliyyətinə təminat yaradır (6. s.5)..

Yeniyetməlik dövründə diqqətin inkişafında "maraq effekti" tam aydınlığı ilə müşahidə olunur. Şagirdin bir dərsdə həddindən artıq diqqətli, başqa bir dərsdə isə diqqətsizlik və dalğınlıq nümayiş etdirməsi daha aydın şəkildə hər şeyin iş şəraitindən, materialın məzmunundan, müəllimin pedaqoji səriştəsindən və yeniyetmənin dərsə münasibətindən asılı olduğunu göstərir. Nəzərə almaq lazımdır ki, yeniyetmə üçün maraqlı dərs sadəcə olaraq əyləncəli dərs deyildir.

R.İ. Əliyev qeyd edir ki, müəllim keçirilən hər bir dərs fəaliyyətində yeniyetmələrdə idrak maraqlarının aktivləşməsinə xüsusi diqqət yetirdikdə və yaradıcılıq üçün əlverişli şərait yaratdıqda diqqət problemi öz-özünə birbaşa həll olunur. Bu yaş dövründə diqqətin inkişafında özünəməxsus psixoloji xüsusiyyətlər və eyni zamanda diqqətin yayınması halları tez-tez müşahidə edilir. Yeniyetmənin təlim fəaliyyətindəki əsaslı dəyişikliklər, tələbat və maraq dairəsinin dəyişməsi, şagirdin ayrı-ayrı fənlərə, müəllimlərə münasibəti, keçirdiyi psixi hallar, yeni və rəngarəng təəssürat bolluğu, cinsi yetişmənin başlanması ilə əlaqədar güclü təəssüratlar, yaşlılıq hissi ilə bağlı problemlər diqqətin inkişafına, burada mənfi halların təzahürünə səbəb olur (3.s. 57 – 60).

Yeniyetməlik yaş dövründə hafizənin inkişafında şagirdin təlim fəaliyyəti mühüm rol oynayır. Sistematik təlim prosesində biliklərin mənimsənilməsi zərurəti şagirdin qısamüddətli fəaliyyəti qarşısında yeni və ciddi tələblər qoyur. Mücərrəd xarakterli təlim materiallarının mənimsənilərək yadda saxlanılması yeniyetmələrdə o qədər də çətinlik yaratmır. Öyrənilən və mənimsənilən təlim materiallarının daima mənalandırılaraq yadda saxlanılması yeniyetmənin hafizəsinin sözlü-məntiqi səciyyə daşıması üçün geniş imkanlar açır.

Təlim materialının mənalandırılması və materialın məzmununda olan səbəb-nəticə əlaqələrinin başa düşülməsi öyrənmənin səmərəliliyini təmin etməklə bərabər şagirdin hafizəsini zənginləşdirir. A.A. Smirnovun apardığı psixoloji təcrübədə şagirdlərə yadda saxlamaq üçün təklif edilən materialın ayrı-ayrı hissələrinin yeri dəyişdirilmiş və ifadə olunan məzmunun məntiqi ardıcıllığı pozulmuşdur. Şagirdlər öyrəndikləri materialları yada salaraq aktuallaşdırarkən onun real məzmununun məntiqi ardıcıllığını bərpa etməyə səy göstərmişlər. Qeyd edilən xüsusiyyət tədricən möhkəmlənir və yeniyetmənin hafizə fəaliyyətinin səciyyəvi əlamətinə çevrilir (2. s. 79)

Yeniyetmənin mənimsəmə fəaliyyətinin düzgün təşkili onun iş qabiliyyətinin səmərəli istiqamətə yönəlməsi üçün əlverişli zəmin yaradır. Ona görə də təlim prosesində yeniyetmələrin hafizə fəaliyyətinin təşkili prosesində yaddasaxlamanın düzgünlüyünə və bütövlüyünə sistematik olaraq nəzarət edilməlidir. Yaddasaxlama prosesində baş verən nöqsanlar nəzərdən qaçırılmamalı və şagirdin diqqəti onlara cəlb edilməlidir. Yaddasaxlama prosesi intellektual fəaliyyət xarakteri daşıyaraq şagirdin hafizə fəaliyyətinin

səmərəliliyini əhəmiyyətli dərəcədə artırır.

Yeniyetmənin qavrama fəaliyyətinin inkişafında nitqin ümumi və semantik səviyyəsi əsaslı mövqeyə malikdir. Nitqin inkişafı prosesində cisim, hadisə və onları ifadə edən söz arasında müvafiq funksional əlaqə yaranır. Tədricən ətraf gerçəkliyin cisim və hadisələri haqqında yaranan obrazlar müvafiq sözlərlə ifadə olunur. Təlim prosesində qavranılan hər bir obyektin şifahi adlandırılması, yazılı və daxili nitq formasında ifadəsi şagirdin qavrama fəaliyyətinin dəqiqliyinə, sistemliliyinə ciddi təsir göstərir. Nəticədə mənimsəmənin keyfiyyəti yüksək olur. Nitq fəaliyyəti ilə qavrama prosesi arasında mövcud olan funksional əlaqənin məzmunlu fonunda şagirdin mənimsəmədə qavrama qabiliyyəti yüksəlir.

Təlim prosesində təfəkkürün inkişafı yeniyetmənin əqli fəaliyyətinin inkişafına həlledici təsir göstərməklə koqnitiv proseslərinin bütöv bir sistem halında formalaşması üçün imkanlar yaranır. Təfəkkürün inkişafı çox mürəkkəb bir proses olmaqla onun təşəkkülü psixoloji faktorların fəal təsiri şəraitində reallaşır. Təfəkkürün bir fəaliyyət prosesi kimi təzahürü onun əsas xassələrinin inkişafının xarakter və məzmunu ilə şərtlənir. Yeniyetmənin təlim işlərində təfəkkürün bir əqli fəaliyyət proses kimi cərəyan etməsində cisim və hadisələrin oxşar və fərqli əlamətlərinin müqayisə edilməsi mühüm məna kəsb edir. Müşahidələr göstərir ki, ilkin olaraq müqayisədə şagirdin qavrayış və hafizə fəaliyyəti, müqayisənin təzahürü şagirdin təfəkkür fəaliyyətinin inkişafının başlıca mərhələsini təşkil edir.

Müqayisə etmək bacarığının inkişafı ilk növbədə nəzərə çarpmayan oxşar və fərqli əlamətlərin aşkara çıxarılmasında özünü göstərir. Təlim prosesində müəllimin istiqamətləndirici göstərişləri əsasında şagird öyrəndiyi cisim və hadisələrin müqayisəsinə öz əqli fəaliyyətinin konkret bir üsulu kimi yanaşır və müqayisə prosesinin imkanlarından mütəmadi istifadə etməyə çalışır. Əlverişli mənimsəmə şəraitində müqayisə prosesi şagirdin təlim fəaliyyətinin quruluşuna daxil olaraq nəzarət və özünənəzarətin funksional imkanlarını daha da gücləndirərək onların təsirliliyini artırır.

B.H. Əliyevə görə, təlim prosesində şagirdin təhlil fəaliyyətinin təşkilinə və məzmunlu istiqamətə yönəldilməsinə xüsusi diqqət yetirilməlidir. Təhlil prosesinin çoxcəhətli imkanları təlimin məzmunu və şagirdin təfəkkür imkanları ilə daima əlaqələndirilməli, bununla da cisim və hadisələrin analitik surətdə öyrənilərək mənimsənilməsi təmin edilməlidir.

Yeniyetmənin idrak fəaliyyətinin inkişaf xüsusiyyətlərinin öyrənilməsi bir daha göstərir ki, təfəkkür öz inkişafında çoxcəhətli bir yol keçir. Təfəkkürün inkişafı şagirdin idrak fəaliyyətinin formalaşmasının ümumi fonunda reallaşır. Uşağın idrak fəaliyyətinin bütöv bir sistem halında inkişafı təfəkkürün formalaşmasına güclü təkan verir. İdrak fəaliyyətinin formalaşması təfəkkürün inkişafını və onun yeni keyfiyyət mərhələlərinin təzahürünü şərtləndirir. Bu dövr mücərrəd təfəkkürün inkişafı üçün senzitiv dövr hesab olunur. Konkret və əyani-obrazlı təfəkkür öz yerini mücərrəd nəzəri təfəkkürlə dəyişir. Yeniyetmələrin təfəkkürü geniş ümumiləşdirməyə cəhd göstərməklə səciyyələnir (4, s. 50).

Yeniyetməlik yaş dövründə şagirdin təxəyyülü dərketmə prosesinə "daxil" olur və təlimin məzmununu şəxsən qəbul etməyə təminat verir. Təxəyyül əsasında həm biliklər, həm də hadisələrə emosional

münasibət də mənimsənilir. Bu dövr üçün təxəyyül əsasında təlim materiallarının böyük həcminin mənimsənilməsi xarakterik haldır. Onlar ekstremal situasiyada, qəhrəmanlıq səhnələrdə özlərini təsəvvür edir, sevimli qəhrəmanların hərəkətlərini nümunə sayırlar. Bu arzular reallıqdan azad olub konkret plan və hərəkətlərlə bağlı olmur, onlar yalnız qəhrəmanın xarici görünüşünü təqlid edirlər. İdeal obrazlar bir-birini əvəz edir, bu səylər getdikcə möhkəmlənir, şəxsi keyfiyyətlərə çevrililər. Bərpaedici təxəyyül yüksək inkişaf səviyyəsinə çatır. Romantik, fantastik surətlərin yaradılmasına meyl yüksək olur. Yaş artdıqca yeniyetmələrin təxəyyülü də dəyişilir. 14-15 yaşlarında təxəyyül surətləri daha real və daha tənqidi xarakter daşımağa başlayır. Bununla yanaşı olaraq yeniyetmələr romantik surətlərdən tam uzaqlaşa bilmirlər. Yeniyetmələrdə yaradıcı təxəyyülün inkişafı təlim materialını səmərəli və yaradıcı şəkildə mənimsəməyə imkan verir.

**Problemin aktuallığı**. Yeniyetmənin təlim fəaliyyətində koqnitiv proseslərinin inkişafının əsas təzahürlərini müəyyənləşdirmək və müasir psixologiyanın elmi-nəzəri tələbləri səviyyəsində onların psixoloji təhlilini verməklə bağlıdır.

**Problemin elmi yeniliyi.** Yeniyetmənin təlim fəaliyyətində koqnitiv proseslərinin inkişafının pedaqoji və psixoloji mahiyyətinin izahı, idrak fəaliyyətinin quruluşunda və onun perseptiv fəaliyyətinin mahiyyətini müəyyənləşdirməkdən ibarətdir.

**Problemin praktik əhəmiyyəti və tətbiqi.** Məqalədən elmi yaradıcılıq işində bu mövzu ilə maraqlananlar, pedaqoqlar, psixoloqlar, eləcə də ali və orta ixtisas məktəblərinin tələbə və magistrləri istifadə edə bilər.

**Ədəbiyyat:**


1. Əlizadə, Ə.Ə. Pedaqoji psixologiya. I kitab / Ə.Ə. Əlizadə.−Bakı: ADPU, −2010.
2. Əlizadə Ə.Ə. Müasir Azərbaycan məktəbinin psixoloji problemləri. −Bakı: Pedaqogika, −2004.
3. Əliyev R.İ. Tərbiyə psixologiyası. −Bakı: Nurlan, −2006.
4. Əliyev, B.H. Pedaqoji psixologiya: Dərslik / B.H. Əliyev. −Bakı: Təhsil, −2011.
5. Əzimli, Q.E. Yaş və pedaqoji psixologiyanın müasir problemləri: Ali məktəblər üçün tədris vəsaiti / Q.E. Əzimli. −Bakı: ADPU, −2006. −530 s.
6. Болотова, А.К. Психология развития и возрастная психология: Учебное пособие / А.К. Болотова.−М.: ИД ГУ ВШЭ, −2012.



**E-mail:** aynurmahmudova@gmail.com


**Redaksiyaya daxil olub:** 23.04.2024

*UOT 376.*

***Səriyyə Əkbər qızı İsazadə***
*Bakı Dövlət Universitetinin fəlsəfə doktoru proqramı üzrə doktorantı*
***Orcid**: 0009-0007-1144-233X*

# XÜSUSİ ÜMUMTƏHSİL İNTERNAT MƏKTƏBLƏRİNDƏ TƏRBİYƏ OLUNAN VALİDEYN HİMAYƏSİNDƏN MƏHRUM OLMUŞ YENİYETMƏLƏRİN ÜNSİYYƏTDƏ KOMMUNİKATİV ÇƏTİNLİKLƏRİ

***Сария Акбар гызы Исазаде***
*докторант по программе доктора философии Бакинского Государственного Университета*

# КОММУНИКАТИВНЫЕ ТРУДНОСТИ ПОДРОСТКОВ, ЛИШЕННЫХ РОДИТЕЛЬСКОЙ ОПЕКИ, ВОСПИТЫВАЮЩИХСЯ В СПЕЦИАЛЬНЫХ ОБЩЕОБРАЗОВАТЕЛЬНЫХ ШКОЛАХ-ИНТЕРНАТАХ

***Sariyya Akbar Isazade***
*doctoral student in the program of doctor of philosophy at Baku State University*

# COMMUNICATIVE DIFFICULTIES OF ADOLESCENTS DEPRIVED OF PARENTAL CARE AND BROUGHT UP IN SPECIAL BOARDING SCHOOLS

**Xülasə.** Elmi məqalədə internat tipli uşaq müəssisələrində tərbiyə olunan, valideyn himayəsindən məhrum olmuş ünsiyyətdə kommunikativ çətinliyi olan yeniyetmələrin psixoloji xüsusiyyətləri ardıcıllıqla şərh edilmişdir. Psixi məhrumiyyət şəraitində yeniyetmələrdə müşahidə olunan ünsiyyət pozuntuları ardıcıllıqla göstərilmişdir. Məqalədə qeyd edilir ki, yeniyetmənin valideyn məhəbbətinə olan ehtiyaclarından məhrum olmasının ciddi nəticəsi həm də ontogenezin erkən mərhələlərində yaranaraq xüsusi ümumtəhsil internat məktəblərində yeniyetmənin şəxsiyyətinin sabit xüsusiyyətinə çevrilən özünəinam hissinin olmamasıdır. Məqalədə eksperiment qrupla nəzarət qruplarında yeniyetmələrin kommunikativ çətinlikləri müqayisəli şəkildə araşdırılmışdır.

***Açar sözlər:*** *xüsusi ümumtəhsil internat məktəbləri, valideyn himayəsindən məhrum olmuş yeniyetmələr, kommunikativ çətinliklər, ünsiyyət pozuntuları, refleksiya*

**Резюме.** В научной статье последовательно интерпретированы психологические особенности подростков с трудностями в общении, воспитывающихся в детских учреждениях интернатного типа и лишенных родительской опеки. Последовательно показаны нарушения общения, наблюдаемые у подростков в условиях психической депривации. В статье отмечается, что тяжелым последствием отсутствия родительской любви у подростка является неуверенность в себе, которая возникает на ранних этапах онтогенеза и становится устойчивой чертой личности подростка в специальных

школах-интернатах. В сравнительном порядке исследовались коммуникативные трудности подростков экспериментальной и контрольной групп.
***Ключевые слова:*** *специальные общеобразовательные школы-интернаты, подростки, лишенные родительской опеки, трудности общения, нарушения общения, рефлексия*

**Summary.** The scientific article consistently interprets the psychological characteristics of adolescents with communication difficulties, brought up in residential care institutions and deprived of parental care. Communication disorders observed in adolescents under conditions of mental deprivation are consistently shown. The article notes that a serious consequence of the lack of parental love in a teenager is self-doubt, which arises in the early stages of ontogenesis and becomes a stable personality trait of a teenager in special boarding schools. The communicative difficulties of adolescents in the experimental and control groups were studied comparatively.
***Key words:*** *special boarding schools, adolescents deprived of parental care, communication difficulties, communication disorders, reflection.*

Xüsusi ümumtəhsil internat məktəblərində tərbiyə olunan valideyn himayəsindən məhrum olmuş yeniyetmələrin həmyaşıdları ilə ünsiyyətinin intim və şəxsi tərəfinə kifayət qədər diqqət yetirilmir. Bununla bağlı İ.V. Dubrovina qeyd edir ki, həmyaşıdları ilə dostluq münasibətləri qura bilməmək belə yeniyetmələrin anomal inkişafının təzahürü ola bilər. Ünsiyyətin intim və şəxsi tərəfinə diqqət yetirilməməsi xüsusi ümumtəhsil internat məktəblərində yalnız az sayda yeniyetmənin digər insanları anlamaqla bağlı çətinlikləri barədə danışması ilə sübut olunur. Belə bir anlayış mahiyyətcə ünsiyyətin ən mürəkkəb aspektlərindən biri olmaqla başqa bir insanın daxili dünyasının xüsusiyyətlərinin və onun çoxşaxəliliyinin tanınmasını, ona bir şəxsiyyət kimi marağını nəzərdə tutur.

Xüsusi ümumtəhsil internat məktəblərində tərbiyə olunan valideyn himayəsindən məhrum olmuş şagirdlərdə emosional təmas ehtiyacının normal inkişafı pozulur. Mövcud məlumatlara görə, erkən yaşlarda emosional təmasların normal inkişafının pozulması bir insanın bütün ömrü boyu ünsiyyətində əhəmiyyətli deformasiyalara səbəb ola bilər. Burada uşaqlar daim kifayət qədər dar bir qrup həmyaşıdları ilə ünsiyyət vəziyyətində olur, buna görə də seçicilik onlar üçün arxa plana keçir, həmyaşıdları ilə təmasların sabit, qaçılmaz kimi qəbul edilməsinə yol verir ki, yeniyetmə öz iradəsi ilə bunu dəyişə bilməz. Əgər ailədə böyüyən yeniyetmələrin öz imici üçün ən əhəmiyyətlisi, öz davranışlarının normaya, öz üstünlüklərinə - böyüklərin tələblərinə qarşı çıxmaqdırsa, xüsusi ümumtəhsil internat məktəblərində böyüyən şagirdlərin öz imici üçün situasiyaya məharətlə uyğunlaşmaq, böyüklərin tələblərindən yan keçmək, onlar tərəfindən heç bir sanksiyalara məruz qalmamaq bacarığı önəmlidir.

Yeniyetmələrin “Mən" imicində bir fərd kimi başqa bir insana münasibətdə özünün fikri əhəmiyyətli yer tutur. Xüsusi ümumtəhsil internat məktəbinin şagirdləri arasında ünsiyyətin müzakirə olunan aspekti inkişaf etməmiş kimi görünür, bu qismən uşaqlar və onların həmyaşıdları arasında ünsiyyətin xüsusi şərtləri ilə əlaqədar ola bilər. Məktəbdə həmyaşıdlar arasında münasibətlər seçici xarakter daşıyır. Yeniyetmə həmyaşıdları üçün dosta sahib olmaq,

özünüqiymətləndirmə üçün vacib parametr, öz dəyərinin göstəricisidir. Bütün bunlar dostluğa, digər insanlar üçün vacib olan şəxsi keyfiyyətlərə artan diqqəti stimullaşdırır.

Ailədə böyüyən uşağın ona qarşı aydın ifadə olunmuş emosional münasibəti çox vaxt müsbətdir. Belə uşaq qiymətləndirmələrdən (həm ətrafdakıların, həm də özünün) asılı olmayaraq özünü qəbul edir və sevir. Xüsusi ümumtəhsil internat məktəblərində tərbiyə olunan valideyn himayəsindən məhrum olmuş yeniyetmə ilk növbədə özünü qiymətləndirir, lakin özünə qarşı emosional münasibəti (özünü sevməsi və ya hətta bəyənməməsi) praktiki olaraq ifadə edilmir. Yeniyetmənin valideyn məhəbbətinə olan ehtiyaclarından məhrum olmasının ciddi nəticəsi həm də ontogenezin erkən mərhələlərində yaranaraq xüsusi ümumtəhsil internat məktəblərində yeniyetmənin şəxsiyyətinin sabit xüsusiyyətinə çevrilən özünəinam hissinin olmamasıdır. Xüsusi ümumtəhsil internat məktəblərində tərbiyə olunan valideyn himayəsindən məhrum olmuş yeniyetmələr böyüklər və həmyaşıdları ilə problemləri həll etməkdə adi məktəb şagirdlərinə nisbətən daha az uğur qazanırlar. Onların davranışı aqressivlik, başqalarını günahlandırmaq istəyi, öz təqsirini etiraf etmək iqtidarında olmamaq və istəməmək, müvafiq olaraq münaqişənin konstruktiv həllinin mümkünsüzlüyü ilə xarakterizə olunur. Bu şəraitdə rədd edilmiş və təhqir olunmuş uşaqların problemi olduqca tez-tez yaranır, xüsusilə də yeniyetməlik yaş dövründə belə vəziyyət daha da ağırlaşır, çünki bu dövrdə aparıcı fəaliyyət şəxsiyyətlərarası ünsiyyətdir.

Yeniyetmələr özlərini təsdiq etməyə, həmyaşıdları arasında möhkəm mövqe tutmağa və onlarla öz ünsiyyət tərzini tapmağa çalışırlar. Onun ünsiyyətdə əhəmiyyətini və səriştəsini hiss etməyin ən asan yollarından biri, buna dərhal reaksiya verən və yeniyetmənin gözləntilərinə tam uyğun gələn bir insanı incitmək, sataşmaqdır. Bu yaş dövründə psixi məhrumiyyət şəraitində yeniyetmələrdə ünsiyyət pozuntuları müşahidə olunur: həmyaşıdları ilə ünsiyyətin intim və şəxsi tərəfinə kifayət qədər diqqət yetirməmək, xarici mühitə daha çox diqqət yetirmək, vəziyyətə uyğunlaşma, şəxsiyyət və yaş xüsusiyyətlərinin aspektləri, qapalılıq, davranışın sosial tənzimlənməsinin pozulması, refleksiyanın aşağı düşməsi, özünəinamsızlıq, aqressivlik, münaqişələri konstruktiv yolla həll edə bilməmək.

Xarakterin aksentuasiyası təzahür edir və sosial adaptasiya tez-tez pozulur. Beləliklə, xüsusi ümumtəhsil internat məktəblərində tərbiyə olunan valideyn himayəsindən məhrum olmuş yeniyetmələr arasında ünsiyyətin inkişafı probleminin psixoloji təhlili göstərdi ki, ağır və uzunmüddətli sosial məhrumiyyətlər yeniyetmənin psixi strukturunda dərin dəyişikliklərə səbəb olur. Üstəlik, affektiv-ehtiyac sferalarının inkişafında və internat tipli uşaq müəssisələrində böyüyən uşaqların davranış xüsusiyyətlərində müəyyən bir spesifiklik üzə çıxır ki, bu da psixi inkişafda sadə geriləmə kimi deyil, keyfiyyətcə fərqli xarakter kimi qiymətləndirilməlidir.

Eksperimental qrupunu təşkil edən yeniyetmələrdə müxtəlif ünsiyyət pozuntuları müşahidə olunur. Belə ki, onların əksəriyyətində bu və ya digər ünsiyyət sahəsi pozulmuş olur: bəziləri dinləməyi bacarmır, bəziləri kifayət qədər ünsiyyətcil deyillər, digərlərində isə kommunikativ qabiliyyətlər aşağı səviyyədədir. Bununla əlaqədar olaraq bu çatışmazlıqları ümumiləşdirərək şərti olaraq bu qrupu - ünsiyyətdə

kommunikativ çətinlikləri olan yeniyetmələr adlandırdıq. Bu qrupda aşağıdakı xüsusiyyətlər müşahidə olunur: emosional fon bir qədər qeyri-sabitdir, tərəddüdlərə məruz qalır, eyni zamanda onlarda "kədərli" fon üstünlük təşkil edir. Nəzarət qrupundakı yeniyetmələr eksperimental qrupla müqayisədə əhəmiyyətli dərəcədə daha çox ünsiyyətdə kommunikativ labillik nümayiş etdirirlər. Eyni zamanda onlara başqasının "mən" ini özününkü kimi ötürmək daha asandır. Apardığımız təhlil əsasında kommunikativ inkişaf səviyyəsinə görə fərqlənən iki yeniyetmə qrupu müəyyən edilmişdir: 1/ ünsiyyətdə kommunikativ çətinliyi olan yeniyetmələr; 2/yaşa uyğun kommunikativ inkişaf səviyyəsi olan yeniyetmələr.

Ünsiyyətdə kommunikativ çətinliyi olan yeniyetmələrdə əhval-ruhiyyədə tsiklik dəyişikliklər, aşağı fonun dominantlığı, pessimistlik, kədər, qorxaqlıq, özünəinamsızlıq, yüksək həyəcanlılıq, uzunmüddətli uğursuzluqlar, praktiki olaraq diqqət mərkəzində olub məqsədlərinə çatmaq istəyinin olmaması halları müşahidə edilmişdir. Yeniyetmələr nadir hallarda münaqişələrə girirlər və onları idarə etməkdənsə, onları aradan qaldırmağa daha çox meyllidirlər. Nəzarət qrupundakı yeniyetmələr, əksinə, emosional vəziyyətlərin geniş diapazonu, iradlara və uğursuzluqlara həddindən artıq həssaslıq, xarici hadisələrə artan diqqəti yayındırma, müstəqillik, diqqət mərkəzində olmaq və məqsədlərinə çatmaq arzusu ilə fərqlənirlər.

Ünsiyyətdə kommunikativ çətinlikləri olan yeniyetmələrin böyük əksəriyyəti şəxsiyyətlərarası münasibətlərdə eqoizm, avtoritarlıq nümayiş etdirdiklərinə görə çoxlu sayda çətinliklər yaşayırlar. Ünsiyyətdə kommunikativ çətinlikləri olan yeniyetmələr aşağıdakılarla xarakterizə olunur: onlarda qapalılıq, susqunluq halları mütəmadi olaraq müşahidə edilir, uzunmüddətli yeni əlaqələrdən uzaqlaşırlar, tez-tez özlərindən narazı olurlar, hər hansı bir səbəbdən narahat olur, uzun müddət travmatik hadisələr yaşayırlar, hətta qorxulara və dövri əhval-ruhiyyələrə meyllidirlər. Odur ki, belə yeniyetmələrlə uzunmüddətli korreksiya işlərinin aparması zəruridir.

**Problemin aktuallığı.** Elmi məqalədə xüsusi ümumtəhsil internat məktəblərində tərbiyə olunan valideyn himayəsindən məhrum olmuş yeniyetmələrin ünsiyyətində kommunikativ çətinlikləri, onların xüsusiyyətləri ardıcıllıqla şərh edilmişdir. Psixi məhrumiyyət şəraitində yeniyetmələrdə müşahidə olunan ünsiyyət pozuntuları ardıcıllıqla göstərilmişdir.

**Problemin elmi yeniliyi.** Məqalədə valideyn himayəsindən məhrum olmuş yeniyetmələrin ünsiyyətdə kommunikativ çətinlikləri ardıcıllıqla araşdırılmış, çətinliklərin səbəbləri müəyyən edilmişdir.

**Problemin praktik əhəmiyyəti.** Məqalədən ali və orta ixtisas məktəblərinin müəllimləri, tələbələr, magistrantlar və doktorantlar istifadə edə bilərlər.

**Ədəbiyyat:**

1. Волкова, Л.А. Криминальная ситуация в детерминации преступного поведения несовершеннолетних / Л.А. Волкова // Российский психологический журнал. – 2011 – том 8. – №2. – С. 42 – 45.
2. Родионова, В.И. О социальной работе с неблагополучными семьями / В.И. Родионова, О.В. Юдина, Д.Б. Бохаев // Социально-экономические и политические процессы в современном обществе: международный сборник научных трудов. – Новочеркасск: ЮРГТУ (НПИ), –2016. – С. 150 –152.5.
3. Швачкина, Л.А. Опыт социальной работы с неблагополучными семьями и детьми «группы риска» на примере города Каменск-Шахтинский Ростовской области / Л.А. Швачкина // Современная наука: теоретический и практический взгляд: сборник статей международной научно-практической конференции. –2015. – с. 237 – 241.

**E-mail:** seris.isazade@gmail.com
**Redaksiyaya daxil olub:** 16.04.2024

*UOT 376*

***Nailə Tofiq qızı Hüseynova***
*pedaqogika elmləri doktoru*
*Azərbaycan Dövlət Pedaqoji Universiteti*
***Orcid**: https://orcid.org/0000-0001-6353-5588*

## İNKLÜZİV PEDAQOGİKANIN TƏŞVİQİ: MÜXTƏLİF SİNİFLƏRDƏ DİFFERENSİAL TƏLİMİN EFFEKTİVLİYİNİN TƏDQİQİ

***Наиля Тофиг гызы Гусейнова***
*доктор педагогических наук*
*Азербайджанский Государственный Педагогический Университет*

## ПРОДВИЖЕНИЕ ИНКЛЮЗИВНОЙ ПЕДАГОГИКИ: ИССЛЕДОВАНИЕ ЭФФЕКТИВНОСТИ ДИФФЕРЕНЦИРОВАННОГО ОБУЧЕНИЯ В РАЗНЫХ КЛАССАХ

***Naila Tofig Huseynova***
*doctor of pedagogical sciences*
*Azerbaijan State Pedagogical University*

## PROMOTING INCLUSIVE PEDAGOGY: EXPLORING THE EFFECTIVENESS OF DIFFERENTIATED INSTRUCTION IN DIVERSE CLASSROOMS

**Xülasə.** Bu məqalə şagird müxtəlifliyi ilə xarakterizə olunan siniflərdə inklüziv pedaqoji təcrübələri təşviq etmək strategiyası kimi diferensiallaşdırılmış təlimin (DT) effektivliyini araşdırır. Bu cür parametrlər daxilində müxtəlif öyrənmə üslublarını, maraqlarını və hazırlıq səviyyələrini tanıyaraq, məqalə DT-in necə həyata keçirilə biləcəyini araşdırır. Bu, daha çox, dərs dizaynında məzmun, proses və məhsul üzrə təlimatın fərqləndirilməsinin müzakirəsini əhatə edir. Məqalədə, müxtəlif mənşəli və qabiliyyətli şagirdlər arasında akademik nailiyyətlərin və əlaqənin təşviqində DT-nin effektivliyinə dair mövcud araşdırmalar nəzərdən keçirilir. DT potensialını və məhdudiyyətlərini tənqidi şəkildə araşdıraraq, məqalə sinif daxilində bütün şagirdlərə fayda verən inklüziv öyrənmə mühitlərinin təşviqi ilə bağlı davam edən müzakirəyə töhfə vermək məqsədi daşıyır.

***Açar sözlər:** İnklüziv pedaqogika, diferensiallaşdırılmış təlim, müxtəlif sinif otaqları, Universal Öyrənmə Dizaynı (UÖD), öyrənmə üslubları*

**Резюме.** В этой статье исследуется эффективность дифференцированного обучения (ДО) как стратегии продвижения инклюзивной педагогической практики в классах, характеризующихся многообразием учащихся. Признавая различные стили обучения, интересы и уровни готовности в таких условиях, в статье исследуется, как можно реализовать ДО. Вероятно, это предполагает обсуждение дифференциации инструкций по содержанию, процессу и продукту при разработке урока. В статье, вероятно, рассматриваются существующие исследования эффективности ДО в продвижении академических достижений и

вовлеченности студентов с различным опытом и способностями. Критически рассматривая потенциал и ограничения ДО, статья призвана внести свой вклад в продолжающийся дискурс о создании инклюзивной среды обучения, приносящей пользу всем учащимся в классе.

***Ключевые слова:*** *инклюзивная педагогика, дифференцированное обучение, разнообразные классы, универсальный дизайн обучения (УДО), стили обучения*

**Summary.** This article investigates the efficacy of differentiated instruction (DI) as a strategy to promote inclusive pedagogical practices in classrooms characterized by student diversity. Recognizing the varied learning styles, interests, and readiness levels within such settings, the article explores how DI can be implemented. This likely involves a discussion of differentiating instruction across content, process, and product in lesson design. The article likely reviews existing research on the effectiveness of DI in promoting academic achievement and engagement among students with diverse backgrounds and abilities. By critically examining the potential and limitations of DI, the article aims to contribute to the ongoing discourse on fostering inclusive learning environments that benefit all students within a classroom.

***Key words:*** *Inclusive pedagogy, differentiated instruction, diverse classrooms, Universal Design for Learning (UDL), learning styles*

**Aktuallıq.** Məktəbə daxil olmağa ümumi diqqəti 1994-cü ildə hazırlanmış Salamanka Bəyannaməsi və Xüsusi Ehtiyaclı Təhsil üzrə Fəaliyyət Çərçivəsinə (UNESCO Citation1994) aid edilir. Salamanka sənədində hər bir şagirdin daxil olduğu institutları tanıyan, müxtəlifliyi aktiv kimi vurğulayan, öyrənməni dəstəkləyən və fərdi ehtiyaclara cavab verən normativ prinsiplər təqdim olunur (UNESCO Citation1994, Citation2020). Salamankadan kənarda, üzv dövlətlərdə və bəyanatı imzalayan təşkilatlarda, siyasətdə, tədqiqat və təhsil təşkilatlarında inklüziv təhsilə maraq artıb. Bununla belə, inklüziv təcrübənin konsepsiyası və inkişafının başa düşülməsi və tərifi müxtəlif ölkələrdə və ölkələr arasında fərqlidir və inklüziv təhsilin tədqiqini inklüzivliyin nə olduğunu və ona necə nail oluna biləcəyini anlamaq üçün daha vacib edirş. Son zamanlar bir neçə məktəb inklüzivlik konsepsiyası ilə bağlı sistematik rəylər hazırlayıb və qeyd ediblər ki, inklüziv təhsilin tərifi nəzəri yanaşmalar arasında fərqlənir. Bəziləri inklüzivliyin əsas konsepsiyasının yalnız insanların xüsusi qruplarına və ya kateqoriyalarına aid olduğuna inanır, digərləri isə inklüzivliyin hər kəsi əhatə etdiyini müdafiə edir.

Təhsil mənzərəsi şagird müxtəlifliyində artım yaşayır. Etnik mənsubiyyət, dil bilikləri, öyrənmə üslubları və akademik qabiliyyətlər baxımından sinif otaqları getdikcə heterojen olur (Ainscow, 2014; Villegas & Valencia, 2008). Bu dəyişiklik bu müxtəlif ehtiyaclara cavab verən pedaqoji yanaşmaları zəruri edir. Diferensiallaşdırılmış təlim (DT) bu kontekstdə həlledici strategiya kimi ortaya çıxır. DT müəllimlərə təlimatı fərdi şagirdlərə uyğunlaşdırmağa imkan verir, bütün şagirdlərin effektiv şəkildə etiraz edilməsini və dəstəklənməsini təmin edir (Tomlinson, 2017).

Bundan əlavə, bərabərlik və inklüzivlik anlayışları təhsil siyasəti və diskursunda ön plandadır. Təhsildə bərabərlik, mənşəyindən asılı olmayaraq, bütün şagirdlərə uğur qazanmaq üçün bərabər imkanlar təqdim etməyi hədəfləyir (Darling-Hammond, 2010). İnklüziv təhsil bütün şagirdlərin dəyərli olduqlarını

və dəstəkləndiklərini hiss etdikləri öyrənmə mühitinin yaradılmasını vurğulayır (Florian, 2008). DT fərdi ehtiyaclara və öyrənmə üslublarına cavab verən inklüziv sinif otaqlarını inkişaf etdirməklə bu məqsədlərə birbaşa uyğun gəlir.

DT tədqiqat sahəsi dinamik olaraq qalır. Pedaqoqlar və tədqiqatçılar davamlı olaraq təlimi fərqləndirmək üçün yeni və effektiv yollar axtarırlar. Son tədqiqatlar müxtəlif sinif otaqlarında DT-nin şagird cəlbinə, akademik nailiyyətlərə və sosial-emosional öyrənməyə təsirini araşdırıb (Gervietti & Hooper, 2016; Lenz & Deshler, 2017). Davam edən bu tədqiqat DT-nin effektivliyinə dair dəyərli fikirlər təqdim edir və inklüziv pedaqogikada ən yaxşı təcrübələri məlumatlandırır.

Nəhayət, pedaqoqlar müxtəlif şagirdlərin ehtiyaclarını ödəmək üçün daim praktiki və həyata keçirilə bilən strategiyalar axtarırlar. Bu məqalədə daha çox, dərslərdə məzmunu, prosesi və məhsulu fərqləndirmək üçün xüsusi yanaşmalar araşdırılır (Tomlinson, 2001). Müəllimləri DT-nin tətbiqi üçün praktiki vasitələrlə təmin etmək onun siniflərdə uğurlu tətbiqi üçün çox vacibdir.

**Elmi yenilik.** Diferensiallaşdırılmış təlimat (DT) sinif daxilində şagirdlərin fərdi ehtiyaclarını ödəmək üçün təlimatı uyğunlaşdıran təhsil çərçivəsidir (Tomlinson, 2017). O qəbul edir ki, şagirdlər müxtəlif templərdə öyrənirlər, müxtəlif öyrənmə üslublarına malikdirlər və müxtəlif əvvəlki biliklərə malikdirlər. DT üç əsas aspekt üzrə təlimatı fərqləndirməklə müəllimlərə bu boşluqları aradan qaldırmağa imkan verir:

**Məzmun.** Təqdim olunan məlumat və ya anlayışlar çətinlik, dərinlik və ya formatda düzəldilə bilər. Bu, səviyyəli tapşırıqların təklif edilməsini, mübarizə aparan şagirdlər üçün əlavə resursların təmin edilməsini və ya qabaqcıl öyrənənlər üçün zənginləşdirmə fəaliyyətlərinin tətbiqini əhatə edə bilər (Tomlinson, 2001).

**Proses.** Şagirdlərin məzmuna daxil olma və onunla əlaqə qurma üsulları müxtəlif ola bilər. Buraya müxtəlif öyrənmə fəaliyyətləri, qrup işi variantları və müxtəlif öyrənmə üslublarına uyğun gələn təlimat strategiyaları təklif olunur (Gervietti & Hooper, 2016). Kinestetik öyrənənlər praktiki fəaliyyətlərdən faydalana bilər, eşitmə öyrənənlər isə audio mühazirələr və ya podkastlarla üstün ola bilərlər.

**Məhsul.** Şagirdlərin öyrənmələrini nümayiş etdirmə üsulu uyğunlaşdırıla bilər. Bu, müxtəlif güclü tərəflərə və üstünlüklərə cavab vermək üçün tapşırıqlarda, təqdimatlarda və ya layihələrdə seçim təklif etməyi əhatə edə bilər (Tomlinson, 2001). Məsələn, bəzi şagirdlər yazı vasitəsilə özlərini ifadə etməkdə üstün ola bilər, digərləri isə yaradıcı layihə vasitəsilə öz anlayışlarını nümayiş etdirə bilərlər.

Tədqiqat müxtəlif siniflərdə müsbət təlim nəticələrinin təşviqində DT-nin effektivliyini dəstəkləyir (Gervietti & Hooper, 2016; Lenz & Deshler, 2017). Burada bəzi əsas faydalar var:

**Şagirdlərin fəallığının artması**. Şagirdlərə lazımi şəkildə etiraz edildikdə və təlimat onların maraqlarına və öyrənmə üslublarına uyğunlaşdıqda, onların motivasiya və öyrənmə prosesində iştirak etmə ehtimalı daha yüksəkdir (Tomlinson, 2017).

**Təkmilləşdirilmiş akademik nailiyyət.** Təlimin fərdi ehtiyaclara uyğunlaşdırılması bütün şagirdlər üçün materialın daha dərindən başa

düşülməsinə və saxlanmasına səbəb ola bilər (Lenz & Deshler, 2017).

**Təlimdə geri qalan şagirdlərə dəstək.** Məqsədli dəstək və zənginləşdirmə imkanları təmin etməklə, DT müxtəlif qabiliyyətləri olan şagirdlər arasında nailiyyət fərqini aradan qaldırmağa kömək edə bilər (Tomlinson, 2001).

**Təkmilləşdirilmiş sosial-emosional öyrənmə.** Fərqləndirilmiş sinif bütün şagirdlərin özlərini dəyərli, dəstəkləndiyini və iştirak etmək səlahiyyətinə malik olduqlarını hiss etdikləri daha inklüziv öyrənmə mühitini təşviq edir (Gervietti & Hooper, 2016).

DT pedaqoqlar üçün güclü alət təqdim etsə də, onun effektiv şəkildə həyata keçirilməsi diqqətli planlaşdırma və bəzi problemlərin nəzərə alınmasını tələb edir:

**Planlaşdırma və vaxt məhdudiyyətləri.** Fərqli dərslərin yaradılması diqqətli planlaşdırma tələb edir və müəllimlər üçün, xüsusən də siniflərin böyük ölçüləri və ya məhdud resursları ilə məşğul olduqda vaxt apara bilər (Tomlinson, 2017).

**Qiymətləndirmə.** Şagirdlərin diferensiallaşdırılmış sinifdə öyrənmələrinin qiymətləndirilməsi davamlı formativ qiymətləndirmə və müxtəlif öyrənmə üslublarına və məhsullarına uyğunlaşmaq üçün qiymətləndirmə strategiyalarının uyğunlaşdırılmasını tələb edir (Tomlinson, 2001).

**Peşəkar İnkişaf:** DT strategiyalarının uğurla həyata keçirilməsi çox vaxt müəllimlərdən lazımi bacarıq və bilikləri inkişaf etdirmək üçün davamlı peşəkar inkişaf tələb edir (Tomlinson, 2017).

Nəticə olaraq, diferensiallaşdırılmış təlimat (DT) müxtəlif siniflərdə təhsil verən müəllimlər üçün dəyərli çərçivə təklif edir. Çətinliklər mövcud olsa da, DT-nin bütün şagirdlər üçün əlaqə, nailiyyət və müsbət öyrənmə mühitinin təşviqində potensial faydaları onu araşdırmaq və həyata keçirmək üçün dəyərli bir yanaşma halına gətirir. Planlaşdırma məhdudiyyətlərini aradan qaldırmaq, yeni qiymətləndirmə strategiyaları hazırlamaq və peşəkar inkişafa sərmayə qoymaqla müəllimlər bütün şagirdlərin inkişaf edə biləcəyi həqiqətən inklüziv sinif otaqları yarada bilərlər.

**Problemin praktik əhəmiyyəti.** Diferensiallaşdırılmış təlim (DT) haqqında məqalə bugünkü müxtəlif siniflərdə işləyən müəllimlər üçün əhəmiyyətli praktik əhəmiyyətə malikdir. Bunun səbəbi aşağıdakılardır:

**Bütün şagirdlərin ehtiyaclarına cavab verir.** Ənənəvi, hər kəsə uyğun olan təlimat bir çox şagirdi geridə qoya bilər. DT sinifdəki bütün şagirdlərin fərdi ehtiyaclarına, öyrənmə üslublarına və qabiliyyətlərinə cavab vermək üçün təlimatların hazırlanması üçün praktiki çərçivə təqdim edir (Ainscow, 2014).

**Artan iştirak və motivasiya.** Fərqli məzmun, proses və məhsul seçimləri təklif etməklə, DT şagirdləri məşğul və motivasiyalı saxlayır. Şagirdlər daha pozitiv və məhsuldar öyrənmə mühitinə gətirib çıxaran müvafiq şəkildə meydan oxuyurlar (Tomlinson, 2017).

**Təkmilləşdirilmiş akademik nailiyyət.** Məqalədə göstərilən tədqiqat (Gervietti & Hooper, 2016; Lenz & Deshler, 2017) DT-nin bütün şagirdlər üçün təkmilləşdirilmiş akademik nailiyyətlərə səbəb ola biləcəyini göstərir. Təlimat fərdi ehtiyaclara uyğunlaşdıqda, şagirdlər anlayışları qavramaq və məlumatı saxlamaq ehtimalı daha yüksəkdir.

**Nailiyyət fərqlərinin tənzimlənməsi**. DT müxtəlif qabiliyyətləri olan şagirdlər arasında nailiyyət fərqini aradan qaldırmaq üçün praktiki yanaşma təklif edir. Məqsədli dəstək və zənginləşdirmə imkanları bütün şagirdlərin tam potensialına çatmasına kömək edə bilər (Tomlinson, 2001).

**İnklüziv öyrənmə mühitlərini təşviq edir.** Bütün şagirdlərin keçmişindən və bacarığından asılı olmayaraq dəyərli və dəstəkləndiklərini hiss etdikləri sinif otağı yaratmaqla, DT aidiyyət hissini təşviq edir və bütün şagirdlərə fəal iştirak etmək imkanı verir (Gervietti & Hooper, 2016).

**Müəllimlər üçün praktik strategiyalar:**

Məqalədə xüsusi strategiyalar araşdırılmır, lakin burada müəllimlərin DT-ni həyata keçirmək üçün ata biləcəyi bəzi praktik addımlar var:

**Şagirdlərinizi tanıyın.** Fərdi öyrənmə üslublarını, maraqlarını və güclü tərəflərini formativ qiymətləndirmə vasitəsilə dərk etmək effektiv fərqləndirmə üçün çox vacibdir.

Səviyyəli fəaliyyətlər və tapşırıqlar: Bir sıra öyrənənlərə xidmət etmək üçün fəaliyyətlər və tapşırıqlar daxilində müxtəlif çətinlik və mürəkkəblik səviyyələrini təklif edin.

**Seçim lövhələri.** Şagirdlərə öyrəndiklərini necə nümayiş etdirmələri ilə bağlı seçimlər təqdim edin, onlara güclü və üstünlüklərini nümayiş etdirməyə imkan verin.

**Tədris mərkəzləri.** Müxtəlif ehtiyacları ödəmək üçün fərqli fəaliyyətlər və materiallarla sinif daxilində təyin olunmuş yerlər yaradın.

**Çevik qruplaşdırma.** Dərs və şagird ehtiyaclarına əsasən kiçik qrup işindən, heterojen qruplaşmalardan və müstəqil öyrənmə imkanlarından istifadə edin.

**Ədəbiyyat:**


1. Ainscow, M. (2014). How schools promote inclusion: Understanding and overcoming barriers to learning and participation. Routledge.
2. Darling-Hammond, L. (2010). The flat world and education: How America's commitment to equity will determine our future. Teachers College Press.
3. Florian, L. (2008). Key characteristics of inclusive pedagogy. Educational Research, 49(3), 275-288.
4. Gervietti, S., & Hooper, M. (2016). Differentiated instruction for social-emotional learning and well-being. SAGE Publications.

5. Lenz, K. M., & Deshler, D. D. (2017). Teaching adolescents with learning disabilities: Strategies for secondary classrooms. Guilford Publications.
6. Tomlinson, C. A. (2001). How to differentiate instruction in mixed-ability classrooms. ASCD.
7. Tomlinson, C. A. (2017). How to differentiate instruction in academically diverse classrooms. ASCD.
8. Villegas, A. M., & Valencia, R. R. (2008). Educating Latino students for the 21st century. Teachers College Press.

**E-mail:** nailyahuseyn72@gmail.com
**Redaksiyaya daxil olub:** 16.04.2024

*UOT 376.*

***Səbinə Ramiz qızı Aslanova***
*pedaqogika üzrə fəlsəfə doktoru*
*Azərbaycan Dövlət Pedaqoji Universiteti*
*Orcid - 0009-0001-4052-1631*

## SEREBRAL İFLİC ZAMANI NİTQ POZULMALARININ KORREKSİYASI

***Сабина Рамиз гызы Асланова***
*доктор философии по педагогике*
*Азербайджанский Государственный Педагогический Университет*

## КОРРЕКЦИЯ РЕЧЕВЫХ НАРУШЕНИЙ ПРИ ДЕТСКОМ ЦЕРЕБРАЛЬНОМ ПАРАЛИЧЕ

***Sabina Ramiz Aslanova***
*doctor of philosophy in pedagogy*
*Azerbaijan State Pedagogical University*

## CORRECTION OF SPEECH DISORDERS DURING CEREBRAL PALSY

**Xülasə.** Serebral iflic olan uşaqlarda pozulmaların kompleks strukturunda nitq pozulmaları əhəmiyyətli yer tutur. Nitq pozulmalarının xüsusiyyətləri və onların şiddətinin dərəcəsi ilk növbədə beyin zədələnməsinin lokalizasiyası və şiddətindən asılıdır. Serebral iflic zamanı nitq pozulmaları təkcə beyinin müəyyən strukturlarının zədələnməsinə deyil, həm də beyin qabığının nitq və zehni fəaliyyətdə mühüm əhəmiyyət kəsb edən hissələrinin sonradan formalaşması və ya inkişaf etməməsi ilə bağlıdır. Serebral iflicdə nitqin inkişafındakı geriləmə həm də ətraf mühit haqqında bilik və fikirlərin həcminin məhdudlaşdırılması, maddi və praktik fəaliyyətin və sosial əlaqələrin qeyri-adekvatlığı ilə əlaqələndirilir. Valideynlər tərəfindən edilən valideyn səhvləri nitqin inkişafına mənfi təsir göstərir. Çox vaxt valideynlər uşağı həddən artıq qoruyur, onun üçün çox şey etməyə çalışır, onun bütün istəklərini təxmin edir və ya bir jest və ya baxışa cavab olaraq yerinə yetirir. Eyni zamanda, uşaqda şifahi ünsiyyət ehtiyacı yaranmır. Belə hallarda uşaq nitqin inkişafı üçün vacib şərt olan onun üçün vacib olan nitq ünsiyyətindən məhrumdur.

***Açar sözlər:**. serebral iflic, nitq pozulması, artikulyasiya, kinestetik nəzarət, korreksiya.*

**Резюме.** Речевые нарушения занимают важное место в сложной структуре нарушений у детей с ДЦП. Характеристика речевых нарушений и степень их выраженности зависят прежде всего от локализации и тяжести поражения головного мозга. Речевые нарушения при ДЦП связаны не только с поражением отдельных структур головного мозга, но и с более поздним формированием или неразвитием участков коры головного мозга, важных в речевой и психической деятельности. Задержка развития речи при ДЦП связана также с ограничением объема знаний и представлений об окружающем, неадекватностью материально-практической деятельности и социальных отношений. Ошибки, допущенные родителями, оказывают негативное влияние на речевое развитие. Часто родители чрезмерно опекают ребенка, стараются сделать для него слишком много, предугадывают все его желания или выполняют их в ответ на жест или взгляд. При этом ребенок не нуждается в речевом общении. В таких случаях

ребенок лишается речевого общения, что является важным условием развития речи.

***Ключевые слова:*** *детский церебральный паралич, нарушение речи, артикуляция, кинестетический контроль, коррекция*

**Summary.** Speech disorders occupy an important place in the complex structure of disorders in children with cerebral palsy. The characteristics of speech disorders and the degree of their severity depend primarily on the localization and severity of brain damage. Speech disorders during cerebral palsy are not only related to the damage of certain structures of the brain, but also to the later formation or non-development of parts of the cerebral cortex that are important in speech and mental activity. The retardation in the development of speech in cerebral palsy is also associated with the limitation of the scope of knowledge and ideas about the environment, the inadequacy of material and practical activities and social relations. Parental mistakes made by parents have a negative impact on speech development. Often, parents overprotect the child, try to do too much for him, anticipate all his wishes or fulfill them in response to a gesture or look. At the same time, the child does not need verbal communication. In such cases, the child is deprived of speech communication, which is an important condition for the development of speech.

***Key words:*** *cerebral palsy, speech disorder, articulation, kinesthetic control, correction.*

Uşaq serebral iflici baş beynin doğuşdan əvvəlki, doğuş zamanı və ya doğuşdan sonrakı dövrlərdə müxtəlif səbəblərdən zədələnməsi nəticəsində əmələ gələn, adətən erkən uşaqlıq dövründə aşkarlanan və hərəki pozulmalarla: ifliclər, əzələ zəifliyi, koordinasiya pozulmaları, qeyri-iradi hərəkətlərlə xarakterizə olunan bir haldır. Bu uşaqlarda epileptik tutmalar, psixi inkişaf ləngiməsi, qavrama və öyrənmə çətinlikləri, görmə, eşitmə, nitq, intellekt pozulmaları da müşahidə oluna bilər. Baxmayaraq ki, serebral iflicli uşaq çox zaman əqli inkişafdan geri qalmış uşaq kimi təəsurat yaradır, bu heç də həmişə həqiqətə uyğun olmur. Serebral iflicə oxşar vəziyyətlər istənilən yaşda keçirilmiş infeksion xəstəlikdən, insultdan və yaxud kəllə-beyin travmasından sonra əmələ gələ bilər.

Uşaq serebral iflici zamanı nitq pozulmalarının korreksiyası psixoloq, loqoped, pedaqoq və valideynlərin əlaqələndirilmiş fəaliyyətini tələb edir.

Serebral iflicli uşaqlarda çox erkən yaşlardan başlayaraq artikulyasiyanın korreksiyası üçün çoxlu sayda metodlar mövcuddur. Ən məşhur xarici psixomotor korreksiya proqramları –Bobatov və V. Voitin metodlarıdır. Bobatov metodunda primitiv reflekslərin tormozlanmasına və onların patoloji müqavimətinə xüsusi əhəmiyyət verilir. Alimlər onların metodunu postural reflekslərin tormozlanması metodu adlandırdılar.

Müəlliflərin fikrincə, adekvat senso-motor modelə nail olmaq üçün normal proprioseptiv sistemləri inkişaf etdirmək və patoloji tonik refleksləri tormozlamaqla əzələ tonusunu normallaşdırmaq lazımdır. Bundan sonra normal postural reaksiyaları yaxşılaşdırmaq və gücləndirmək üçün cəhd edilməlidir. Bu tormoz duruşlarından istifadə edərək, uşağa dominant tonik reaksiya ilə bağlı əks hərəkəti təkrarlamaq imkanı verilməlidir. Məsələn, boyun və üzün əzələlərinin rahatlaması fonunda baş hərəkətlərini hiss etmək üçün baş fırlanmaları bədən hərəkəti olmadan həyata keçirilir [5, s.34-40].

